INDEX
INTERNATIONAL
COPERNICUS
RESEARCHBIB
ACADEMICRESOUR
CEINDEX

**ISSN 2409-8817**

**AZƏRBAYCAN RESPUBLİKASI ELM VƏ TƏHSİL NAZİRLİYİ**
**AZƏRBAYCAN RESPUBLİKASININ TƏHSİL İNSTİTUTU**

# *ELMİ ƏSƏRLƏR*
## cild 90, № 1, 2023

# *НАУЧНЫЕ ТРУДЫ*
## том 90, № 1, 2023

# *SCIENTIFIC WORKS*
## volume 90, № 1, 2023

**"Elmi əsərlər" 1934-cü ildən çıxır**
**İldə 6 nömrə nəşr olunur**

**Redaksiyanın ünvanı**:
Bakı şəhəri, Zərifə Əliyeva küçəsi, 96
Tel: 493-96-21, 493-30-06
E-mail: a.abbasov@arti.edu.az
gulizade.gunel@mail.ru
http://www.arti.edu.az/az/

*Azərbaycan Respublikasının Təhsil İnstitutu Elmi Şurasının 29 dekabr 2022-cü il tarixli iclasının qərarı ilə nəşr edilir.*

*Təsisçi: Azərbaycan Respublikasının Təhsil İnstitutu*
*"Elmi əsərlər" məcmuəsi Azərbaycan Respublikası Ədliyyə Nazirliyinin*

*11 iyul 2002-ci il tarixli 23 №-li əmri ilə qeydə alınmışdır.*
*Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının qərarı ilə tövsiyə edilən nəşrlər siyahısına daxil edilmişdir*

## *ÜMÜMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN ANADAN OLMASININ 100 İLLİYİ QARŞISINDA*

## *К 100-ЛЕТИЮ СО ДНЯ РОЖДЕНИЯ ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА*

## *ON THE 100 th ANNIVERSARY OF THE NATIONAL LEADER HEYDAR ALIYEV*

### Azərbaycan Respublikasında 2023-cü ilin "Heydər Əliyev İli" elan edilməsi haqqında Azərbaycan Respublikası Prezidentinin

### SƏRƏNCAMI

*29 sentyabr 2022-ci il*

2023-cü il mayın 10-da Azərbaycan xalqının Ümummilli Lideri, müstəqil Azərbaycan dövlətinin qurucusu, görkəmli siyasi və dövlət xadimi Heydər Əliyevin anadan olmasının 100 ili tamam olur.

Heydər Əliyev öz xalqını zamanın mürəkkəb tarixi-siyasi sınaqlarından uğurla çıxarmış və ardıcıl mübarizə apararaq onu müstəqilliyə qovuşdurmuş qüdrətli şəxsiyyətdir. Azərbaycan xalqı yeni əsrə və yeni minilliyə məhz Heydər Əliyev zəkasının işığında qədəm qoymuşdur. Davamlı yüksəliş yolunda inamla irəliləyən müasir Azərbaycan Heydər Əliyevin həyat amalının təntənəsidir.

Azərbaycana rəhbərliyinin birinci dövründə Heydər Əliyev özünün qeyri-adi idarəçilik bacarığı, polad iradəsi və yüksək vətənpərvərliyi sayəsində, uzaqgörən və məqsədyönlü qərarları ilə çox qısa müddətdə respublikamızda sosial-iqtisadi, elmi-texniki və mədəni sahələrin inkişafında böyük sıçrayışa nail olmuşdur. Tariximizin gedişatının və həyatımızın ahənginin köklü surətdə dəyişdiyi, azadlıq və müstəqillik duyğularının milli düşüncəmizdə üstünlük təşkil etməyə başladığı bu illər Azərbaycanın quruculuq salnaməsinin ən parlaq səhifələridir. Ulu Öndərin xalqın yaradıcılıq enerjisini bir məqsədə yönəltməklə tarixi yaddaşın bərpası istiqamətində atdığı qətiyyətli addımlar o dövrdə milli ruhun canlanmasına xidmət göstərmiş, özünüdərki və soy-kökə qayıdışı təmin etmiş, müstəqil dövlət quruculuğuna aparan yolun təməl daşına çevrilmişdir.

Böyük siyasi iradəyə, sarsılmaz əqidəyə malik olan Heydər Əliyevin tükənməz dövlət idarəçiliyi istedadı onun SSRİ-nin rəhbərlərindən biri kimi çalışdığı və irimiqyaslı layihələr həyata keçirdiyi illərdə özünü bir daha parlaq surətdə təzahür etdirmişdir. Heydər Əliyev bütün varlığı ilə sevdiyi və canından əziz bildiyi doğma xalqının mənafelərini daim önə çəkmiş və respublikamızın inkişafı üçün malik olduğu bütün imkanlardan istifadə etmişdir.

Zamanın hökmü ilə ötən əsrin 90-cı illərində dövlət müstəqilliyini bərpa edən Azərbaycan Ermənistanın təcavüzü, xarici təzyiqlər və daxili çəkişmələr üzündən dünyanın siyasi xəritəsindən silinmək və dövlətçiliyini itirmək təhlükəsi ilə qarşılaşmışdır. Taleyimizin həll olunduğu ağır bir zamanda xalqın təkidli tələbinə səs verərək yenidən hakimiyyətə qayıdan Heydər Əliyev doğma Vətənin xilası naminə misilsiz fədakarlıq nümayiş etdirmiş, ölkəmizi ictimai-siyasi pərakəndəliyin və anarxiyanın məngənəsindən qurtarmış, bütün sahələrdə müşahidə olunan dərin tənəzzülün qarşısını almış, yenidən qurduğu və hər cür qəsdlərdən qoruduğu dövlətin dayanıqlı inkişaf yolunu müəyyən etmişdir. Heydər Əliyevin ölkəmizə rəhbərliyi illəri xalqımızın nadir tarixi imkandan faydalanaraq, böyük əziyyətlər bahasına öz müstəqilliyini əbədi və dönməz etdiyi taleyüklü mərhələdir.

Heydər Əliyevin zəngin həyat yolu və müstəsna fəaliyyətinin bütün mərhələləri bir-birini tamamlamış, öz xalqına sıx bağlılığın, milli dövlətçilik məfkurəsinə sadiqliyin canlı təcəssümü olmuşdur. Geniş bilik və dərin təfəkkür sahibi olan Heydər Əliyev düşünülmüş və cəsarətli qərarları ilə təkcə müstəqillik dövründə deyil, bütün dövrlərdə Azərbaycan ictimaiyyətini ən ciddi şəkildə düşündürən məsələləri uğurla həll etmişdir. Ulu Öndər cəmiyyət həyatının müxtəlif sahələri arasın-

da üzvi bağlılığı aydın görərək, müəllifi olduğu milli inkişaf strategiyasında ictimai, siyasi, sosial, iqtisadi, mədəni və digər sahələrdə qarşıda duran vəzifələri düzgün müəyyənləşdirmiş və məharətlə həyata keçirmişdir. Heydər Əliyevin milli neft strategiyasının uğurla reallaşdırılması nəticəsində xalqımız öz təbii sərvətlərinin tam sahibinə çevrilmiş və qısa müddətdə ölkəmizin inkişafına güclü təkan verən resurslar əldə edilmişdir. Azərbaycan Respublikasının ilk Konstitusiyasının qəbul olunması və bütün sferaları əhatə edən köklü islahatların həyata keçirilməsi, demokratik, hüquqi dövlət quruculuğu, nizami ordunun yaradılması Heydər Əliyevin Azərbaycan xalqı qarşısında müstəsna xidmətləridir. Xalqımızı vahid amal ətrafında birləşdirən azərbaycançılıq ideologiyasının formalaşdırılması, ana dilinin dövlət qayğısı ilə əhatə olunması, ictimai-siyasi, elmi və mədəni fikir tariximizin əlamətdar hadisələrinin müntəzəm qeyd edilməsi ənənəsinin yaradılması, Azərbaycanın çoxəsrlik mənəvi-mədəni irsə sahib qədim diyar və sivilizasiyaların qovşağında yerləşən tolerantlıq məkanı kimi geniş şöhrət qazanması Heydər Əliyevin mükəmməl quruculuq proqramının tərkib hissələri olmuşdur.

Dövrünün ən nüfuzlu siyasətçiləri ilə bir sırada duran Heydər Əliyev Azərbaycanın müasir simasının, xalqımızın zəngin dəyərlərinin tanıdılması və ölkəmizin beynəlxalq münasibətlər sistemində layiqli mövqe qazanmasında müstəsna rol oynamışdır. Ermənistan-Azərbaycan münaqişəsinin beynəlxalq hüququn norma və prinsipləri əsasında həlli Ulu Öndərin qarşıya qoyduğu başlıca vəzifə olmuş, ölkəmizin bütün resursları, xalqımızın potensialı tarixi ədalətin bərpası üçün səfərbər edilmişdir. Ulu Öndərin şah əsəri olan güclü Azərbaycan dövləti öz suverenliyini, müstəqilliyini qorumağa qadir olduğunu 44 günlük Vətən müharibəsində şanlı Zəfər qazanmaqla sübuta yetirmişdir.

Dövlətçilik salnaməmizdə silinməz izlər qoymuş, azərbaycanlı olması ilə ömür boyu fəxr etmiş, milli qürur və iftixar mənbəyimiz olan Heydər Əliyev bütün dünyada Azərbaycanın rəmzi kimi qəbul edilir. Xalqımız onun əziz xatirəsini həmişə uca tutur və minnətdarlıqla anır, yenidən hakimiyyətə gəldiyi günü Azərbaycan Respublikasının dövlət bayramı – Milli Qurtuluş Günü kimi qeyd edir.

Müstəqil Azərbaycan Ulu Öndərin indiki və gələcək nəsillərə əmanəti, onun zəngin və çoxşaxəli irsi isə xalqımızın milli sərvətidir. Bu müqəddəs mirası qoruyub saxlamaq hər bir azərbaycanlının şərəfli vəzifəsidir.

Azərbaycan Respublikası Konstitusiyasının 109-cu maddəsinin 32-ci bəndini rəhbər tutaraq, Azərbaycan xalqının Ümummilli Lideri Heydər Əliyevin 100 illik yubileyinin dövlət səviyyəsində qeyd olunmasını təmin etmək məqsədilə qərara alıram:

1. Azərbaycan Respublikasında 2023-cü il “Heydər Əliyev İli” elan edilsin.

2. Azərbaycan Respublikası Prezidentinin Administrasiyası Azərbaycan Respublikasında 2023-cü ilin “Heydər Əliyev İli” elan edilməsi ilə bağlı tədbirlər planına dair təkliflərini iki ay müddətində hazırlayıb Azərbaycan Respublikasının Prezidentinə təqdim etsin.

**İlham Əliyev**
Azərbaycan Respublikasının Prezidenti
Bakı şəhəri, 29 sentyabr 2022-ci il

***BAŞ REDAKTORDAN***
***ОТ ГЛАВНОГО РЕДАКТОРА***
***FROM THE EDITOR İN CHIEF***



*UOT 37.0*

***Akif Nurağa oğlu Abbasov***
*pedaqogika elmləri doktoru, professor,*
*Əməkdar müəllim*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi*
https://orcid.org/0000-0002-9210-7141

## ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV AZƏRBAYCAN-TÜRKİYƏ MÜNASİBƏTLƏRİ HAQQINDA

***Акиф Нурага оглу Аббасов***
*доктор педагогических наук, профессор,*
*Заслуженный учитель*
*ученый секретарь Института Образования Азербайджанской Республики.*

## ОБЩЕНАЦИОНАЛЬНЫЙ ЛИДЕР ГЕЙДАР АЛИЕВ ОБ АЗЕРБАЙДЖАНО-ТУРЕЦКИХ ОТНОШЕНИЯХ

***Akif Nuragha Abbasov***
*doctor of sciences in pedagogy, professor,*
*Honored teacher*
*scientific secretary of the Institute of Education of the Republic of Azerbaijan.*

## NATIONAL LEADER HEYDAR ALIYEV ON AZERBAIJANI-TURKISH RELATIONS

**Xülasə**. “Bir millət, iki dövlət!” Bu qiymətli sözlər Ümummilli liderimiz Heydər Əliyevə məxsusdur. Azərbaycanla Türkiyə bir-birinə son dərəcə bağlı, yaxın, doğma, qardaş dövlətlərdir. Dilimiz bir, dinimiz bir, adət-ənənəmiz bir. Uzun illər bir-birimizə həsrət qalmışıq. Neçə əsrlər bu iki dövlət bir-birindən ayrı salmağa

çalışıblar. Fəqət yağı düşmən öz istəyinə çata bilməyib. Azərbaycan və Türkiyə yenə bir-birinin yanındadır. 44 günlük Vətən müharibəsi, 2023-cü il fevralın 6-da Türkiyə Respublikasında baş vermiş əsrin ən böyük faciəsi – zəlzələsi dövründə qarşılıqlı kömək və dayaq bunu bir daha sübuta yetirdi.

Məqalədə Ümummilli Liderimiz Heydər Əliyevin Azərbaycan-Türkiyə münasibətlərinə dair fikirləri diqqətə çatdırılır.

***Açar sözlər:*** *millət, münasibətlər, dövlətçiliyin möhkəmləndirilməsi, daxili və xarici siyasət, atatürkçülük, azərbaycançılıq*

**Резюме**. "Одна нация, два государства!" Эти ценные слова принадлежат общенациональному лидеру Гейдару Алиеву. Азербайджан и Турция особо связанные, близкие, родные, братские государства. У нас единый язык, единая религия, одни и те же традиции. На протяжении долгих лет мы были вдали друг от друга. Сколько веков эти два государства пытались разлучить. Однако враг не смог добиться своего. Азербайджан и Турция по-прежнему являются опорой и поддержкой друг для друга. Взаимопомощь и поддержка еще раз доказали это в ходе 44-дневной Отечественной войны, и во время величайшей трагедии века – землетрясения, произошедшего в Турецкой Республике 6 февраля 2023 года.

В статье освещаются взгляды общенационального лидера Гейдара Алиева на азербайджано-турецкие отношения.

***Ключевые слова:*** *нация, отношения, укрепление государственности, внутренняя и внешняя политика, ататюркизм, азербайджанство*

**Summary**. "One nation, two states!" These precious words belong to our national leader Heydar Aliyev. Azerbaijan and Turkey are extremely connected, close, dear, fraternal states. We have one language, one religion, one tradition. We dreamed of each other for many years. How many centuries these two states tried to separate from each other. But the enemy could not get what he wanted. Azerbaijan and Turkey are still close to each other. Mutual assistance and support once again proved this during the 44-day Patriotic War, the greatest tragedy of the century - the earthquake that occurred in the Republic of Turkey on February 6, 2023.

The article highlights the views of national leader Heydar Aliyev on the Azerbaijani-Turkish relations.

***Keywords:*** *nation, relations, strengthening of statehood, domestic and foreign policy, ataturkism, azerbaijanism*

XX əsrdə dünyanın möhtəşəm tarixinə iki böyük şəxsiyyət daxil oldu. Əsrin birinci yarısında Mustafa Kamal Əlirza oğlu Atatürk, ikinci yarısında Heydər Əlirza oğlu Əliyev! Atatürk müasir Türkiyə Respublikasının, Heydər Əliyev də müasir Azərbaycan Respublikasının baş memarı, yaradıcısı, müəllifi oldu.

Mustafa Kamal Türkiyənin ağır günlərində ölkəsinin istiqbalını Antanta dövlətlərinin işğalı təhlükəsindən, hədələrindən xilas etdiyi kimi, Ulu öndər Heydər Əliyev də respublikamızın müstəqilliyini daxili və xarici bədxahlarımızın təzyiqlərindən qorumağı bacarmışdır.

Heydər Əliyev Atatürkün şəxsiyyətini, onun yaratdığı Türkiyə Cümhuriyyətini özü üçün örnək hesab edirdi.

"Bir millət, iki dövlət!" Bu qiymətli sözlər Ümummilli Liderimiz Heydər Əliyevə məxsusdur. Azərbaycanla Türkiyə bir-birinə son dərəcə bağlı, yaxın, doğma, qardaş dövlətlərdir. Dilimiz bir, dinimiz bir, adət-ənənəmiz bir. Uzun illər bir-birimizə həsrət qalmışıq. Neçə əsrlər bu iki dövləti bir-birindən ayrı salmağa çalışıblar. Fəqət yağı düşmən öz istəyinə çata bilməyib. Azərbaycan və Türkiyə yenə bir-birinin yanındadır. 44 günlük Vətən müharibəsi, 2023-cü il fevralın 6-da Türkiyə Respublikasında baş vermiş əsrin ən böyük faciəsi – zəlzələsi dövründə qarşılıqlı kömək və dayaq bunu bir daha sübuta yetirdi.

XXI əsrin birinci yarısında tarixin səhnəsində daha iki böyük şəxsiyyət özlərinə layiqli yer tutdular: İlham Əliyev və Rəcəb Tayyib Ərdoğan. Dövlət başçıları Şuşa bəyannaməsini imzaladılar. Onlar əl-ələ verib türk dünyasının daha da çiçəklənməsinə çalışırlar.

Ulu öndər Heydər Əliyev Azərbaycan dövlətçiliyinin möhkəmləndirilməsi, hərbi qüdrətimizin yüksəldilməsi, ölkə həyatının hər bir sahəsində uğurlarımızın artması, daxili və xarici siyasət sahəsində möhtəşəm işlər görmüş, fəaliyyət göstərmişdir. Bu sahələrdəki fəaliyyətinin

hər birinə cild-cild kitablar həsr etmək, çoxsaylı məqalələr yazmaq mümkündür. Biz bu məqalədə Ümummilli Liderin Türkiyə Respublikası ilə əlaqələrimizin sıx surətdə qurulması, möhkəmləndirilməsi, inkişaf etdirilməsi istiqamətindəki fəaliyyətini diqqət mərkəzinə gətirmək istəyirik.

Ulu Öndər Heydər Əliyev ölkəmizdə milli dövlət quruculuğu işlərində Atatürkə əsaslanardı. Bu, təsadüfi deyildi. Mustafa Kamalın ideyaları bir-birinin ardınca reallaşmış, müasir Türkiyə Respublikası yaranmışdı. Heydər Əliyev Atatürkün dahiliyini, müdrikliyini bizim üçün ilham mənbəyi hesab edərək göstərirdi ki, "Azərbaycan xalqı öz milli azadlığı uğrunda mübarizə apararkən, Mustafa Kamal Atatürkün qoyduğu yolla gedən Türkiyə Cümhuriyyətinin təcrübəsindən bəhrələnmişdir".

Ümummilli liderimizin qənaətincə, Mustafa Kamal Atatürkün ideyaları, milli dövlət quruculuğu prinsipləri Türkiyənin təkcə keçmişi, tarixi deyil, eyni zamanda gələcəyidir. Ulu Öndər Türkiyə Cümhuriyyətinin 70 illiyinə həsr edilmiş elmi-praktik konfrans iştirakçıları qarşısında çıxış edərkən demişdir: "Türkiyə Cümhuriyyətinin banisi, iyirminci əsrin bəşəriyyətə verdiyi böyük dühalardan Mustafa Kamal Atatürkün azadlıq və demokratiya ideallarına sonsuz məhəbbəti, sərkərdəlik və dövlətçilik məharəti sayəsində türk xalqı tarixin çətin sınaqlarından çıxıb qurtuluş tapdı. Dünya Türkiyə Cümhuriyyəti adlı azad və məğrur bir məmləkəti tanımalı oldu. Türkiyə hazırda dünyanın siyasi durumunda nüfuzlu təsir qüvvəsinə malik, ümumbəşəri dəyərləri qorumaq əzmində olan, iqtisadi və mədəni səviyyəsi etibarilə inkişaf etmiş qüdrətli dövlətlərdən birinə çevrilmişdir" [1, k. 1, s. 141].

Azərbaycanın taleyi həmişə Atatürkü maraqlandırmışdır. O, Azərbaycanı müstəqil dövlət kimi görmək istəyirdi. İnanırdı ki, başqa imperiyalar kimi SSRİ də gec-tez dağılacaqdır. Bu zaman Azərbaycana dəstək durmağın vacibliyini dönə-dönə xatırladırdı. Diqqət yetirək: "Bu gün Sovet İttifaqı bizim dostumuz, qonşumuz və müttəfiqimizdir. Bu dostluğa ehtiyacımız var. Lakin sabah nə olacağını bu gün heç kim müəyyən edə bilməz. Nəinki Osmanlı kimi, Avstriya-Macarıstan kimi parçalana bilər, kiçilə bilər. Bu gün əlində bərk-bərk tutduğu millətlər qonşularından qaça bilərlər. Dünya yeni bir müvazinətə keçə bilər. O zaman Türkiyə nə edəcəyini bilməlidir. Bizim bu dostluğumuzun idarəçiliyi altında dili bir, dini bir, mahiyyəti bir qardaşlarımız vardır. Onlara sahib çıxmağa hazır olmalıyıq" (1, k.1, s. 233).

Heydər Əliyev Atatürkün türk xalqı və türk dünyası qarşısındakı xidmətlərini son dərəcə yüksək qiymətləndirirdi. Bu barədə onun dedikləri: "Mustafa Kamal Atatürkün şəxsiyyəti bir də ona görə qiymətlidir ki, həm Türkiyə xalqı üçün, həm bütün türk dünyası üçün, həm də bütün dünya üçün o, qurub-yaratdığı Cümhuriyyəti yarada bilibdir!.. Mustafa Kamal Atatürk bütün türk dünyasının tarixi şəxsiyyətidir. Bütün türk dünyasının əvəzsiz, ölməz lideridir. Şəxsən mən hesab edirəm ki, Mustafa Kamal Atatürkün türk xalq qarşısında xidmətləri əvəzsizdir. Yəni o qədər böyükdür ki, ona qiymət vermək çətindir. Amma bunların içərisində onun iki böyük xidməti var. Birincisi, Türkiyə Cümhuriyyətinin yaranması; ikincisi, türk ordusunun yaranmasıdır".

Heydər Əliyev Mustafa Kamal Atatürkə böyük hörmət və məhəbbətinin əlaməti olaraq, onun irsinin və atatürkçülük ideyalarının Azərbaycanda təbliğini, tədqiqini lazım və zəruri bilərək bu istiqamətdə tədbirlər görürdü. 2001-ci il mart ayının 9-da yaradılan Atatürk Mərkəzi buna əyani sübutdur. Mərkəzin Fəxri Prezidenti Azərbaycan Prezidenti, rəhbəri akademik Nizami Cəfərovdur.

Atatürk – atatürkçülük, Heydər Əliyev – azərbaycançılıq ideyalarını irəli sürmüş, əsaslandırmış, dövlətin inkişafı üçün həmin ideyalardan bəhrələnməyi təmin etmişlər.

Türkiyə Respublikasında Heydər Əliyevin fəaliyyəti son dərəcə yüksək qiymətləndirilirdi və qiymətləndirilməkdədir.

Ümummilli Liderimiz Atatürk Beynəlxalq Sülh mükafatı ilə təltif edilmişdir. Məlum olduğu kimi, SSRİ-yə daxil olduğumuz illərdə Heydər Əliyev ittifaq rəhbərliyi tərəfindən bir çox mükafatlara təqdim olunmuş, iki dəfə Sosialist Əməyi Qəhrəmanı fəxri adını almışdı. Lakin həmin mükafatlardan fərqli olaraq Atatürk Beynəlxalq Sülh mükafatından böyük məmnunluq və hədsiz qürur hissi keçirirdi. Bununla bağlı deyirdi: "Mənə böyük Atatürkün adını daşıyan Beynəlxalq Sülh Mükafatı təqdim olunubdur. Bu mənim üçün, bütün Azərbaycan xalqı üçün, müstəqil Azərbaycan dövləti üçün böyük şərəfdir. Mən bununla fəxr

edirəm. Atatürkün şəxsiyyəti, onun yaratdığı Türkiyə Cümhuriyyəti mənim üçün örnəkdir. Mən buna daim sadiq olacağam".

Ankaranın Yeniməhəllə rayonunda Ümummilli Liderimiz Heydər Əliyevin adına Park var. Yaşıllığa, gül-çiçəyə bürünmüş bu parkda onun əzəmətli heykəli ucalır. Həmin rayonun ərazisində bir orta məktəb və eyni zamanda Türkiyənin İğdır şəhərində 500 şagirdin təhsil aldığı lisey, Qarsda Anadolu texniki peşə liseyi Heydər Əliyevin adını daşıyır. Bu, heç də təsadüfi deyildir. Heydər Əliyev son dərəcə qüdrətli idarəetmə və natiqlik qabiliyyətinə, dərin məntiqə və zəkaya, hadisələrdən tez başçıxarma və dərhal qərar qəbuletmə bacarığına, uzaqgörənliyə, iti ağla, diplomatiyaya, siyasi səriştəyə malik şəxs idi.

1994-cü il fevralın 9-da Ankarada Hacettepe universitetində olarkən ona bu ali təhsil ocağının fəxri doktoru diplomu təqdim edilmişdir. Heydər Əliyev mərasimdəki çıxışında bildirmişdir: "Siz məni öz universitetinizin fəxri doktoru adına layiq gördünüz. Mən bütün bunlara görə sizə təşəkkür edir və hədsiz minnətdarlığımı bildirirəm!" [1, k.1, s. 237].

Heydər Əliyev Türkiyə Respublikasını böyük, əzəmətli dövlət hesab edərək, onun dünya miqyasında özünəməxsus yer tutduğunu bildirərək, Azərbaycanda türkdilli dövlətlərin tarixinin, Türkiyənin tarixinin, Azərbaycan-Türkiyə əlaqələrinin tarixinin öyrənilməsinə böyük əhəmiyyət verirdi.

Heydər Əliyev dövlət başçıları ilə yanaşı Türkiyədə müxtəlif sahələrdə (elm, təhsil, incəsənət, sənaye və s.) çalışan şəxslərlə də, iş adamları ilə də görüşüb onların fəaliyyəti ilə tanış olur və qiymət verirdi.

Ulu Öndər 1994-cü ilin fevralın 9-da Bilkənd Universitetində olmuş, universitetin idarə heyətinin sədri İhsan Doğramaçı ilə görüşmüşdür. İhsan Doğramaçının fəaliyyəti Heydər Əliyevin böyük marağına səbəb olmuşdu. Bu xüsusda demişdir: "Onu dünyanın hər yerində, eləcə də Azərbaycanda böyük, nadir bir şəxs kimi tanıyırlar. O, nəinki Türkiyədə, ümumiyyətlə, bütün türk diyarında, türk dünyasında elm və təhsil sahəsində illərdən bəri coşqun fəaliyyət göstərir, xalq, millət qarşısında, türk xalqlarının birləşməsi sahəsində böyük xidmətləri var" [1, k. 1, s. 239].

Heydər Əliyev 2000-ci il noyabrın 24-də böyük hörmət əlaməti olaraq İhsan Doğramaçını Türkiyə Respublikası Xarici İşlər Nazirliyinin ən böyük mükafatı olan "Yüksək xidmətlərə görə" paketi ilə təltif olunmağı münasibətilə təbrik etmişdir [3, k. 31, s. 50].

Məlum olduğu kimi, Ulu Öndər ümumtəhsil məktəbləri məzunlarının yaxşı ali təhsil almasına, yüksək mütəxəssislər kimi yetişməsinə xüsusi qayğı göstərirdi. Eyni zamanda o, gənclərin xaricdə təhsilinin də ilk təşəbbüskarı idi. Bir çox hallarda məzunlar yeni ixtisaslar üzrə xaricdə dövlət hesabına təhsil almağa göndərilirdi. Ümummilli Liderimiz gənclərin Türkiyənin ali təhsil müəssisələrində oxumalarını daha məqsədəuyğun sayır, həmin təhsil müəssisələrini yüksək qiymətləndirirdi ("Türkiyə universitetləri öz yüksək səviyyəsinə görə dünyada məşhurdur. Buna görə də həmin universitetlərdə təhsil almaq, şübhəsiz, yüksək səviyyəli mütəxəssis olmağa imkan verir").

Tələbələr təhsil almağa yola düşməzdən əvvəl Heydər Əliyev onlarla görüşür, gənclərə xeyir-duasını, məsləhətlərini, tövsiyələrini verirdi. Belə ki, 1994-cü il fevralın 7-də Türkiyənin ali məktəblərində təhsil almağa yola düşən azərbaycanlı tələbələrlə görüşdə demişdir: "İstərdim ki, siz Türkiyə universitetlərinin bütün intellektual imkanlarından səmərəli istifadə edərək mükəmməl təhsil alasınız, yaxşı mütəxəssis olasınız, vətənimizə, xalqımıza, millətimizə gələcəkdə sədaqətlə xidmət edəsiniz. Türkiyə Azərbaycan üçün qardaş, dost ölkədir. Türkiyə ilə Azərbaycan arasındakı əlaqələrin qədim və zəngin tarixi var. İndi Azərbaycan Respublikası bir müstəqil dövlət kimi Türkiyə Cümhuriyyəti ilə bütün sahələrdə əlaqələrin inkişaf etdirilməsinə çalışır. Odur ki, bu baxımdan biz təhsil sahəsinə xüsusi əhəmiyyət veririk. Elm, mədəniyyət, təhsil sahəsində Türkiyə ilə Azərbaycan arasında müştərək işlər görülməsi həm Azərbaycan üçün, həm də Türkiyə üçün çox faydalıdır" [1, k. 1, s. 223].

Ümummilli Liderimiz eyni zamanda tələbələrə qardaş ölkədə bir Azərbaycan vətəndaşı kimi nümunəvi davranmağı, özlərini yaxşı aparmağı və yaxşı oxumağı tövsiyə edirdi. Oxuyuruq: "Azərbaycandan Türkiyəyə gedən hər bir vətəndaş gərək müstəqil respublikamızın vətəndaşı adını uca tutsun. Türkiyə qardaş ölkədir. Türkiyədə siz özünüzü öz məmləkətinizdəki

kimi hiss edəcəksiniz. Siz gərək Azərbaycanın təmsilçiləri kimi, Türkiyədə Azərbaycanın həm tarixini, həm milli ənənələrini, həm də bugünkü gerçəkliyini geniş və tam obyektiv şəkildə təbliğ edəsiniz" [1, k. 1, s. 223].

Heydər Əliyev qardaş ölkədə gənclərimizin fəaliyyətinə eyni zamanda Türkiyə ilə Azərbaycan arasında dostluq və qardaşlıq əlaqələrinin daha da möhkəmlənməsi vasitəsi kimi baxırdı.

Azərbaycan-Türkiyə münasibətlərinin kamilliyinin bariz nümunəsi olaraq Ulu Öndərin belə bir fikri də önəmlidir: "Bütün bu illərdə Azərbaycanı müdafiə etmək üçün Türkiyənin səsi çox gur gəlib. Türkiyənin köməyi Azərbaycana mənəvi dayaq olub. Biz bu mənəvi yardımdan, köməkdən bu gün də istifadə edirik".

Bu kömək, bu yardım həmişə qarşılıqlı olub. XX əsrin ikinci onilliyində azərbaycanlılar Çanaqqala döyüşlərində türklərin yanında olub. Türkiyə milli istiqlal mübarizəsinə qalxanda onun böyük maddi, hərbi və mənəvi dəstəyə ehtiyacı vardı. Türkiyə belə ağır günlərdə - xarici qəsbkarlarla mübarizədə çətinliklərlə qarşılaşıb. Mustafa Kamal Paşa kömək üçün Azərbaycana müraciət edib. O zamanlar Azərbaycanda Xalq Komissarları Sovetinin sədri Nəriman Nərimanov idi. Azərbaycan hökuməti vaxt itirmədən çağırışa layiqli cavab verdi. Faktlara müraciət edək: "1920-ci il may ayının 3-də Mustafa Kamal Paşa Şərq Cəbhəsi komandiri Kazım Qarabəkir Paşaya aşağıdakı məzmunda bir məktub yazır: "Dövlətdə heç pul qalmadı. Ölkə daxilində pul təmin edə biləcəyimiz bir qaynaq yoxdur. Azərbaycan hökumətindən borc pul alınmasını təşkil etmənizi istəyirəm".

Kazım Qarabəkir Paşa Atatürkün bu istəyini Azərbaycan hökumətinə bildirir.

Mustafa Kamal Paşa 1921-ci ildə Nərimanova bir məktub yazaraq ondan borc pul istəmişdi. O (*Nərimanov – A.A.*), dərhal 500 kq qızıl göndərmişdi. Daha sonra Nərimanov Rusiyadan aldığı 10 milyon qızıl pulu Ankaraya göndərmişdi.

1921-ci il mart ayının 23-də Azərbaycan hökuməti könüllü şəkildə Türkiyəyə Azərbaycan xalqının hədiyyəsi olaraq 30 sistern neft, 2 sistern benzin, 8 sistern yağ göndərdi. Bundan əlavə, 1922-ci ildə Batum yolu ilə Azərbaycan tərəfdən doqquz min tondan çox kerasin və 350 ton benzin yardımı edilib. Bu yardımlar sayəsində döyüş içində olan ölkənin vəziyyəti xeyli düzəlmişdi.

Nərimanov Mustafa Kamal Paşaya yazdığı məktubunda Türk xalqını təbrik etdiyini bildirir və sonra əlavə edirdi: "Paşam, bizdə qardaş qardaşa borc verməz. Qardaş hər zaman qardaşının əlindən tutar. Biz qardaşıq, hər zaman əlinizdən tutacaq və tutmağa davam edəcəyik".

Türkiyə Respublikası da həmişə yanımızda olub. 44 günlük Vətən müharibəsində bu dövlətin bizə göstərdiyi hərbi və mənəvi kömək heç zaman unudulmayacaq. Bu kömək sayəsində Ermənistan üzərində hərbi və mənəvi zəfər qazandıq, torpaqlarımız düşmən tapdağından azad olundu, erməni ordusunu darmadağın etdik.

Ümummilli Liderimiz 1994-cü il fevralın 8-də Ankarada "Çankaya" köşkündə Azərbaycan Respublikasının prezidentinin şərəfinə ziyafətdəki nitqdə Türkiyə Respublikasının Prezidenti Süleyman Dəmirəlin şəxsiyyətini yüksək dəyərləndirmiş, eyni zamanda onun ölkəmiz, xalqımız üçün xidmətlərindən söz açmışdır. Diqqət yetirək: "Süleyman Dəmirəl Türk dünyasının böyük şəxsiyyətidir, bütün dünya siyasətçiləri içərisində tanınmış və çox hörmət qazanmış şəxsiyyətdir. O, eyni zamanda Azərbaycan xalqının hörmət və ehtiramını qazanmışdır. Hörmətli Süleyman Dəmirəl Azərbaycan Respublikasının istiqlalının əldə olunduğu vaxt böyük fəaliyyət göstərmiş və Azərbaycan Respublikasının müstəqilliyini bütün dünyada tanıtmaq üçün onun böyük xidmətləri olmuşdur. Bu, Azərbaycanın tarixinə, müstəqil Azərbaycan dövlətinin tarixinə artıq həkk olunmuşdur. 1992-ci ildə hörmətli Süleyman bəylə biz Türkiyə ilə Azərbaycan arasında tikilmiş körpünün açılışında iştirak etdik. Xalqlar bu körpünü ümid körpüsü, həsrət körpüsü adlandırdılar. Bu, təsadüfi deyil, çünki 70 il ərzində azərbaycanlılar Türkiyədə olan qardaşları ilə əlaqələrdən məhrum olmuşdular və Türkiyəyə həmişə böyük həsrətlə, böyük ümidlə baxırdılar" [1, k. 1, s. 229].

Heydər Əliyev Türkiyə Cümhuriyyətinin sürətlə inkişaf etməsində Turqut Özalın böyük xidmətlərini də xüsusi ilə qeyd edərdi.

Ümummilli Liderimiz gənc yaşlarında Türkiyəyə maraq göstərdiyini, türk xalqının həyatı, adət-ənənələri ilə kitablardan, qəzetlərdən məlumat aldığını bildirərək deyirdi: "Böyük Millət Məclisinin işi barədə, onun qəbul etdiyi

qərarlar barədə məlumatları həvəslə, diqqətlə oxuyurdum. Hər dəfə də düşünürdüm ki, bu mötəbər və nüfuzlu Böyük Millət Məclisi – türk xalqının həyatında dəyərli və diqqətəlayiq işlər görən bu məclis nə qədər də qüdrətli və nə qədər də məqsədyönlü siyasət aparan bir məclisdir. İndi mənə bu məclisə gəlmək, sizinlə görüşmək xoşbəxtliyi nə olmuşdur. Buna görə çox böyük qürur hissi keçirirəm. Bu, mənim üçün böyük şərəfdir, böyük hörmətdir" [1].

Heydər Əliyev Türkiyənin təcrübəsini, Türkiyə dövlətinin xarici siyasətini ölkəmizdən ötrü təcrübə məktəbi hesab edir və bundan səmərəli istifadə etməyi məsləhət görürdü. Ulu Öndər Türkiyənin inkişafını, güclənməsini respublikamız üçün dayaq bilirdi.

Ümummilli Liderimiz Azərbaycanın demokratik prinsiplərə əsasən dövlət quruculuğu ilə məşğul olduğunu diqqətə çatdırır, ölkəmizdə demokratiya, siyasi plüralizm üçün bütün imkanlar yarandığını və yaranacağını söyləyirdi. Daha sonra

Türkiyənin təcrübəsindən, inkişaf etmiş demokratik dövlətlərin təcrübəsindən faydalanmaqla həmin tədbirlərin daha da genişləndirilməsini və dərinləşdirilməsini lazım bilirdi. O, Türkiyə-Azərbaycan dostluğunu, qardaşlığını əbədi hesab edir, bizim qanımızın, canımızın, dinimizin, dilimizin bir olduğunu vurğulayırdı. Oxuyuruq: "Gərək Türkiyədə iş adamları, dövlət adamları, adi bir vətəndaş da bilsin ki, Azərbaycanın mənafeyi Türkiyənin mənafeyidir, Azərbaycanın dərdi Türkiyənin dərdidir. Azərbaycan türk diyarıdır, azərbaycanlılar türklərdir".

Heydər Əliyev türk dünyasının bir yumruq kimi birləşməsini, bir yerdə olmasını, bir-birinə dəstək durmasını vacib bilirdi: "İndi 100 ildən sonra türklərin qalxması üçün, türklərin bir-birinə yaxınlaşması üçün, türklərin birləşməsi üçün böyük bir fürsət yaranıb. Bu fürsətdən hər bir türk respublikası yaxşı istifadə etməlidir".

Çox diqqətəlayiqdir ki, qardaşlıq prinsiplərinə sadiq qalan Türkiyə Ermənistana münasibətini Ermənistanın Azərbaycana olan münasibəti əsasında müəyyənləşdirib. Ulu Öndər bunu son dərəcə yüksək qiymətləndirərək deyirdi: "Xatirimdədir, Parisdə beynəlxalq toplantı olarkən keçirilmiş mətbuat konfransında bir erməni müxbiri Türkiyə Prezidenti, hörmətli Süleyman Dəmirələ sual verdi: "Siz nə üçün Ermənistanla münasibətləri yaxşılaşdırmırsınız, axı biz qonşu ölkələrik?".

Süleyman Dəmirəl ona çox dəyərli cavab verərək dedi ki, "Siz nə vaxt Azərbaycanla münasibətləri normallaşdıracaqsınızsa, Türkiyə də o vaxt Ermənistanla öz münasibətlərini normallaşdıracaqdır".

Ümummilli Liderimiz Azərbaycan-Türkiyə münasibətlərini yalnız Türkiyənin dövlət başçıları ilə deyil, müxtəlif sahələrin nümayəndələri ilə görüşlər, məsləhətləşmələr əsasında qururdu. Bu baxımdan onun Türkiyənin Mərmərə qrupu Strateji və Sosial Araşdırmalar Vəqfinin sədri Akkan Süvərin başçılıq etdiyi nümayəndə heyəti ilə 2002-ci il avqustun 23-də Bakıda Prezident sarayındakı görüşünü nümunə gətirmək mümkündür. Görüş zamanı Ulu Öndər demişdir: "Qars mənim üçün çox əhəmiyyətli bir yerdir. Mən Naxçıvanda yaşayanda Türkiyəyə İğdırdan, Qarsdan keçib gəlirdim. Qarsın Azərbaycanla əlaqələrdə də xüsusi yeri var. Məşhur Qars müqaviləsi var, 1921-ci ilin oktyabr ayında Qarsda Rusiya, Azərbaycan, Türkiyə, Gürcüstan, bir də Ermənistan tərəfindən imzalanıbdır. Bu müqavilə Azərbaycan, Ermənistan, Türkiyə sərhədlərinin müəyyən edilməsi haqqındadır. O vaxt ermənilər iddia edirdilər ki, Türkiyənin şərqində olan torpaqlar guya onlara məxsusdur. Bizim bəzi başqa torpaqlara da iddia irəli sürürdülər. Bu baxımdan Qars müqaviləsi çox əhəmiyyətli bir sənəddir. Bunu çoxları unutmuşdu, tarixdə qalmışdı. Amma mən Naxçıvanda işləyəndə bu bölgənin problemləri ilə məşğul oldum, Naxçıvanı qorumaq lazım idi. Mən bilirdim ki, Qars anlaşması var. 1992-ci ilin fevral ayında Ankaraya gəldim. Orada Qars anlaşması haqqında mətbuata geniş məlumat verdim. Bu anlaşma yenidən gündəliyə çıxdı. Moskvada buna çox mənfi reaksiya verdilər. Moskvadan Qars müqaviləsinə aid bir veriliş verdilər. Axırda isə bildirdilər ki, bu müqavilənin heç bir hüquqi qüvvəsi yoxdur, hətta Qars müqaviləsinin mətnini elə studiyadaca yandırdılar. Amma onu yandırmaq mümkün deyil, bu müqavilə o vaxt həmin dövlətlər tərəfindən imzalanıb, hər dövlət tərəfindən ratifikasiya olunub və ümumdünya, beynəlxalq təşkilatlarda qeydə alınıbdır, onu pozmaq mümkün deyildir" [3, k. 40, s. 172].

Söhbət zamanı Türkiyənin Mərmərə qrupu Strateji və Sosial Araşdırmalar Vəqfinin səd-

ri Akkan Süvər bildirdi: "Siz böyük bir iş gördünüz və Azərbaycan televiziyasının Türkiyəyə yayımını təşkil etdiniz. Bu bizim Azərbaycanla olan əlaqələrimizin qüvvətlənməsinə, artmasına böyük təkan verir. Türkiyədə, demək olar, hamı hər axşam Azərbaycan televiziyasına baxır" [3, k. 40, s. 172].

Heydər Əliyev inanırdı və möhkəm əmin idi ki, Türkiyə Respublikası heç zaman ölkəmizi tək qoymayacaq, həmişə onun yanında olacaq: Ulu Öndər deyirdi: "Bir gün gələcək, biz yaxşı günləri Türkiyə ilə, Türk xalqı ilə bir yerdə bayram edəcəyik. Türkiyənin qəlbi Azərbaycanın qəlbi ilə döyünür. Azərbaycan üçün Türkiyədən yaxın dost, qardaş dövlət yoxdur. Türkiyə üçün də bütün ölkələr, xalqlar arasında Azərbaycan qədər dost, qardaş ölkə yoxdur. Heç bir qüvvə, heç bir kəs, heç bir ölkə Türkiyə-Azərbaycan dostluğuna mane ola bilməz. Bizim dostluğumuz sarsılmazdır, əbədidir və əbədi olacaqdır"; "Türkiyənin inkişafı, güclənməsi Azərbaycan üçün dayaqdır".

Həmin sözlərdə dərin həqiqət vardır.

Biz məqalədə Ümummilli Liderimiz Heydər Əliyevin timsalında Azərbaycan-Türkiyə münasibətlərinin tarixini yığcam şəkildə nəzərdən keçirdik, daha doğrusu, bəzi məsələlərini diqqət mərkəzinə gətirdik. Bu münasibətlərin inkişaf etdirilməsi və möhkəmləndirilməsi arzuolunandır, son dərəcə vacibdir. Bütün bu məsələlərlə təhsilalanların – ümumtəhsil məktəbləri şagirdlərinin, ali və orta ixtisas təhsili müəssisələri tələbələrinin tanış edilməsi məqsədəuyğundur.

**Problemin aktuallığı**. Azərbaycan Respublikası Prezidentinin sərəncamı ilə 2023-cü il Heydər Əliyevin anadan olmasının 100 illik yubileyi ilə əlaqədar olaraq ili elan olunmuşdur. Ulu Öndərin həyat və səmərəli fəaliyyətinə həsr olunmuş bu məqalə aktuallığı ilə seçilir.

**Problemin yeniliyi.** Ulu Öndər Heydər Əliyevin Azərbaycan-Türkiyə münasibətlərinə dair fikirləri diqqətə çatdırılır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir. 1-ci kitab. / H.Ə. Əliyev. -Bakı: Azərnəşr, -1997, -612 s.
2. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir. 31-cü kitab. / H.Ə. Əliyev. -Bakı: Azərnəşr, -2010. -512 s.
3. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir. 40-cı kitab. / H.Ə. Əliyev. -Bakı: Azərnəşr, -2012. -512 s.
4. Nərimanovun Atatürkə köməyi. https://kayzen.az/blog/maraqli-faktlar/21186/n%C9%99rimanovun-atat%C3%BCrk%C9%99-k%C3%B6m%C9%99yi.htm
5. Abbasov A.N. Heydər Əliyev irsi pedaqogikanın çox mühüm mənbələrindən biri kimi A.N. Abbasov. Pedaqogika. -Bakı: Mütərcim, -2015, -s. 28-29

**E-mail**: prof.akif@mail.ru
**Rəyçilər**: *ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov,**
*ped.ü.fəls.dok.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub**: 17.02.2023.

*UOT 37.0*

***Zəhra Bilal qızı Muradova***
*pedaqogika elmləri doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*

# ÜMUMMİLLİ LİDERİN TƏHSİL SİYASƏTİNİN ƏSAS İSTİQAMƏTLƏRİ

***Захра Билал гызы Мурадова***
*доктор педагогических наук, ведущий научный сотрудник*
*Института Образования Азербайджанской Республики*

# ОСНОВНЫЕ НАПРАВЛЕНИЯ ОБРАЗОВАТЕЛЬНОЙ ПОЛИТИКИ ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА

***Zahra Bilal Muradova***
*doctor of pedagogical sciences, leading scientific worker at the*
*Institute of Education of the Republic of Azerbaijan*

# THE MAIN DIRECTIONS OF THE EDUCATION POLICY OF NATIONAL LEADER

**Xülasə.** Məqalədə Ümummilli Lider Heydər Əliyevin milli-mənəvi dəyərlərə, xalqın tərəqqisinə verdiyi dəyər, təhsilin inkişafı istiqamətində gördüyü işlər öz əksin tapmışdır. Eləcə də bu sahədə müəllim və müəllimlik peşəsinə göstərdiyi hörmət və ehtiram nümunələr əsasında təqdim olunmuşdur.
***Açar sözlər:*** *təhsil, millət, gələcək, dayanıqlıq, inkişaf*

**Резюме.** В статье повествуется о значениях, придаваемых общенациональным лидером Гейдаром Алиевым национальным и нравственным ценностям, прогрессу народа, работе, проделанной в направлении развития образования. Автором на основе образцов представлено уважение к профессии учителя и педагогической профессии в этой области.
***Ключевые слова:*** *образование, нация, будущее, устойчивость, развитие*

**Summary.** The article reflects the importance of the national leader Heydar Aliyev to national and moral values, the progress of the people, the work done in the direction of the development of education. Also, the examples show respect for 0the teacher and the teaching profession in this area.
***Key words:*** *education, nation, future, sustainability, development*

Milli dövlətçilik ideologiyasında rəqabətə davamlı təhsil sisteminin yaradılması əsas istiqamət kimi diqqət mərkəzindədir. Ölkəmiz müstəqillik qazanandan sonra bu ideologiya təhsilin qarşısında duran prioritet məsələlərdən oldu. Bu səbəbdən xalqımızın Ümummilli Lideri Heydər Əliyev hakimiyyətinin həm birinci, həm də ikinci dövründə cəmiyyətimizin digər sahələri ilə yanaşı təhsilin inkişafına da xüsusi diqqət yetirirdi. O, hakimiyyətinin birinci dövründən başlayaraq Azərbaycanda orta ixtisas, ümumtəhsil və ali məktəblərin sayının artırılmasına nail oldu. Eyni zamanda, təhsilin keyfiyyətinin yüksəldilməsi də ön plana çıxarıldı. Yüksək ixtisaslı kadrların hazırlanması və istehsalatda yerləşdirilməsi o zaman qarşıda duran mühüm vəzifələrdən biri sayılırdı. Çünki ölkə geridə qalmış aqrar dövlətdən elmi, texnikası, iqtisadiyyatı, xalq təsərrüfatı inkişaf edən bir ölkəyə çevrilməli idi. Bu, Heydər Əliyevin strateji məqsədlərindən birini təşkil edirdi. Məqsədlərin reallaşdırılması üçün isə ölkəyə yüksək ixtisaslı gənc kadrlar lazım idi. Məhz buna görə keçən əsrin 70-ci illərindən başlayaraq SSRİ-nin məşhur ali məktəbləri ilə ilk dəfə olaraq tələbə mübadiləsi təşkil edildi. Təsadüfi deyildir ki,

Heydər Əliyev respublikadan kənardakı zəngin elmi təcrübələrə malik olan ali məktəbləri bitirənləri Azərbaycanın "qızıl fondu" adlandırırdı.

Ulu Öndər Heydər Əliyev həmişə, o cümlədən müstəqillik illərində də təhsilin inkişafını diqqətdən kənarda qoymamışdır. Bu sahədə mövcud olan problemlərin aradan qaldırılması və Azərbaycanda dünyanın inkişaf etmiş ölkələrinin təcrübəsinə uyğun təhsil strategiyasının həyata keçirilməsi üçün çox mühüm əhəmiyyət kəsb edən sərəncamlar imzalamışdır.

Orta və yaşlı nəslin nümayəndələri yaxşı xatırlayır ki, o vaxtlar unudulmaz rəhbərimiz özü hətta rayonlardakı kənd məktəblərinə gedər, təhsilin vəziyyəti, tədrisin necə aparılması ilə maraqlanar, lazımi tapşırıq və tövsiyələrini verərdi. O, daim müəllimlərə öz ehtiramını bildirərdi. Bir neçə dəfə televiziya ilə çıxışlarında özünə kiçik yaşlarında dərs demiş Kərbəlayi Məhəmmədin adını böyük hörmətlə çəkmiş, ehtiramla yad etmişdir.

Yevlax rayonunun Xaldan kənd orta məktəbində bir neçə dəfə olmuş Ulu Öndər təhsil ocağının fəaliyyətindən razı qalmış və buna görə də SSRİ-də ilk dəfə olaraq məktəbin direktoru Zahid Şöyübova SSRİ Xalq Müəllimi kimi yüksək fəxri ad verdirmişdir. Onu da qeyd edək ki, SSRİ hökuməti o zaman müəllimlərə belə fəxri ad vermirdi. Tək Zahid Şöyübov deyil, sonra onlarla müəllim SSRİ-nin ali ordenləri və fəxri adları ilə təltif edilmişdilər. Təbii ki, bütün bunların hamısı SSRİ-də böyük nüfuza malik Heydər Əliyevin sayəsində mümkün olmuşdu.

Ümummilli Liderimiz daim müəllim əməyini yüksək qiymətləndirir, müəllim adını uca tuturdu. Aforizmə çevrilmiş fikirlərində bildirirdi ki, bizim hər birimiz elmi dərəcəmizdən, biliyimizdən, təhsil səviyyəmizdən asılı olmayaraq, bütün nailiyyətlərimizə görə məktəbə, müəllimə bor cluyuq. O, həmişə fəxrlə deyərdi: "Mən Azərbaycanın sadə vətəndaşıyam. Bu addan yüksək ad yoxdur. Ancaq bundan da yüksək ad müəllimlikdir".

1991-ci ilin oktyabrında Azərbaycan özünün dövlət müstəqilliyini bərpa edəndən sonra gənc respublikanı zəiflədib yenidən imperiya əsarəti altına salmağa çalışan qüvvələr qəsdən ölkəni təhlükəli vəziyyətə gətirdilər. Heç şübhəsiz ki, əgər 1993-cü ilin iyununda əvəzsiz dövlət idarəetmə lideri olan Heydər Əliyev hakimiyyətə gəlməsəydi, Azərbaycan bir çox fəlakətlərə məruz qalacaqdı. Hər vaxt xalqının səsinə səs verən müdrik siyasətçi Bakıya gələrək hakimiyyət başına keçdi. O gün ölkəmizin tarixinə "Qurtuluş Günü" kimi daxil oldu. Hamı əmin oldu ki, dövlətimiz və dövlətçiliyimiz artıq layiq olduğu, onu qoruya biləcək etibarlı əldədir.

1993-2002-ci illərdə Ulu Öndərimiz xarici səfərlərində həmin ölkələrdə təhsil alan tələbələrlə görüşər, ümidlərini bildirər, onların qayğıları ilə maraqlanar və elmlərin əsaslarına dərindən yiyələnməyi tövsiyə edərdi. Ümummilli Liderimiz sonuncu çıxışını da Cəmşid Naxçıvanski adına hərbi məktəbin müdavimləri qarşısında etmişdi. Burada təhsil alan müdavimlər sonralar Türkiyədə hərbi ixtisas hazırlıqlarını davam etdirmişdilər. Onlar 44 günlük Vətən müharibəsində iştirak edən qazilər və şəhid olan igidlərdir.

Kadrların hazırlanmasına ciddi diqqət yetirən Ulu Öndər müəllimlərə layiqli gənc nəsil yetişdirməyi tapşırırdı. "Təhsilimizin məqsədi gənc nəslə, uşaqlara təhsil verib onları gələcəyə hazırlamaqdır. Hər bir insan gərək, eyni zamanda vətəndaş olsun. Mütləq vətəndaş olsun. Dövlətinə sadiq, ənənələrinə sadiq, xalqına sadiq vətəndaş olsun."

Müstəqilliyimizin ilk illərində, ölkəmizin hələ zəif iqtisadi dönəmində, maddi imkanların çatışmazlığı şəraitində belə müəllimlərin yaşayışına, təhsil sahəsinin inkişafına nə yolla olursa-olsun kömək etməyi vacib sayan Ulu Öndərimiz təhsilimizin ehtiyaclarının ödənilməsi barədə düşünürdü: "...Məktəb, maarif, təhsil işi ilə həmişə sıx bağlı olmuşam... Hesab edirəm ki, cəmiyyət haradan olursa-olsun, nədən olursa-olsun kəsib təhsilə xərcləməli, gənc nəslin təhsilinə, müəllimə kömək etməlidir. Bu mənim prinsipial mövqeyimdir..."

Bildiyimiz kimi, müstəqilliyimizin ilk illərində cəmiyyətimizin başqa sahələri ilə bərabər təhsil sahəsi də bərbad vəziyyətdə idi. Yeni və milli zəminə əsaslanan təhsil sistemi qurulmalı idi. Bu vəzifənin həyata keçirilməsi təbii ki, uzun müddət və maddi resurslar tələb edirdi. Ona görə Ulu Öndər Heydər Əliyev təhsil işçilərinin qarşısında yeni vəzifələrin durduğunu bildirirdi:

"Dövlət müstəqilliyinin xalqımıza bəxş etdi yi nemətlərdən biri də odur ki, biz artıq təhsil sistemimizi xalqımızın, millətimizin tarixinə, mənəviyyatına, ənənələrinə uyğun qururuq.

Bu proses qısa müddətdə başa çata bilməyəcəkdir. Bu gün təhsil sahəsində çalışan bütün vətəndaşlara, müəllimlərə, təhsil müəssisələrinin rəhbərlərinə müraciət edərək xahiş edirəm ki, onlar tezliklə təhsil sistemində işlərin müstəqil Azərbaycanın prinsipləri əsasında qurulmasına nail olsunlar. Burada dərsliklərin dəyişilməsi, yeni dərsliklərin yaranması xüsusi əhəmiyyət kəsb edir. Bilirəm, bu asan məsələ deyil.

Bu, bir çox amillərlə bağlıdır, ondan asılıdır. Ancaq indi dərs alan uşaqlar, gənclər gərək mütlə q və mütləq bizim yeni dərsliklər əsasında oxusun lar...”

Azərbaycan müəllimlərinə sonuncu tövsiyələrindən birində Ümummilli Liderimiz tapşırırdı ki, müasir gənclərimizi və şagirdlərimizi milli ruhda, öz soy-kökünə bağlı vətəndaşlar kimi yetişdirsinlər. Bunun üçün isə gələcək nəsillər, ilk növbədə, öz keçmiş tarixini, ata-babalarının keçdikləri şanlı yolları öyrənməlidirlər. Tariximizi, onun milli adət-ənənələrini dərindən öyrənməklə milli ideologiyamıza sadiq vətəndaşlar yetişdirmək mümkündür. Bu vacib məsələyə böyük önəm verən Ulu Öndər deyirdi: “Milli ideologiyamızı hər yerdə təbliğ etmək üçün məktəblərdə Azərbaycan xalqının tarixinin tədrisinə çox ciddi fikir vermək lazımdır… Gənclərimiz öz tarixini, öz tarixi keçmişini gərək yaxşı bilsinlər. Çünki mənəviyyatımız, gənclərin bu günkü və gələcək mənəviyyatı bununla bağlıdır”.

Dünya şöhrətli liderimiz Heydər Əliyev öz titanik fəaliyyəti ilə canından artıq sevdiyi Azərbaycanın inkişafı, dünyada tanınması və nüfuz qazanması üçün əlindən gələni əsirgəmədi. Biz indi də dahi rəhbərimizin həyata keçirdiyi islahatların, nailiyyətlərin bəhrəsini dadırıq.

Azərbaycan Heydər Əliyevin siyasi varisi Prezident İlham Əliyevin rəhbərliyi ilə iqtisadiyyatı güclənən və dünyada söz sahibinə çevrilən bir demokratik ölkə olmuşdur. Azərbaycan bir çox ölkələrin əlli-yüz ilə keçdiyi inkişaf yolunu çox qısa müddətdə, cəmi 20-25 ilə keçmişdir. Bu, dahi Heydər Əliyev ideyalarının həyata keçirilməsi nəticəsində mümkün olmuşdur. Qədirbilən xalqımız bu gün də anadan olmasının 100 illiyini təntənə ilə qeyd etməyə hazırlaşdığımız Ümummilli Liderimizlə fəxr edir, müqəddəs ruhuna rəhmət deyir!!!

**Problemin aktuallığı.** Ulu Öndər Heydər Əliyevin irsi hər zaman öyrənilməli və təbliğ olunmalıdır.

**Problemin elmi yeniliyi**. Ümummilli Lider Heydər Əliyevin milli-mənəvi dəyərlərə, müəllimlik peşəsinə verdiyi dəyər nəzəri baxımdan əsaslandırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə Ümummilli Lider Heydər Əliyevinin irsinin təbliği gənc tədqiqatçılar üçün baza rolunu oynaya bilər.

**Ədəbiyyat:**


1. Əliyev, M. Heydər Əliyev elm-təhsil və mədəniyyətin himayədarı // Bakı: “Xalq qəzeti”, - 2010, - 16 may. – s. 4
2. Qaralov Z.İ, Heydər Əliyevin elmi irsi (nəzəriyyə və təcrübə). I cild. / Z.İ. Qaralov. -Bakı: Şərq-Qərb, - 2013, - 304 s.
3. Qaralov, Z.İ. Milli ləyaqət ölçüsü. / Z.İ. Qaralov. -Bakı: Təhsil,- 2015, - 405 s.
4. Mahmudova, V. Şərqin yerdə doğan günəşi idi. -Bakı: “Vektor” Beynəlxalq elm mərkəzi, -2004, - 6 s.


**E-mail:** zahra.muradova@hotmail.com

**Rəyçi:** *ped.elm.dok., prof.* **İ.H. Cəbrayılov**

**Redaksiyaya daxil olub:** 25.01.2023.

*UOT 37.0*

***Adilə Həsən qızı Nəzərova***
*filologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*
*Orcid: 0000-0002-4340-6882*

# HEYDƏR ƏLİYEVİN İSLAM DƏYƏRLƏRİNƏ DAİR FİKİRLƏRİ İLƏ TANIŞLIQ ŞƏXSİYYƏT BÜTÖVLÜYÜNÜN AMİLİ KİMİ

***Адила Гасан гызы Назарова***
*доктор философии по филологии*
*ведущий научный сотрудник Института Образования Азербайджанской Республики*

# ЗНАКОМСТВО С МЫСЛЯМИ ГАЙДЕРА АЛИЕВА ОБ ИСЛАМСКИХ ЦЕННОСТЯХ КАК ФАКТОР ЦЕЛОСТНОСТИ ЛИЧНОСТИ

***Adila Hasan Nazarova***
*doctor of philosophy in philology,*
*leading scientific worker at the Institute of Education of the Republic of Azerbaijan*

# ACQUAINTANCE WITH HEYDAR ALIEV'S THOUGHTS ON ISLAMIC VALUES AS A FACTOR OF INTEGRITY OF THE PERSON

**Xülasə.** Azərbaycan gənclərinin həyatda uğur qazanması, sülh və əmin-amanlıq içində yaşaması üçün onları milli-mənəvi, dini dəyərlərimizlə birləşdirmək Heydər Əliyev siyasətinin əsas istiqamətlərindən biri olmuşdur.

Ulu öndərin bu yolda əsas məqsədi tolerantlığın və milli mədəniyyətimizin, dini dəyərlərimizin Azərbaycan gənclərinə düzgün şəkildə təbliğ edilməsi olmuşdur. Belə ki, hazırda Azərbaycan xalqı, o cümlədən gənclər ümumbəşəri, tolerant və multikultural dəyərlərlərlə yanaşı, islam sivilizasiyasına mənsub dəyərləri də özündə yaşadır.

***Açar sözlər:*** *İslam dəyərləri, Heydər Əliyev siyasəti, İslam Kolleci, şəxsiyyət bütövlüyü*

**Резюме.** Одним из основных направлений политики Гейдара Алиева было объединение молодежи Азербайджана с нашими национально-духовными и религиозными ценностями, чтобы они могли преуспеть в жизни и прожить в мире и спокойствии.

Главной целью великого лидера на этом пути, являлось должным образом пропагандировать толерантность, нашу национальную культуру и религиозные ценности среди молодежи Азербайджана. Таким образом, в настоящее время азербайджанский народ, в том числе и молодежь обладает общечеловеческими, толерантными и мультикультуральными ценностями, а также ценностями, принадлежащеми исламской цивилизации.

***Ключевые слова:*** *исламские ценности, политика Гейдара Алиева, Исламский Колледж, целостность личности*

**Summary.** One of the main directions of Heydar Aliyev's policy was to unite the youth of Azerbaijan with our national, spiritual and religious values so that they could succeed in life and live in peace and tranquility.

The main goal of the great leader on this path was to properly promote tolerance, our national culture and religious values among the youth of Azerbaijan. Thus, at present, the Azerbaijani people, including young people, have universal, tolerant and multicultural values, as well as values belonging to the Islamic civilization.

***Key words***: *Islamic values, Heydar Aliyev's policy, Islamic College, personal integrity*

Sovet rejiminin birlik ideyasını dağıtdığı dünya türkləri dini inancı, ənənələri, xüsusilə də ədəbiyyatı sayəsində məhv olmaqdan qurtarmışdır. Ümummilli Lider Heydər Əliyevə görə, türkləri birləşdirmək üçün onları ortaq düşüncə ətrafında toplamaq ideyasını – dini dəyərləri ortaya qoymaq lazım idi. Onun Azərbaycanın klassik ədəbiyyatına, klassik ədəbiyyatın nümayəndələrinin əsərlərinin təbliğinə xüsusi diqqət və qayğısının böyük təzahürü də bundan irəli gəlirdi.

Ulu Öndər Heydər Əliyev ayrı-ayrı etnosları, konfessiyaları və mədəniyyətləri təmsil edən Azərbaycan tolerantlığını möhkəmləndirməklə həmrəylik naminə, ənənəvi və qeyri-ənənəvi dinlər arasında münasibətləri qanun çərçivəsində sivil yolla tənzimləyirdi. O, dini ekstremizmə qarşı mübarizədə təhsillə yanaşı dini maarifləndirmənin rolunu da əsas götürürdü. Müstəqil Azərbaycan Gənclərinin I forumundakı (1996-cı il, 2 fevral) çıxışında ayrı-ayrı qrupların gənclərə fanatizm əhval-ruhiyyəsi aşılamaq istəyini və bunların da gənclərimizn tərbiyəsinə zərər vurduğunu qeyd etmişdir.

Qeyd edək ki, 2000-ci illərin əvvəllərindən Heydər Əliyevin təşəbbüsü ilə Azərbaycanın müxtəlif bölgələrində dini icmaların tərkibində fəaliyyət göstərən kurslarla yanaşı İslam dininin elmi əsaslarla öyrənilməsi üçün dini təhsil müəssisələri yaradılmış və bu müəssisələrdə müəllimlər yerli kadrlardan seçilmişdir. Həmin dini məktəblərdə gənclərə tariximiz, milli mədəniyyətimiz, soy-kökümüz haqqında biliklər verilməklə, məzhəblərarası tolerant münasibətlər, multikultural əlaqələr tədris və təbliğ olunur, “İslam birliyi” prinsiplərinin sistemli şəkildə tələbələrə öyrədilməsi həyata keçirilir. Kolleclərdə dinin tədrisi prosesində dinin təməlində dayanan əsas biliklərin öyrədilməsi tələbələrin dinlə bağlı dolğun və düzgün təfəkkürə sahib olmasına imkan yaradır. Əks halda kollec tələbələrinin natamam dini biliklərinin boş qalan yeri antimilli qüvvələr, dini radikalizmin tərəfdarları tərəfindən məqsədli şəkildə doldurulacaqdı.

Bunlar Zaqatala İslam Kolleci, Gəncə İslam Kolleci, Lənkəran İslam Kolleci, Quba İslam Kolleci, Heydər İslam Kolleci, Nardaran İslam Kolleci, Bibiheybət İslam Kolleci, Şəki (hafizlik) İslam Kolleci, Əliabad İslam Kolleci, Şəbnəm (qızlar) İslam Kollecidir. Bu kolleclərin fəaliyyəti nəticəsində ölkəmizin milli-dini kadrların hazırlanması istiqamətində irəliləyişlərə nail olunacağı gözlənilir. (3)

Bu da gəncləri dini fanatizmdən, zərərli vərdişlərdən və əxlaqi-tərbiyəvi hərəkətlərin pozulmasından qoruyur. Bu fikirləri ümumiləşdirərək demək olar ki, Azərbaycan dövləti dini sahədəki bu uğurları İslam həmrəyliyinin əsasını qoyan Heydər Əliyevin azərbaycançılıq siyasəti nəticəsində əldə etmişdir. Heydər Əliyev irsində məhz İslam dəyərlərinin gənc nəslə ötürülməsi gənclərin bir şəxsiyyət kimi inkişafının və şəxsiyyət bütövlüyünün tamamlanmasının amili kimi diqqəti cəlb edir.

Belə ki, Azərbaycanda din və dövlət münasibətləri dünyəvilik prinsipinə əsaslanır. Bu modeli Ulu öndər belə ifadə edirdi: “Bizim dövlətimiz dünyəvi dövlətdir. Ancaq biz dindən ayrı deyilik”. Heydər Əliyevin dünyəvilik modeli din-dövlət münasibətlərinin bir-birindən ayrı olmasına baxmayaraq, dini dəyərlərin də təməl dəyərlərimiz kimi qorunan və davamlı istifadə olunan modeldir.

Gənclər bilməlidirlər ki, həyatda uğurla yaşamaq üçün xalqımızın, millətimizin milli-mənəvı dəyərlərınə sadiq olmaq lazımdır, bu milli-mənəvi dəyərləri ümumbəşərı dəyərlərlə birləşdirib müasir həyat tərzi keçirmək lazımdır. (5)

Heydər Əliyev bütün fəaliyyəti dövründə İslam mədəniyyətinin Azərbaycanın bir ölkə kimi inkişafında rolunu yüksək qiymətləndirir və çıxışlarında İslam dininin ümumbəşəri əhəmiyyətini xüsusi olaraq vurğulayırdı. O, həmçinin dünyada fəaliyyət göstərən bir çox tədqiqat mərkəzlərində İslam dinini fundamentalizm və ekstremizm olaraq təqdim edənlərə etiraz etmiş, onların bu sahədə fikirlərini inkar etmişdir. Heydər Əliyev Bakıda keçirilən “İslam sivilizasiyası Qafqazda” adlı Beynəlxalq Simpoziumda açılış mərasimindəki çıxışında mövzu ilə bağlı fikirlərini belə ifadə etmişdir: “Biz İslam mədəniyyətinin Azərbaycan xalqı üçün əvəzsiz olduğunu qeyd edərək, eyni zamanda, dini, yaxud milli məhdudiyyət yaradan fikirləri, meylləri və ya təklifləri qəbul etmirik. Millilik, islamilik, ümumbəşəri dəyərlərin sintezi ilə xalqı inkişaf etdirə bilər. İndi dünyadakı bəzi mərkəzlərdə “İslam fundamentalizmi, İslam ekstremizmi, fanatizmi” haqqında da fikirlər söylənilir”.

Ümummilli lider İslam dinini cəmiyyətdə humanist prinsiplərin carçısı, sülhün və əmin-

amanlığın, qardaşlığın dini olduğunu dəfələrlə qeyd edirdi. Hər dəfə bu mövzuda çıxış edərkən, narahatlıqlarını da dilə gətirirdi. O, bildirirdi ki, bəzi terror qrupları öz cinayətkar əməllərini həyata keçirmək üçün fəaliyyətlərini dini şüarlarla pərdələməyə çalışırlar və bu yolverilməzdir.

Heydər Əliyevi bir şəxsiyyət, bir dövlət xadimi və bir prezident kimi fərqləndirən milli köklərinə və dini dəyərlərinə bağlılığı idi ki, o, bu keyfiyyətləri ilə həmişə öndə olmuşdur.

Onun gənclərlə hər bir görüşü, hər nitqi xitab etdiyi nəslin vətənpərvərlik ruhunda geniş üfüqlər açırdı.

"Bu gün böyük iftixar hissi ilə deyə bilərik ki, Azərbaycanın qüdrətli ordusu vardır. Azərbaycan torpaqlarını həmişə müdafiə etməyə, lazım olarsa, torpaqlarımızı müharibə yolu ilə azad etməyə qadir olan ordumuz vardır. Azərbaycanda cəmiyyətdə, xüsusilə gənclər arasında orduya münasibət müsbət mənada tamamilə dəyişibdir. Gənclər indi orduya həvəslə gedirlər, orduda xidmət edirlər, öz vətəndaşlıq borclarını yerinə yetirirlər və Azərbaycan ordusunu gücləndirirlər, inkişaf etdirirlər. …Ordunun bugünkü vəziyyəti hamımızda böyük iftixar hissi doğurur. Bəli, qısa bir zamanda Azərbaycanda ordunun yaranması və orduda zabitlərin, əsgərlərin sədaqətlə xidmət etməsi həyatımızın ən gözəl əlamətlərindən biridir. Ancaq orduya qayğı, diqqət daim artmalıdır. Azərbaycan gəncləri orduda xidmət etməyi öz şərəfli borcları hesab etməlidirlər." (3)

Heydər Əliyevin, sonrakı illərdə də Prezident İlham Əliyevin məqsədyönlü fəaliyyəti nəticəsində ölkəmiz müasirliklə – tolerantlıq və multikultiralizmlə yanaşı İslam dini ilə bağlı maarifləndirmə işlərini də davam etdirmişdir. Bu müdrik siyasətin nəticəsi idi ki, gənclərimiz Azərbaycanın bütövlüyü, sərhədlərimizin qorunması yolunda döyüşə həvəslə getdilər. Gənclər siyasətində milli maraqların və dövlətçilik maraqlarının öndə olması 44 günlük II Qarabağ savaşında həlledici rol oynadı, Azərbaycan gəncliyinin mübarizliyi, təşəbbüskarlığı ilə əsgər və zabitlərimiz misilsiz şücaət göstərərək xalqımıza zəfər qazandırdılar. Onlar bu yolda vətən sevgisi ilə bərabər dini inanclarını rəhbər tutdular və "Vətəni sevmək imandandır" (Məhəmməd Peyğəmbər), "Ya şəhid olmaq gərək, ya intiqam almaq gərək" (M. Füzuli, "Hədiqətüs-Süəda") şüarları altında şəhidliyə ucaldılar. Bu, eyni zamanda, onların dini inanclarının, mədəni-psixoloji bütövlüyünün göstəricisi idi.

Heydər Əliyev ölkədə rəhbərliyə başlayandan sonadək bütün çıxışlarında Sovet dövründə xalqın İslam dinindən məcburən və qəsdən uzaqlaşdırılmasını, bu vaxt xalqın keçirdiyi mənəvi sarsıntıları xatırladırdı. Burada məqsəd insanların bu psixoloji narahatlıqdan qurtarmasını yada salmaq və bunların bir daha təkrar olunmamasını gənc nəslin şüuruna təlqin etmək idi. O, həmişə qeyd edirdi ki, Sovet hakimyyəti dövründə İslam dininə qarşı aparılan total və ardıcıl mübarizə təkcə Azərbaycana qarşı yox, bütün İslam ölkələrinə, nəticə etibarilə İslam dininə qarşı idi.

Heydər Əliyev deyirdi: "İslam dini başqa dinlərə qarşı heç vaxt düşmən olmamışdır. Çünki bu dinlərin hamısı Allahdan gəlir. Azərbaycanda da müsəlmanlarla yanaşı başqa dinlərə etiqad edən adamlar da yaşayır. Onlar da Azərbaycanın bərabərhüquqlu vətəndaşlarıdır. Çalışmalıyıq ki, dini, milli mənsubiyyətindən asılı olmayaraq Azərbaycanın bütün vətəndaşları eyni hüquqlu olsunlar və onların hamısının birliyini, vəhdətini təşkil edək. Bu da Allah-Taalanın buyruğu, bizim yolumuzdur." (4)

Qeyd etmək lazımdır ki, bu gün Azərbaycan Respublikası islam aləmində sülhün və həmrəyliyin möhkəmləndirilməsinə böyük töhfələr verir və bu müsəlman aləmində yüksək qiymətləndirilir. Ölkəmizdə milli-mədəni dəyərlərə hörmət edən gənclərin, İslam əxlaqına malik şəxsiyyətlərin yetişməsi mənəvi varlığmızın bayağı mədəniyyətlər içərisində assimilyasiya olunmasının qarşısının alınmasıdır. Çünki Şərq və Qərb mədəniyyətləri arasında körpü olan Azərbaycan bütün dinlər və sivilizasiyalararası əlaqələrin möhkəmlənməsinə, dünyada sülhün və harmoniyanın bərqərar olmasına çalışır, bəşəriyyətə unikal birgəyaşayış modeli təqdim edir. Bu da onu göstərir ki, Azərbaycan islam dininin yüksək mənəvi-əxlaqi prinsiplərinə sadiq qalmaqla, ümumbəşəri dəyərlərə önəm verir və bununla yer üzündəki din xadimlərinin üzərinə böyük məsuliyyət qoyur.

Azərbaycan tarixən tolerantlıq, qeyri dinin daşıyıcılarının dini ənənə və qaydalarına, dini mərasimlərinə sayğısı ilə fərqlənmişdir.

**Problemin aktuallığı.** Ümummilli Lider Heydər Əliyevin din sahəsində apardığı siyasət bugünkü gənc nəslin həyat yolunun istiqamətlərini müsbət yöndən müəyyənləşdirmişdir. Onları yad və zərərli ideologiyadan uzaqlaşdırmış və gələcəkdə dövlət və din münasibətlərini sağlam şəkildə inkişaf etdirməsinə şərait yatarmışdır.

**Problemin elmi yeniliyi.** Ulu Öndər Heydər Əliyev Azərbaycanda tolerantlığın möhkəmləndirilməsində birlik göstərmək üçün fərqli dinlərin nümayəndələri arasında münasibətləri qanun çərçivəsində tənzimləyirdi. Bütün dövrlərdə, xüsusən son onillikdə bu məsələdə dini maarifləndirmənin rolu eynilə davam etdirilir.

**Problemin praktik əhəmiyyəti.** Demək olar ki, həm dini dəyərlərimizin möhkəmləndirilməsi, həm də beynəlxalq standartlara uyğun olan tolerantlıq Azərbaycanda ən çox Ulu öndərin hakimiyyəti illərində və onun xidmətləri sayəsində yaranmışdır.

**Ədəbiyyat:**


1. Heydər Əliyevin kəlamları, 21 dildə. / Azərbaycan İlahiyyat İnstitutu. - Bakı: Mütərcim,– 2019.
2. Hüseynov S., Xalq qəzeti. -2009, 9 dekabr. -s.4
3. (Respublika gənclərinin II forumunda Azərbaycan Prezidenti Heydər Əliyevin nitqi - 4 mart 1999-cu il) https://lib.aliyevheritage.org/az/1570012.html
4. Ömərov, V. Ulu Öndər Heydər Əliyevin dinə, islam dininə və dəyərlərinə qayğısı dövlətçiliyin təzahürü kimi //"Səs qəzeti", -2014, 17 iyun. https://sesqazeti.az/news/mia/415598.html
5. http://shirvan.cls.az/front/files/libraries/2474/books/117810196.pdf


**E-mail:** adile1970@mail.ru

**Rəyçilər:** *ped.elm.dok., prof.* **A.N. Abbasov**
*ped.ü.fəls.dok., dos.* **L.A. Məmmədli**
**Redaksiyaya daxil olub:** 14.02.2023.

*UOT 37.0*

***İradə Böyükağa qızı Əmirəliyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*

# ÜMUMMİLLİ LİDER HEYDƏR ƏLİYEV AZƏRBAYCANDA MULTİKULTURALİZM VƏ TOLERANTLIQ HAQQINDA

***Ирада Боюкага гызы Амиралиева***
*доктор философии по педагогике*
*ведущий научный сотрудник Института Образования*
*Азербайджанской Республики*

# ОБЩЕНАЦИОНАЛЬНЫЙ ЛИДЕР ГЕЙДАР АЛИЕВ О МУЛЬТИКУЛЬТУРАЛИЗМЕ И ТОЛЕРАНТНОСТИ В АЗЕРБАЙДЖАНЕ

***Irada Boyukagha Amiraliyeva***
*doctor of philosophy in pedagogy*
*leading scientific worker at the*
*Institute of Education of the Republic of Azerbaijan*

# NATIONAL LEADER HEYDAR ALIYEV ON MULTICULTURALISM AND TOLERANCE IN AZERBAIJAN

**Xülasə**. Azərbaycan tarixən multikulturalizm diyarı kimi özünü təsdiq edib. Müəllim-tələbə, müəllim şagird münasibətlərinin düzgün qurulmasında və səmərəli olmasında, şəxsiyyətlərarası ixtilafların qarşısının alınmasında, aradan qaldırılmasında, yaxud həll edilməsində tolerantlıq özünəməxsus rol oynayır. Məqalədə Ümummilli Liderimiz Heydər Əliyevin Azərbaycanda multikulturalizm və tolerantlıqla bağlı fikirləri yada salınır, tələbələrin və şagirdlərin həmin fikirlərlə tanış edilmələri məqsədəuyğun hesab edilir.

***Açar sözlər**: multikulturalizm, tolerantlıq, Heydər Əliyevin ideyaları, multikulturalizmin bərqərar olması, tolerantlığın mövcudluğu, tolerantlığın tərbiyə olunması*

**Резюме.** Азербайджан исторически зарекомендовал себя как страна мультикультурализма. Толерантность играет особую роль в правильном установлении и эффективности отношений учитель-студент, учитель-ученик, предупреждении, устранении или разрешении межличностных конфликтов. В статье упоминаются идеи нашего общенационального лидера Гейдара Алиева о мультикультурализме и толерантности в Азербайджане, и считается целесообразным ознакомить учащихся и студентов с этими идеями.

***Ключевые слова**: мультикультурализм, толерантность, идеи Гейдара Алиева, становление мультикультурализма, существование толерантности, воспитание толерантности*

**Summary.** Azerbaijan has historically established itself as a country of multiculturalism. Tolerance plays a special role in the correct establishment and effectiveness of teacher-pupil, teacher-student relationships, prevention, elimination or resolution of interpersonal conflicts. The article mentions the ideas of our natıonwide leader Heydar Aliyev on multiculturalism and tolerance in Azerbaijan, and it is considered appropriate to acquaint schoolchildren and students with these ideas.

***Key words**: multiculturalism, tolerance, Heydar Aliyev's ideas, development of multiculturalism, existence of tolerance, upbringing of tolerance*

Bir sıra Avropa ölkələrində bir çox yüksək insani və humanist dəyərlər deqradasiyaya uğradığı bir vaxtda Azərbaycan dünyaya tolerant ölkə kimi dostluq, qardaşlıq və birgəyaşama

mesajı verir, tolerantlıq nümunəsi göstərir. Ümummilli Liderimiz Heydər Əliyevin və Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin məqsədyönlü siyasəti nəticəsində Azərbaycan dünyada multikultural ölkə kimi tanınır.

Tolerantlıq – latıncadan tərcümədə "*dözüm, dözmək, dözümlülük, tab gətirmək, səbirli, hövsələli, təmkinli olmaq, fikir verməmək, göz yummaq"* mənalarını verir. Fəqət "dözümlülük" və s. bu kimi sözlər real vəziyyət barədə düzgün təsəvvür yaratmır.

Tolerantlıq müxtəlif dillərdə, müxtəlif mənaları verir. Belə ki *ingilis dilində* – dözümlü, iltifatlı olmağa hazır olmaq; *fransız dilində* - başqa fikrə münasibət, *ispan dilində* - öz ideyalarından və yaxud rəylərindən daha yaxşı olanları etiraf etmək qabiliyyəti; *çin dilində* - başqalarına münasibətdə xeyirxah olmaq; *ərəb dilində* - bağışlama, yumşaqlıq, rəhmdillik, hövsələ; *rus dilində* - nəyə isə, yaxud kimə isə dözmək qabiliyyəti, dözümlü, səbirli, səbatlı olmaq, nəyin isə və yaxud kimin isə mövcudluğu ilə razılaşmağı bacarmaq qabiliyyəti deməkdir. Tolerantlıq irqçiliyi, ksenofobiyanı, dini dözümsüzlüyü, terror və ekstremizmi rədd edir.

Azərbaycanda bu ənənənin yaşaması və həyat şəraitinə çevrilməsi üçün sistemli iş aparılır. Azərbaycan Respublikası Prezidentinin 15 may 2014-cü il tarixli Fərmanı ilə Bakı Beynəlxalq Multikulturalizm Mərkəzi yaradılmışdır. Prezident İlham Əliyev 2016-cı ilin Azərbaycan Respublikasında "Multikulturalizm ili" elan edilməsi haqqında sərəncam imzalayıb. Multikulturalizm tolerantlığı təcəssüm etdirir. Ali məktəblər bu möhtəşəm işin formalaşmasında mühüm rol oynayır.

Tələbə-tələbə, müəllim-tələbə münasibətlərinin düzgün qurulmasında və səmərəli olmasında, şəxsiyyətlərarası ixtilafların qarşısının alınmasında, aradan qaldırılmasında, yaxud həll edilməsində tolerantlıq özünəməxsus rol oynayır. Tolerantlıq dözümlülük deməkdir. Fəqət dözümlü, təmkinli, hövsələli və səbirli olmaq, özünü saxlamağı bacarmaq heç də hər cür həqarətə, zorakılığa, fiziki təzyiqə qatlaşmaq, özünə qarşı belə alçaldıcı münasibətlə, davranış və rəftar tərzi ilə razılaşmaq demək deyildir. Bəzilərinin qənaətincə, tolerantlıq itaətdə olmaq deməkdir, əslində isə, tolerantlıq, dözümlük, mütilik, itaət deyil, mübarizə deməkdir. Pisliklərə, kobudluğa, ədalətsizliyə, prinsipsizliyə qarşı barışmazlıqdır, üsyandır.

Azərbaycan tarixən milli və dini cəhətdən daim tolerant ölkə, xalqımız tolerant xalq olub. Bu, inkaredilməz bir fakt, həqiqətdir. Bu, həmişə belə olmuşdur və bundan sonra da, təbii ki, belə olacaqdır. Azərbaycanda çoxsaylı azsaylı xalqlar və millətlər yaşayır. Lakin heç zaman onlara qarşı intolerantlıq hallarına rast gəlinməyib. Azərbaycan Respublikası çoxmillətli dövlət olduğu üçün burada müsəlmanlarla bərabər, digər dinlərə mənsub olan vətəndaşlar da yaşayırlar.

Şirvanşahlar dövlətindən, Səfəvi imperiyasından etibarən Azərbaycan Respublikasınadək ölkəmizdə mövcud olan bütün dövlətlərdə tolerant və multikultural dəyərlər, tolerantlıq, başqa dinlərə və millətlərə xas dəyərlərə yüksək hörmət və ehtiram göstərilib. Başqa xalqlar bir yumruq şəklində xalqımızın ətrafında birləşiblər, Azərbaycanın taleyini öz taleyi biliblər, Vətən darda olanda onun müdafiəsinə qalxıblar.

Ordumuzun kapitanı, əslən dağ yəhudisi olan Albert Aqarunoviç Aqarunovu xatırlamaq kifayətdir. O, könüllü şəkildə I Qarabağ müharibəsi zamanı cəbhəyə yollanmış, tank briqadasında Cəbrayıl, Ağdam, Laçın və Füzulidə vuruşmuş, daha sonra tank komandiri olaraq Şuşaya yola düşmüş, rəşadətlə döyüşmüş, qəhrəmancasına həlak olmuşdur. Ölümündən sonra ona Azərbaycanın Milli Qəhrəmanı adı verilmişdir. Ölkəmizdə Albert Aqarunoviç Aqarunovun xatirəsi uca tutulur, adına küçə vardır, heykəli ucaldılmışdır.

Azərbaycan Respublikasının Konstitusiyasının 25-ci maddəsi "Bərabərlik hüququ" adlanır. Həmin maddədə deyilir: "Dövlət, irqindən, *etnik mənsubiyyətindən*, dinindən, dilindən, cinsindən, mənşəyindən, əmlak vəziyyətindən, qulluq mövqeyindən, əqidəsindən, siyasi partiyalara, həmkarlar ittifaqlarına və digər ictimai birliklərə mənsubiyyətindən asılı olmayaraq, hər kəsin hüquq və azadlıqlarının bərabərliyinə təminat verir. İnsan və vətəndaş hüquqlarını və azadlıqlarını irqi, *etnik*, dini, dil, cinsi, mənşəyi, əqidə, siyasi və sosial mənsubiyyətə görə məhdudlaşdırmaq qadağandır" (1).

Azərbaycan tarixən multikulturalizm diyarı kimi özünü təsdiq edib.

Tolerantlıq digər şəxslərin fərqli düşüncə, davranış və rəftarlarını başa düşmək və onlara

hörmət bəsləmək qabiliyyətidir. Çox zaman tolerantlığı bu və ya digər şəxsə müsbət yanaşma kimi də nəzərdən keçirirlər. Bu, o deməkdir ki, insanlar bir-birlərini həqiqətdə olduğu kimi (necə varsa) qəbul etməlidirlər.

Ölkəmizin Böyük İpək Yolunun üzərində olması, Avropa ilə Asiya arasında körpü vəzifəsini yerinə yetirməsi Azərbaycanımızda fərqli mədəniyyətlərin, sivilizasiyaların və dinlərin yaranmasına imkan vermişdir.

XX əsrin ikinci yarısında, XXI əsrin birinci yarısında Azərbaycanda multikulturalizmin və tolerantlığın geniş şəkildə bərqərar olmasında Ulu öndər Heydər Əliyevin böyük xidmətləri vardır.

Ümummilli Liderimiz azərbaycançılıq ideologiyasını irəli sürməklə ölkəmizdə multikulturalizm və tolerantlığın inkişafını təmin etmişdir. Ulu öndərin müəllifi olduğu azərbaycançılıq ideologiyası respublikamızda multikulturalizmin və tolerantlığın bütün problemlərini aradan qaldırmışdır.

Tolerant şüurun, tolerant düşüncənin və tolerant təfəkkürün formalaşdırılması, fərqli dinlərə, digər xalqlara, millətlərə dözümlülüyün və sülhsevərliyin tərbiyə edilməsi Azərbaycan təhsilində prioritet vəzifədir.

İnsanlar zahirən fərqli olduqları kimi daxilən də duyğuda, düşüncədə, inancda, demək olar ki, hər sahədə bir-birindən fərqlənirlər. Bu fərqləri aradan qaldırıb, bir insan tipi formalaşdırmaq mümkün deyildir. Bunun əvəzində müxtəliflikləri nəzərə alıb, onları münaqişəyə cəlb etmədən, bir yerdə yaşamaq yollarını araşdırmaq lazımdır. Daha açıq deyilsə, iki yol var: ya bir-birimizlə münaqişəli vəziyyətlərdə olmalı, dava, müharibə etməliyik, ya da bir-birimizi başa düşməli, bir-birimizi qəbul etməliyik, uyğunlaşmalıyıq. Tolerantlıq bu uyğunlaşma yolunu seçmək bacarığıdır.

Ümummilli Liderimiz Dünya azərbaycanlılarının 2001-ci il noyabrın 9-da keçirilən I qurultayında azərbaycançılığın mahiyyətinə aşağıdakı kimi aydınlıq gətirmişdir: “Müstəqil Azərbaycan dövlətinin əsas ideyası azərbaycançılıqdır. Hər bir azərbaycanlı öz milli mənsubiyyətinə görə qürur hissi keçirməlidir və biz azərbaycançılığı – Azərbaycanın dilini, mədəniyyətini, milli-mənəvi dəyərlərini, adət-ənənələrini yaşatmalıyıq”.

Heydər Əliyevin dövlət-din münasibətləri istiqamətində çox böyük xidmətlərindən biri 21 iyun 2001-ci ildə Dini Qurumlarla İş üzrə Dövlət Komitəsini yaradılması ilə bağlı sərəncam imzalaması idi. Komitə formalaşdırıldıqdan sonra həmin sahədə öz işlərini qurmağa, öz fəaliyyətini Ümummilli liderin azərbaycançılıq ideologiyasına uyğun həyata keçirməyə başladı.

Ulu Öndər Heydər Əliyev multikulturalizm siyasətini ölkəmizin demokratik inkişafının mühüm tərkib hissəsi sayırdı. Ümummilli Lider Azərbaycan ərazisində yaşayan milli azlıqların hüquq və azadlıqlarının, etnik-mədəni dəyərlərinin qorunmasını demokratiyanın başlıca prinsipi olan insanların hüquq və azadlıqlarının qorunmasından irəli gəldiyini diqqət mərkəzinə gətirirdi.

Ümummilli Liderimiz çox gözəl bilirdi ki, ölkəmizdə yaşayan xalqlar arasında fərqin qoyulmaması, onlara diqqət və qayğı göstərilməsi, tamhüquqlu vətəndaşlar kimi onlara yanaşılması Vətənimizi qüdrətli edir, onları bir bayraq ətrafında birləşdirir.

“İslam sivilizasiyası Qafqazda” mövzusunda beynəlxalq simpoziumda Ulu öndər Heydər Əliyev demişdir: "Dünyada bir çox böyük dinlər mövcuddur. Hər dinin özünəməxsus yeri var. Biz azərbaycanlılar islam dini ilə fəxr edərək, eyni zamanda heç vaxt başqa dinlərə qarşı mənfi münasibət göstərməmişik, düşmənçilik etməmişik, ədavət aparmamışıq və heç bir başqa xalqı da öz dinimizə itaət etməyə məcbur etməmişik. Ümumiyyətlə, başqa dinlərə dözümlülük, başqa dinlərlə yanaşı və qarşılıqlı anlaşma şəraitində yaşamaq islam dəyərlərinin xüsusiyyətidir. Bu, tarix boyu Azərbaycanda da, Qafqazda da öz əksini tapıbdır. Azərbaycanda islam dini ilə yanaşı xristian dini də, yəhudi dini də əsrlər boyu yaşayıb və indi də yaşayır. Qafqazda da bu mənzərə var. Hesab edirik ki, insanlar hansı dinə, hansı mədəniyyətə mənsubluğundan asılı olmayaraq, bütün başqa mədəniyyətlərə, dinlərə, mənəvi dəyərlərə də hörmət etməli, o dinlərin bəzən kiməsə xoş gəlməyən adət-ənənələrinə dözümlü olmalıdırlar".

Azərbaycanda multikulturalizm və tolerantlığa dövlət səviyyəsində xüsusi diqqət yetirildiyi, bu məsələ dövlət siyasəti olduğu üçün müxtəlif xalqlar respublikamızda xoşbəxt həyat sürürlər. Buna görə də Azərbaycanda heç zaman milli, irqi və dini zəmində ayrı-seçkilik, milli-et-

nik müstəvidə qarşıdurma olmamışdır. Azərbaycan vətəndaşlarının çoxmilli tərkibi bizim sərvətimiz hesab edilir.

Respublikamızda multikulturalizm və tolerant mühit xalqımızın daxilindən, qonaqpərvərliyindən və humanistliyindən nəşət edir. Bu isə xalqımızın meydana gətirdiyi, qoruyub saxladığı və gələcək nəsillərə ərmağan etdiyi müqəddəs sərvətlərindəndir.

Ümummilli Lider Heydər Əliyev özünün məruzə və çıxışlarında, nitqlərində Azərbaycanın çoxmillətli ölkə olduğunu, etnik rəngarəngliyini və tolerantlığa yüksək dəyər verdiyini xalqımızın böyük sərvəti sayırdı. Bu xüsusda deyirdi: "Azərbaycan əhalisinin çoxmilli tərkibi bizim sərvətimizdir, üstünlüyümüzdür... Dövlət, ölkə nə qədər çox xalqı birləşdirsə, bir o qədər zəngin olur, çünki onların hər biri ümumdünya mədəniyyətinə və sivilizasiyasına öz töhfəsini verir. Azərbaycan onun ərazisində yaşayan bütün millət və xalqların ümumi vətənidir. Azərbaycanlı sözü bizi həmişə birləşdirib".

Tələbələrə izah edilməlidir ki, yaranmış vəziyyətdə bəşər sivilizasiyasının müxtəlif mədəniyyətlərinin qorunması məqsədilə dinlər və mədəniyyətlər arasında dialoqun baş tutması mühüm əhəmiyyətə malikdir. Bu mənada tolerantlıq və dözümlülük ənənələrinin mövcud olduğu ölkələrin təcrübəsi önəmlidir. Deyilənlərə əsasən, belə bir fikir yürüdə bilərik ki, respublikamız millətlərin və dini konfessiyaların dinc yanaşı yaşamasının gözəl nümunəsidir. Tolerantlıq vətəndaş hüquq və azadlıqlarının təsdiqinə, plüralizm və demokratiyaya əsasən reallaşır. Eyni zamanda tələbələr öyrənirlər ki, tolerantlıq ideyalarının meydana gəlməsinin əsasında 1948-ci il İnsan Hüquqlarına dair Ümumi Bəyannamənin qəbul edilməsi dayanır. Həmin bəyannamədə qeyd edilir ki, "İnsan ailəsinin bütün üzvlərinə məxsus ləyaqətin etiraf olunması və onların bərabər, ayrılmaz hüquqları azadlıq, ədalət və ümumi dünyanın əsasını təşkil edir", "İnsan hüquqlarına qarşı etinasızlıq və nifrət insanın vicdanını hiddətləndirən vəhşi aktlara gətirib çıxarır". Tolerantlıq insan hüquqları və vicdanla əlaqədar olan bir məsələdir, vətəndaşların azadlıqlarının və hüquqlarının təsdiqi, plüralizm və demokratiya əsas götürülməklə təşəkkül tapır. Tolerantlıq – sülhsevərlik, mehriban əməkdaşlıq şəraitində birgəyaşayış, etnik, dini, siyasi, konfessional, şəxsiyyətlərarası fikir, dözümlülük, başqa şəxsin eyni hüquqda mövcudluğunun mümkünlüyünə alışmaqdır.

Tolerantlıq insan xeyirxahlığı; müxtəlif insanlar və ideyalar dünyasında yaşamaq, hüquq və azadlıqlara malik olmaq sənətidir. Bu zaman digər şəxslərin hüquq və azadlıqları pozulmamalıdır. Tolerantlıq eyni zamanda sadəcə güzəşt, oxşarlıq və təkrar deyil, digərinin etiraf olunması əsasında fəal həyat mövqeyidir.

Tolerantlıq – insan şəxsiyyətinin sosial kamilliyinin təzahürüdür. V.A. Suxomlinski insanlarda özünü göstərən zəifliklərə və onların bacarıqlarına dözümlü münasibətin tərbiyə olunmasına diqqət yetirmişdir. O, dözümlülüyü şagird şəxsiyyətinin mənəvi tərbiyəliliyini ifadə edən və «insan ehtiraslarının və xarakterlərinin mürəkkəb dünyasına» yönəlməyə imkan verən mənəvi mədəniyyətinin ən mühüm elementi hesab edirdi. Müəllimlərin vəzifəsi tələbələrdə hər bir şəxsin, xalqın şərəf və ləyaqətinə hörmət etmək, gənclərdə belə inam və əqidə formalaşdırmaqdır ki, bütün xalqlardan, bütün millətlərdən daha yaxşı və üstün xalq və millət, yaxud bütün xalqlardan, bütün millətlərdən daha pis xalq və millət yoxdur. Başlıca olan insandır, onun hansı millətə məxsus olması yox. Tələbə bilməlidir ki, insanın ləyaqətinin və şərəfinin necə olması onun özünə məxsusdur, onun hansı millətə məxsus olmasına aid deyil. İnsanlarda qüsur yox, yaxşı cəhətləri axtarıb tapmaq lazımdır. Onun ləyaqətlərinə, ünsiyyətinə və fəaliyyətinə əsaslanmaq məqsədəuyğundur. Nəzərə almaq lazımdır ki, bütün təlim-tərbiyə sistemi, bütün pedaqoji vasitələr bu və ya digər dərəcədə tələbələrdə tolerantlığın formalaşdırılmasına təsir göstərir.

Təhsilalanlarda, o cümlədən tələbələrdə tolerant mövqeyin səmərəli şəkildə formalaşdırılması üçün ali məktəblərdə məqsədyönlü, sistemli və fasiləsiz işlər aparılmalı, bu məqsədlə təlim prosesinin, auditoriyadankənar tədbirlərin imkanlarından istifadə edilməlidir. Bu istiqamətdə professor-müəllim heyətinin səyləri birləşdirilməli və onlar aydın surətdə dərk etməlidirlər ki, tələbə oğlan və qızlarda tolerantlığın formalaşdırılması üçün hər bir tərbiyəedənin özü də tolerant şəxs olmalıdır.

Tələbə gəncləri tolerant şəxslər kimi yetişdirmək üçün ilk növbədə bu sahədə onları maa-

rifləndirmək, onlarda tolerant şüur və düşüncəni formalaşdırmaq lazımdır ki, tolerant davranış təcrübəsi yaradıla bilsin.

**Problemin aktuallığı**. Məqalə Ümummilli Lider Heydər Əliyevin 100 illiyinə həsr edilmişdir.

**Problemin yeniliyi**. Məqalədə Ümummilli Liderimiz Heydər Əliyevin Azərbaycanda multikulturalizm və tolerantlıqla bağlı fikirləri yada salınır, tələbələrin və şagirdlərin həmin fikirlərlə tanış edilmələri məqsədəuyğun hesab edilir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat**:


1. Azərbaycan Respublikasının Konstitusiyası. -Bakı: Qanun, -2009.
2. Heydər Əliyev. Müstəqilliyimiz əbədidir: çıxışlar, nitqlər, bəyanatlar, məktublar, müsahibələr. Birinci kitab: iyun, 1993 – may, 1994 / bur. məsul R. Mehdiyev. – Bakı: Azərnəşr, -1997. – 612 s.
3. Abbasov A.N. Ailə münasibətlərində tolerantlıq // Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, -2019, № 6, -s. 14-17
4. Əliyev P.B. Tolerantlıq prinsipinin təlim-tərbiyə işində nəzərə alınması haqqında // Azərbaycan məktəbi, -2007, № 2, -s. 17-23
5. Əliyev P.B. Tolerantlıq tərbiyəsinin sistemi // Azərbaycan Beynəlxalq Universitetinin xəbərləri. Pedaqoji və psixoloji elmlər seriyası. -2009, № 3, -s. 28-37


**E-mail:** amiraliyeva_i@mail.ru

**Rəyçilər***: ped.elm.dok., prof.* **A.N. Abbasov,**
*biol.ü.fəls.dok.* **Q.M. Əliyev**

*UOT 37.0*

***Rahilə Mirzəli qızı Məmmədova***
*filologiya üzrə fəlsəfə doktoru,*
*Mingəçevir Dövlət Universitetinin baş müəllimi*

## HEYDƏR ƏLİYEV NƏZƏRİ İRSINDƏ MÜƏLLİMLİK

***Рахила Мирзали гызы Мамедова***
*доктор философии по филологии,*
*старший преподаватель Мингячевирского Государственного Университета*

## УЧИТЕЛЬСТВО В НАСЛЕДИИ ГЕЙДАРА АЛИЕВА

***Rahila Mirzali Mammadova***
*doctor of philosophy in philology,*
*head teacher of Mingachevir State University*

## TEACHING IN HEYDAR ALIYEV'S HERITAGE

**Xülasə.** Heydər Əliyev Azərbaycan müəllimlərinin böyük dostu, təhsilin, maarifin, ölkənin intellektual potensialının gücləndirilməsinin, yüksək ixtisaslı milli kadrların yetişdirilməsinin böyük təəssübkeşi və himayəçisi idi.

Məhz Heydər Əliyevin uzaqgörən siyasəti sayəsində o zaman yetişdirilən həmin mütəxəssislər bu gün müstəqil Azərbaycanın müxtəlif sahələrində çalışır, milli ordunun qurulmasında, xarici ölkələrdə qurulan və qurulmaqda olan Azərbaycan diasporunun formalaşmasında güclü potensial kimi iştirak edirlər. Həmin mütəxəssislər haqlı olaraq milli tariximizdə "Heydər Əliyevin kadrları" adlandırılır. Eyni zamanda, onlar Azərbaycanın milli sərvəti, böyük öndər, Heydər Əliyev isə bu sərvətin yaradıcısı sayılır...

Məqalədə dahi rəhbərin təhsilin qarşısında duran vəzifələrlə bağlı qiymətli tövsiyə və tapşırıqları da bütün zamanlar üçün dəyərini saxlayan əsl fəaliyyət proqramından bəhs edilir.

***Açar sözlər:*** *böyük öndər, müəllim, mütəxəssis, milli sərvətimiz, Azərbaycan xalqı*

**Резюме.** Гейдар Алиев был большим другом азербайджанских учителей, покровителем просвещения, образования, укрепления интеллектуального потенциала страны, подготовки высококвалифицированных национальных кадров.

Благодаря дальновидной политике Гейдара Алиева, подготовленные в то время специалисты сегодня работают в различных сферах независимого Азербайджана, участвуя в качестве сильного потенциала в формировании национальной армии и развитии азербайджанской диаспоры, которая была создана и существует в зарубежных странах. Этих специалистов в нашей национальной истории по праву называют «кадрами Гейдара Алиева». В то же время они являются национальным достоянием Азербайджана, великого лидера, и Гейдар Алиев считается создателем этого богатства.

В статье обсуждаются ценные рекомендации и наставления гениального руководителя относительно задач, стоящих перед образованием, а также реальная программа действий, сохраняющая свою ценность на все времена.

***Ключевые слова:*** *великий лидер, учитель, специалист, национальное богатство, азербайджанский народ*

**Summary.** Heydar Aliyev was a great friend of Azerbaijani teachers, a big fanatic and patron of education, education, strengthening of the country's intellectual potential, training of highly qualified national personnel.

Thanks to the visionary policy of Heydar Aliyev, those specialists trained at that time are working in various fields of independent Azerbaijan today, participating as a strong potential in the formation of the

national army and the formation of the Azerbaijani diaspora, which was established and is being established in foreign countries. Those specialists are rightly called "Heydar Aliyev's personnel" in our national history. At the same time, they are the national wealth of Azerbaijan, a great leader, and Heydar Aliyev is considered the creator of this wealth...

In the article, the valuable recommendations and tasks of the genius leader regarding the tasks facing the education are discussed, as well as the real action program that retains its value for all time.

***Key words:*** *great leader, teacher, specialist, our national wealth, Azerbaijani people*

Heydər Əliyev şəxsiyyətini, Heydər Əliyev fenomenini öz dəyərincə bütün incəliklərinə qədər qiymətləndirmək mümkün deyil. Çünki ulu öndərimiz kimi dahilər min ildə bir doğulur və xalqının taleyində, tarixində silinməz izlər qoyur, məmləkətin, ölkənin ən çətin, ağır dövründə xilaskar rolunu oynayır...

Bu dahi insanın fəaliyyətinə, keçdiyi ömür yoluna nəzər salanda aydın görürük ki, Heydər Əliyev bir çox siyasi xadimin edə bilmədiyini gerçəkləşdirmiş, müasir dünyanın ən aktual çağırışlarına cavab vermək bacarığı ilə XX və XXI əsrlərin tanınmış siyasi xadimləri arasında həmişəlik öz layiqli yerini tutmuşdur. Xalqımızın yetirdiyi nadir dövlət xadimlərindən olan Heydər Əliyev yaşadığı bütün həyatı boyu hər zaman xalqını, vətənini düşünmüşdür. Onun ürəyi Azərbaycanın müstəqilliyinin möhkəmləndirilməsi, doğma xalqının xoşbəxtliyi üçün çırpınmışdır. Ulu Öndər bir dövlət başçısı kimi Azərbaycanın ən çətin, üzücü anlarında onu xilas etmək üçün misilsiz fədakarlıqlar göstərmiş, ölkəsini bəlalardan qurtarmağı bacarmışdır.

Ümummilli Lider Heydər Əliyev doğma Azərbaycana rəhbərlik etdiyi dövrlərdə Azərbaycan dövlətçiliyinin, Azərbaycan xalqının taleyində elə möhtəşəm rol oynamış, elə titanik fəaliyyət göstərmiş, doğma xalqının qəlbində özünə elə əbədi heykəl ucaltmışdır ki, bunlar xalqın qan yaddaşında əsrlər boyu yaşayacaqdır...

Ulu Öndər Heydər Əliyev Azərbaycan xalqının milli tarixinə öz əbədi imzasını qoymuş, bununla öz adını əbədiləşdirmiş, sağlığında əfsanələşmiş tarixi şəxsiyyət, böyük hərflərlə yazılan İNSAN idi... [1] Uca Tanrı bu böyük şəxsiyyətə heç nəyini əsirgəməmişdir: xalqına, vətəninə, doğma Azərbaycanına sonsuz məhəbbətini də gərəyincə və yetərincə vermişdi. Böyük Yaradan ona Azərbaycan boyda sevgisini sinəsində gəzdirən böyük ürək, sevən könül, qaynar qəlb bəxş etmişdir...

Hər zaman doğma Azərbaycan xalqı üçün vuran bu ürək aramsız millət və Vətən yolunda döyündü və bu yolda da sözün həqiqi və geniş mənasında şəhid oldu, əbədiyyətə, ölməzliyə qovuşdu. Təskinliyimiz ondadır ki, bu böyük İNSANın adı və əməlləri kimi ölümü də doğma Vətənimizi, sevimli Azərbaycanımızı bir boy da ucaltdı... Bu yerdə böyük milli şairimiz Səməd Vurğunun məşhur misraları yada düşür:

Ölüm sevinməsin qoy! Ömrünü vermir bada,
El qədrini canından daha əziz bilənlər.
Şirin bir xatirə tək qalacaqdır dünyada,
Sevərək yaşayanlar, sevilərək ölənlər...

Bəli, Ulu Öndər Heydər Əliyev Azərbaycanın, Azərbaycan xalqının vurğunu idi. O, hakimiyyətdə olduğu tarixi müddətdə millətin gələcəyi, dövlətin təməl prinsiplərindən olan təhsilin, maarifin, elm və mədəniyyətin hərtərəfli inkişafına hər zaman qayğı ilə yanaşmış, xalqımızın maariflənmə, təhsillənmə səviyyəsinin yüksəldilməsi yolunda əlindən gələni əsirgəməmiş, təhsil tariximizə maarifpərvər Ümummilli Lider kimi daxil olmuşdur. Heydər Əliyev bizlərə mükəmməl təhsil sistemini miras qoyub getdi. [2]

Heydər Əliyev Azərbaycan müəllimlərinin böyük dostu, təhsilin, maarifin, ölkənin intellektual potensialının gücləndirilməsinin, yüksək ixtisaslı milli kadrların yetişdirilməsinin böyük təəssübkeşi və himayəçisi idi. Təkcə Azərbaycana birinci rəhbərliyi dövründə keçmiş SSRİ-nin tanınmış ali təhsil ocaqlarında “Azərbaycandan kənarda Azərbaycan üçün” milli ideyası altında 15 mindən artıq yüksək ixtisaslı milli mütəxəssisin yetişdirilməsi Ümummilli Lider Heydər Əliyevin şəxsi təşəbbüsü və böyük səyi nəticəsində mümkün olmuşdu. Məhz Heydər Əliyevin uzaqgörən siyasəti sayəsində o zaman yetişdirilən həmin mütəxəssislər bu gün müstəqil Azərbaycanın müxtəlif sahələrində çalışır, milli ordunun qurulmasında, xarici ölkələrdə qurulan və qurulmaqda olan Azərbaycan diasporunun formalaşmasında güclü potensial kimi iştirak edirlər. Həmin mütəxəssislər haqlı

olaraq milli tariximizdə "Heydər Əliyevin kadrları" adlandırılır. Eyni zamanda, onlar Azərbaycanın milli sərvəti, böyük öndər, Heydər Əliyev isə bu sərvətin yaradıcısı sayılır...

Böyük maarifçi Heydər Əliyevin təhsil sahəsində məktəbə və müəllimə qayğısı hər zaman aparıcı istiqamət olub. İstər Sovetlər Birliyi dönəmində, istərsə də müstəqillik illərində minlərlə müəllimin ən yüksək fəxri adlara, orden və medallara layiq görülməsi, mindən artıq ümumtəhsil məktəbi üçün ən müasir tədris binalarının tikilməsi, yüzlərlə texniki peşə, ali və orta ixtisas təhsili müəssisələri üçün tədris komplekslərinin inşası, onlarla yeni ali məktəb ocaqlarının yaradılması da məhz ulu öndərin sayəsində olmuşdur.

Ümummilli Lider Heydər Əliyev müəllimləri, ziyalıları sevirdi, onları hər zaman uca tuturdu, yüksək qiymətləndirirdi. Müəllimlərlə, təhsil işçiləri ilə mütəmadi görüşləri, müəllim qurultaylarındakı alovlu çıxışları hamımızın yaddaşında əbədi iz qoydu. Onun qurultaydakı çıxışı müstəqil Azərbaycan təhsilinə yeni istiqamət verdi, təhsilə, təhsil işçilərinə, müəllimə, ziyalıya yeni müasir baxışla qiymət vermək nümunəsini ortaya qoydu. Təhsilə, təhsil işçilərinə olan bu qayğıkeş münasibətə cavab olaraq müəllimlər, qurultay nümayəndələri böyük maarifçi Heydər Əliyevə Azərbaycanın Fəxri Xalq Müəllimi adını vermək məsələsini qaldırdılar. Nümayəndələrin təklifi ilə qurultayda Azərbaycan tarixində yeni bir fəxri ad – "Azərbaycan Respublikasının Xalq Müəllimi" adı təsis edildi. Bütün qurultay nümayəndələrinin alqışları altında bu ilk fəxri ada Heydər Əliyev layiq görülür. Bəli, Heydər Əliyev Azərbaycanın ilk Xalq Müəllimi idi. O, müəllimlər müəllimi idi. O, böyük ziyalı idi. Xalqının, millətinin yoluna nur saçan, onu işıqlı gələcəyə aparan həqiqi vətəndaş, vətənpərvər ziyalı idi. Vətən və millət sevgisi, vətəndaşlıq duyğusu onun ziyalı qəlbinin sönməz məşəli idi. O, yaxşıların yaxşısı idi. Həyatının mənasını xalqına, dövlətinə təmənnasız xidmətdə görən aydın zəkalı, nurlu şəxsiyyət idi...[3]

Bütün tarixi dövrlərdə görkəmli şəxsiyyətlər, dövlət adamları müəllimlik peşəsinə yüksək qiymət vermiş və müəllimliyi cəmiyyətin ən şərəfli peşəsi hesab etmişlər. Müqəddəs dinimizin banisi Məhəmməd Peyğəmbər özünü müəllim adlandırmış, "Xəmsə" müəllifi Şeyx Nizami Gəncəvi müəllimi günəşə, "Məsnəvi" müəllifi Mövlana Cəlaləddin Rumi yanar şama, "Divan" müəllifi dahi Füzuli gənc qəlbin memarına bənzətmiş, Nəsirəddin Tusi müəllimi elmin çırağı adlandırmış, Məhəmməd Tağı Sidqi isə dadlı meyvələr yetişdirən bağbana bənzətmişdir. Hüseyn Cavid isə müəllimlik peşəsinə nəzərən demişdir:

Bəxtiyarsan, əgər çəkdiyin əmək  
Cahan süfrəsinə versə bir çiçək.

Bu müdrik fikirlər sırasında XX əsrin dahi şəxsiyyəti, böyük dövlət xadimi Heydər Əliyevin müəllimlik peşəsi haqqında dediyi sözlər öz xüsusi dəyəri, əhəmiyyəti və peşəyə verdiyi yüksək qiyməti ilə seçilir: "Mən yer üzündə müəllim adından yüksək bir ad tanımıram!". Bu qiymətli sözlər Ulu Öndərimizin müəllimlik peşəsinə sıx bağlı olmasından, bu peşəyə yaxından bələd olmasından, ilk peşə ixtisasının müəllimlik olmasından və ilk vəzifə təyinatının da müəllimlik olmasından irəli gəlməkdədir.

O bu barədə Azərbaycan Müəllimlərinin I qurultayındakı nitqində belə demişdir: "Doğrudur, siz məni də müəllim hesab edirsiniz. Burada müəyyən əsas var. Siz mənim təhsilimə əsaslanaraq bunu deyirsiniz… mən 1939-cu ildə Naxçıvanda Pedaqoji Texnikumu bitirmişəm. Naxçıvan Pedaqoji Texnikumu məhz həmin dövrdə müəllim çatışmazlığı, ibtidai siniflərə, hətta orta məktəblərin 7-8-ci siniflərinə qədər dərs demək üçün müəllim olmadığına görə müəllim kadrları hazırlayırdı. Mən isə orta məktəbin 8-ci sinfini bitirdikdən sonra pedaqoji texnikuma daxil oldum. Məqsədim də o idi ki, müəllim olmaq, müəllim işləmək və ailəmə kömək etmək istəyirdim. … Pedaqoji texnikumun sonuncu kursunda bizə pedaqoji təcrübə dərsi verirdilər. Biz həftədə 2-3 dəfə gedib məktəblərin 2-ci, 3-cü, 4-cü siniflərində dərs deyirdik. Ona görə də mənim o vaxtdan dərs vermək təcrübəm olubdur…".

Ümummilli Liderimiz Heydər Əliyevin məktəblə, maariflə həmişə sıx bağlı olması haqda özü belə deyirdi: "Məktəb, maarif, təhsil işi ilə həmişə sıx bağlı olmuşam… Hesab edirəm ki, cəmiyyət harada olursa olsun, öz qazancından kəsib təhsilə xərcləməli, gənc nəslin savadına, biliyinə, müəllimə kömək etməlidir…"

O, müəllimlik peşəsini ürəkdən sevmiş, müəllim əməyinə yüksək qiymət vermiş və heç də təsadüfi deyil ki, Heydər Əliyev Azərbaycanda ona təklif olunan müxtəlif fəxri adlardan yalnız "Xalq müəllimi" fəxri adını məmnuniyyətlə qəbul etmişdir.

Ümummilli Liderimiz Heydər Əliyev bir pedaqoq məharəti ilə müəllimlərə təkcə öyrənmək və öyrədə bilmək bacarığını deyil, həmçinin məktəbliləri, tələbə gəncləri Vətənə sədaqətlə xidmət etmək ruhunda böyütməyi, xalqımızın milli xüsusiyyətləri əsasında tərbiyə etməyi, onları milli-mənəvi dəyərlər əsasında yetişdirməyi tövsiyə edirdi. Ulu öndərimizin 1 sentyabr 1997-si ildə Bakının 18 №-li məktəbində keçirilən görüşdəki nitqi bu baxımdan təqdirəlayiqdir: "Uşaqlar gərək orta məktəblərdə bütün fənləri mənimsəsinlər. Bunların hamısı ilə bərabər, bizim xalqımızın zəngin tarixini, mədəniyyətini, mənəviyyatını, mənəvi dəyərlərini uşaqlara öyrətmək, çatdırmaq, uşaqları məhz həmin ənənələr ruhunda tərbiyə etmək müəllimlərin müqəddəs borcudur. Mən arzu edərdim ki, müəllimlər bunu heç vaxt unutmasınlar…"

Ulu Öndərimiz Heydər Əliyev özlərini vətən torpağının bir zərrəsi sayan gənclərin tərbiyə edilib yetişdirilməsində müəllim əməyinə, onun şəxsiyyətinə yüksək qiymət vermişdir. Heydər Əliyev deyirdi ki, müəllim adı şərəfli, yüksək addır. Müəllim vəzifəsi ona görə şərəflidir ki, o, cəmiyyət üçün ən dəyərli, bilikli, zəkalı, tərbiyəli, vətənpərvər vətəndaş hazırlayır. Müəllim dünyada yeganə şəxsiyyətdir ki, cəmiyyət öz gələcəyini – uşaqlarının tərbiyəsini yalnız ona etibar edir. Ulu öndər deyirdi ki, ölkədə təhsilin hərtərəfli yüksəlişində, təlim-tərbiyə prosesində qarşıda duran mühüm, çoxşaxəli vəzifələrin uğurla həyata keçirilməsində təkcə məktəbin, orada çalışan pedaqoji heyətin əməyi kifayət deyil. Yeniyetmə və gənclərin gələcəyin savadlı mütəxəssisi, layiqli vətəndaşı kimi formalaşması üçün bütün cəmiyyət maraqlı olmalıdır, xüsusən də məktəblə ailənin birgə fəaliyyəti təmin edilməlidir. Ümummilli Liderimiz həmin məsələyə də diqqət yetirərək demişdir: "Məktəblə ailənin sıx, qarşılıqlı əlaqəsi olmadan mükəmməl tərbiyə ola bilməz, çünki bu proses kompleks bir prosesdir və onun səmərəliliyini valideynlərlə pedaqoqların birgə səyi ilə yüksəltmək lazımdır" [1]. Bir sözlə, görkəmli şəxsiyyət Heydər Əliyevin milli təhsil və tərbiyə məsələlərinə dair nəzəri konsepsiyası son dərəcə qiymətli olub, çağdaş dövründə də, gələcək yüz illərdə də öz dəyərini, əhəmiyyətini saxlamaq gücünə malikdir. Bu konsepsiya hər bir təhsilalanın, hər bir pedaqoqun, ümumən, hər bir Azərbaycan vətəndaşının fəaliyyət devizi, həyat amalıdır. Təhsil və tərbiyə prosesində müəllimin peşə hazırlığı, savadı, mənəviyyatı mühüm əhəmiyyət daşıyır**.** "Özünü müəllimliyə həsr etmiş insan ən şərəfli insandır", – deyən dahi rəhbərimizin müdrik tövsiyəsi belədir ki, əsl pedaqoq olmaq, şagird və tələbələrə mükəmməl, hərtərəfli bilik vermək, onları nəcib mənəvi amallara sədaqət ruhunda yetişdirmək üçün məktəblərdə müvafiq şərait, lazımi mühit yaradılmalı, müəllimin özü bu yüksək keyfiyyətləri dərindən mənimsəməli, yetirmələrinə nümunə olmalıdır.

Ümummilli Lider Heydər Əliyev hələ Naxçıvanda orta məktəbdə oxuduğu illərdə, daha sonrakı təhsil illərində də yalnız "əla" qiymətlərlə oxumuş, həmişə də öz müəllimlərinə böyük hörmət və ehtiramla yanaşmış, onları daim minnətdarlıqla xatırlamışdır.

Ulu Öndər Heydər Əliyev Naxçıvanda rus məktəbini "əla" qiymətlərlə başa vurduqdan sonra Naxçıvan Pedaqoji Texnikumuna daxil olmuş və burada təhsil aldığı dövrdə ən fəal və əlaçı tələbə olmuş, ictimai işlərdə fəal iştirak etmiş, idman yarışlarında birincilik qazanmış, incəsənətlə – rəssamlıqla, aktyorluqla məşğul olmuş, daim mütaliə etmiş, kitablar oxumuş və hərtərəfli inkişaf etmiş qamətli, yaraşıqlı bir gənc olmuşdur. Texnikumun peşəkar, tələbkar müəllimləri Heydər Əliyevin ən sevimli müəllimləri olmuşlar.

Yeri gəlmişkən qeyd edək ki, Naxçıvan Pedaqoji Texnikumu öz məzunları və müəllimləri ilə məktəb və pedaqoji fikir tariximizdə çox layiqli yer tutmuş və pedaqoji kadr hazırlığında daim yüksək pillədə durmuşdur. Oranın məzunlarını Qori Müəllimlər Seminariyasının məzunları ilə müqayisə etmək olar. Burada dərs deyən müəllimlər təcrübəli, bilikli, peşəkar müəllimlər olmuşlar, hər cür çətinliklərə rəğmən həvəslə, fədakarlıqla çalışmışlar. Onların bir çoxu Qori Müəllimlər Seminariyasını, İrəvan Müəllimlər Seminariyasını bitirmiş, Moskva və Leninqrad universitetlərində təhsil almış həvəslə çalışan, peşəkar müəllimlər idilər.

"Naxçıvanda "Rüşdiyyə" adlı "Yeni üsul" məktəbində, Hüseyn Caviddən türk dili, onun böyük qardaşı Şeyx Məhəmməd Rasizadədən ərəb dili, kiçik qardaşı Əlirzadan rus dili dərsləri almış, "İstiqlal" ordenli "Əməkdar müəllim" Lətif Hüseynzadə haqqında böyük rəhbərimiz Heydər Əliyev belə deyirdi: "Pedaqoji texnikumda bizə Azərbaycan dilinin incəliklərini öyrədən, Azərbaycan dilinin qrammatikasını, ədəbiyyatı öyrədən gözəl müəllimlərimiz var idi. Amma bu müəllimlərin içərisində Lətif Hüseynzadə xüsusi yer tutur… O, sinifdə lövhədə Azərbaycan dilinin qrammatikasından yazırdı, yəni hər bir sözün düzgün yazılışını. Bir də Azərbaycanın ədəbiyyatını - şairlərimizi, yazıçılarımızı öyrədirdi…" Deyə bilərik ki, pedaqoji texnikum Naxçıvan Muxtar Respublikasının maarif və mədəniyyətinin tərəqqisində müəllim kadrlarının yetişməsində, təkmilləşməsində müstəsna rol oynamışdır [2].

Ümummilli Lider 1980-ci ildə ali məktəb işçilərinin respublika müşavirəsindəki nitqində demişdir: "…Biz istəyirik ki, hər bir ali məktəb müəllimi öz sahəsində səriştəli olsun, geniş ümumi məlumata, yaxşı pedaqoji vərdişlərə, mühazirə oxumaq, dərs demək, öyrətmək, tərbiyə etmək üçün bütün başqa zəruri keyfiyyətlərə malik olsun. Bunun üçün gərək hər bir ali məktəb müəllimi elmi biliklərdən əlavə, yaxşı nitq, dil qabiliyyətinə, natiqlik məharətinə, bütün başqa pedaqoji keyfiyyətlərə və vərdişlərə yiyələnsin ki, bütün bunlar üst-üstə ona həqiqətən yaxşı tərbiyəçi olmaq imkanı versin..". Bu gün ölkə Prezidenti cənab İlham Əliyevin "Azərbaycan Respublikasında Təhsilin inkişafı üzrə Dövlət Strategiyası" haqqında 24 oktyabr, 2013-cü il tarixli sərəncamında səriştəli müəllim kadrları hazırlığı problemi təhsil işçilərinin qarşısına bir vəzifə olaraq qoyulması Heydər Əliyev ideyalarından irəli gəlir [3].

Özünün bütün həyatını Azərbaycana, onun inkişafına və tərəqqisinə sərf edən Ulu Öndər başqa sahələrdə olduğu kimi, xalqımızın təhsilinə, onun yüksəlişinə, bu sahədə şərəflə çalışan insanların şəxsiyyətinə, işinə, əməyinə həmişə yüksək qiymət vermiş, onlara böyük hörmət və ehtiramını bildirmişdir. Bu hörmət və ehtiram onun bütün çıxışlarında, fəaliyyətində özünü göstərmişdir. İstər müəllimlər qarşısında çıxışlarında, istər müəllimlər qurultayına göndərdiyi təbrik məktubunda, istərsə də respublikamızın problemləri ilə bağlı digər məruzə və çıxışlarında bu xətt həmişə olmuş və özünü göstərmişdir.

Ulu Öndər Heydər Əliyevin Azərbaycan xalqına, Azərbaycan gəncliyinə əmanət etdiyi müstəqil dövlətimizin sükanı etibarlı əllərə tapşırıldı. Azərbaycan Respublikasının prezidenti, Heydər Əliyev siyasi kursunun layiqli davamçısı cənab İlham Əliyev bu sükanı möhkəm tutdu, təməli Heydər Əliyev tərəfindən qoyulmuş Azərbaycan Dövlətini möhkəmləndirdi və xalqımızın rifahını yüksək zirvələrə qaldırdı. Azərbaycan xalqı Heydər Əliyev siyasi kursuna sadiqdir və həmin siyasi kursu ləyaqətlə davam etdirən bugünkü dövlət başçısına xalqın göstərdiyi ehtiram bunu bir daha təsdiqlədi.

Eyni zamanda düşünürəm ki, Ümummilli Lider Heydər Əliyev şəxsiyyətinə hörmət və ehtiram əlaməti olaraq, bu gün hər bir Azərbaycan vətəndaşı, hər bir azərbaycanlı, Azərbaycanın hər bir təhsil işçisi onun siyasi varisi Prezident İlham Əliyevin ətrafında daha sıx birləşməli, Azərbaycanın xoşbəxt gələcəyi, dövlətçiliyimizin əbədiliyi naminə əlindən gələni əsirgəməməli, hər zaman dövlət başçısının fəal müdafiəçisi, aktiv təbliğatçısı olmalıdır.

Bu gün yeganə təsəllimiz budur ki, Ümummilli Lider Heydər Əliyev özünün şah əsəri olan müstəqil Azərbaycan Respublikasını bizlərə miras qoyub haqq dünyasına qovuşdu.

**Problemin aktuallığı.** Ulu Öndərimiz Heydər Əliyevin müəllimlik peşəsinə verdiyi qiymət, təlim və tərbiyə haqqında söylədiyi müdrik fikirlər dünənimiz, bu günümüz və gələcəyiniz üçün aktual və əhəmiyyətlidir. Dahi rəhbərimiz, həmçinin müəllimlərin dərin elmi-pedaqoji biliklərə yiyələnməsini və onları tələbələrə çatdıra bilməyi vacib amillərdən sayırdı. O, müəllimlərin mənəvi tərbiyəsinə, onların ilk növbədə yüksək əxlaqi keyfiyyətlərə yiyələnməsinə xüsusi əhəmiyyət verir və bunu daha yüksək qiymətləndirirdi. O fikirlər pedaqoji elmimizin dəyərli mənbəyi, fəaliyyətimizin kompası, təhsilimizin, metodoloji əsasıdır.

**Problemin elmi yeniliyi.** Heydər Əliyevin Azərbaycan xalqına, Azərbaycan gəncliyinə əmanət etdiyi müstəqil dövlətimizin sükanı etibarlı əllərə tapşırıldı. Azərbaycan Respublikasının prezidenti, Heydər Əliyev siyasi kursunun layiqli davamçısı cənab İlham Əliyev bu sükanı möhkəm tutdu, təməli Heydər Əliyev tərəfindən qoyulmuş Azərbaycan Dövlətini möhkəmləndirdi və xalqımızın rifahını

yüksək zirvələrə qaldırdı. Azərbaycan xalqı Heydər Əliyev siyasi kursuna sadiqdir və həmin siyasi kursu ləyaqətlə davam etdirən bugünkü dövlət başçısına xalqın göstərdiyi ehtiram bunu bir daha təsdiqlədi.

**Problemin praktik əhəmiyyəti.** Böyük maarifçi Heydər Əliyevin təhsil sahəsində məktəbə və müəllimə qayğısı hər zaman aparıcı istiqamət olub. Ulu Öndərin səlis və aydın nitqi, insanlara humanist münasibəti, demokratik düşüncələri, tolerantlığı, əzmkarlığı, peşə fədakarlığı, dərin zəkası, incə yumoru, dəmir iradəyə sahibliyi, habelə səliqəli geyimi, vüqarlı yerişi, ifadəli baxışları, düzgün davranış və hərəkətləri hər bir müəllimin peşə keyfiyyətləri, peşə fəaliyyəti üçün bir nümunədir.

Ümummilli Lider Heydər Əliyev müəllimləri, ziyalıları sevirdi, onları hər zaman uca tuturdu, yüksək qiymətləndirirdi. Məqalə gənc tədqiqatçılar, müəllimlər və pedaqoji ictimaiyyət üçün faydalı ola bilər.

**Ədəbiyyat:**

1. Mirzəzadə R. Azərbaycanı dünyaya saydıran insan. -Bakı, -1998.
2. Xudiyev N. Heydər Əliyev və Azərbaycan dili. -Bakı, -1997.
3. Orucov H. Heydər Əliyev və Azərbaycan milli siyasəti. - Bakı, -2002.
4. Mirzəyev Ş. Xalqa bağışlanan ömür. 1-ci kitab. -Bakı, -2001.

**E-mail:** rahile.mamedova.1959@mail.ru
**Rəyçilər:** *filol.elm.dok.,* **F.K. Namazova**
*filol.ü.fəls.dok.,* **G.K. Yunusova**
**Redaksiyaya daxil olub:** 27.01.2023.

## *ÜMUMPEDAQOJİ PROBLEMLƏR*
## *ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ*
## *GENERAL PEDAGOGICAL PROBLEMS*

*UOT 371*

**Oqtay Allahverən oğlu Abbasov,**
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dillər Universiteti*

**Günay Elşad qızı Zalova**
*Azərbaycan Dillər Universiteti*
https://orcid.org/0000-0003-3122-7227

# ƏNƏNƏVİ VƏ MÜASİR QİYMƏTLƏNDİRMƏ SİSTEMİ

**Огтай Аллахверан оглы Аббасов,**
*доктор философии по педагогике, доцент,*
*Азербайджанский Университет Языков*

**Гюнай Эльшад гызы Залова,**
*Азербайджанский Университет Языков*

# ТРАДИЦИОННАЯ И СОВРЕМЕННАЯ СИСТЕМА ОЦЕНИВАНИЯ

**Ogtay Allahveran Abbasov,**
*doctor of philosophy in pedagogy, assistant professor,*
*Azerbaijan University of Languages*

**Gunay Elshad Zalova**
*Azerbaijan University of Languages*

# TRADITIONAL AND MODERN ASSESSMENT SYSTEM

**Xülasə.** Məqalədə toxunduğumuz mövzu müasir və ənənəvi təhsil sistemlərin fərqlərini özündə birləşdirir. Belə ki, ənənəvi, yoxsa müasir təhsil sistemi daha faydalıdır deyə sual qoysaq, cavabında müasir təhsil sistemini seçmiş olarıq. Səbəb olaraq qeyd edə bilərik ki, ənənəvi təhsil sistemindən fərqli olaraq, müasir Bolonya sisteminə keçid bizlərin dünya ölkələrində fəaliyyət göstərən universitetlərə çıxışımızı müqayisəolunmaz dərəcədə asanlaşdırdı. Bolonya sisteminə keçid, həmçinin tələbələrə bütün 2 və ya 4 illik təhsili tam olaraq xarici ölkədə alma imkanı olmayan tələbələrin 1-2 semestr kimi qısa müddət üçün də dünya ölkələrində olan ali təhsil ocaqlarına keçidinə imkan yaratdı. Nəzərə almalıyıq ki, bu gün universitetlərimizdə kifayət qədər xarici təhsilli müəllimlər fəaliyyət göstərir və bu da zamanla ölkəmizin təhsil səviyyəsinin dünya təhsil səviyyəsinə çatmasına vəsilə olacaqdır.
***Açar sözlər:*** *qiymətləndirmə, müasir qiymətləndirmə, ənənəvi qiymətləndirmə*

**Резюме.** Тема, затрагиваемая в статье, объединяет различия между современной и традиционной системами образования. Итак, если мы зададимся вопросом, традиционная или современная система образования полезнее, то в ответе мы выберем современную систему образования. В качестве причины можно упомянуть, что, в отличие от традиционной системы образования, переход на современную болонскую систему сделал для нас несравнимо более легким доступ к университетам, действующим в странах по всему миру. Переход на Болонскую систему также дал возможность студентам,

не имевшим возможности завершить все свое 2-х или 4-х летнее образование в иностранном государстве, переводиться в высшие учебные заведения стран мира на короткий период времени, например на 1-2 семестра. Мы должны учитывать, что сегодня в наших вузах достаточно преподавателей с зарубежным образованием, и это в конечном итоге приведет к тому, что уровень образования нашей страны достигнет мирового уровня образования.

***Ключевые слова:*** *оценивание, современное оценивание, традиционное оценивание*

**Summary.** The topic we touch on in our article combines the differences between modern and traditional education systems. So, if we ask the question whether the traditional or modern education system is more useful, we will choose the modern education system in the answer. As a reason, we can mention that, in contrast to the traditional education system, the transition to the modern bologna system made it incomparably easier for us to access universities operating in countries around the world. The transition to the Bologna system also made it possible for students who did not have the opportunity to complete their entire 2- or 4-year education in a foreign country to transfer to higher education institutions in the countries of the world for a short period of time, such as 1-2 semesters. We should take into account that today there are enough teachers with foreign education in our universities, and this will eventually lead to the education level of our country reaching the world education level.

***Key words:*** *evaluation, modern evaluation, traditional evaluation*

Qiymətləndirmə idrak proseslərindən biridir. Nəticə etibarı ilə real obyektlərinin və proseslərinin dəyərinin qiymətləndirilməsi şəklində ifadə olunur. Təhsildə əldə edilmiş nailiyyətlərin qiymətləndirilməsi təhsilin keyfiyyətinin idarə edilməsi sistemini formalaşdıran əsas aparıcı komponent kimi qəbul edilir. Bu da öz növbəsində təhsilin məqsədi ilə nəticəsi arasında keyfiyyət standartlarına uyğunluq dərəcəsinin müəyyən edilməsindən ibarətdir.

Hazırda ali təhsilin keyfiyyətinin təmin edilməsi vəzifəsinin aktuallaşması ilə əlaqədar olaraq ümumilikdə qiymətləndirmə funksiyası və xüsusilə tələbələrin təhsil fəaliyyətinin qiymətləndirilməsi bir neçə anlayışı özündə birləşdirir. İlk növbədə, qiymətləndirmə prosedurunun əsas məqsədi haqqında anlayış dəyişir. Bu gün qiymətləndirmənin funksiyası nöqsanların müəyyən edilməsi ilə məhdudlaşmır, təkmilləşdirmə istiqamətlərinin daha dəqiq müəyyənləşdirilməsini nəzərdə tutan təhsil prosesinin tənqidi təhlili kimi görünür. Qeyd etmək lazımdır ki, söhbət daha çox qiymətləndirmə vasitələrinin dəyişdirilməsindən deyil, qiymətləndirmənin məqsədlərini və qiymətləndirmə fəlsəfəsini dəyişdirməkdən gedir.

Ümumiyyətlə, qiymətləndirmənin məqsədi nəticələrin təsbiti deyil, yeni inkişaf mərhələsi, təhsilin keyfiyyətinin yüksəldilməsi üçün həvəsləndirmə funksiyasını yerinə yetirir. Başqa sözlə, qiymətləndirmənin vəzifəsi "müəyyən bir şəxsin işinin keyfiyyətini artırmaq və bununla da daha geniş məqsədlərə nail olmaqdır. Qiymətləndirilən insanların cəlb olunduğu təlim proqramlarının keyfiyyətini artırmaq və bütün işçilər üçün yeni iş keyfiyyətinə nail olmaqdır [1, s. 48].

Ali təhsilin keyfiyyətinin yüksəldilməsi prosesinin fasiləsizliyinə təminat verən mexanizmlərdən biri də universitetdə aşağıdakı əsas proseslər arasında əlaqə quran və saxlayan effektiv idarəetmə fəaliyyət sxeminin yaradılmasıdır (biz bunu "keyfiyyət döngəsi" olaraq da adlandıra bilərik:

**Şəkil 1. Keyfiyyət döngəsi [2, s. 136].**




Bu kontekstdə qiymətləndirmənin əsas funksiyası sistemin mövcud vəziyyətini düzəltmək deyil, onun keyfiyyətinin yaxşılaşdırılması strategiyasını müəyyən etməkdir. Keyfiyyətin qiymətləndirilməsi bu mürəkkəb fenomenin bütün komponentlərinin hərtərəfli, çoxşaxəli qiymətləndirilməsini əhatə edən sistemli, tənzimlənən prosedur olmalıdır.

Universitet təhsilinin keyfiyyətinin qiymətləndirilməsi proseduru təkcə daxili deyil, həm də xarici qiymətləndirmənin vəhdətidir. Qiymətləndirmə prosesi bir tərəfdən universitetin rəhbərliyinin, müəllim və tələbələrinin, digər tərəfdən əmək bazarı subyektlərinin və s. birgə fəaliyyəti ilə paralel olmalıdır. Universitet təhsilinin keyfiyyətinin qiymətləndirilməsi bütün maraqlı tərəflər tərəfindən həyata keçirilməlidir. Universitet təhsilinin keyfiyyətinin qiymətləndirilməsi çox səviyyəli prosedurdur: hər bir qiymətləndirmə predmeti öz miqyasından, həcmindən və qiymətləndirmə qaydasından istifadə edir [2, s. 136].

YUNESKO-nun "Ali təhsilin islahatı və inkişafı" siyasət sənədinə (1995) əsasən, təhsilin keyfiyyətinin qiymətləndirilməsi aşağıdakı üç aspekti əhatə edir:

-kadrların və proqramların keyfiyyəti;

-tələbə hazırlığının keyfiyyəti;

-infrastrukturun keyfiyyəti və təhsil mühiti [3, s. 137].

Ali məktəblərdə qiymətləndirmə sistemi, bildiyimiz kimi, ənənəvi və müasir sistem – Bolonya olaraq iki yerə ayıra bilərik. Əvvəlcə müasir Bolonya sisteminə nəzər yetirək. Görək müasir Bolonya dediyimiz sistem bizə nələr qazandırdı və hansı yenilikləri gətirdi, bunları araşdıraq.

Bütün Bolonya prosesinin mahiyyəti ali təhsili iqtisadiyyatın kifayət qədər yüksək gəlir əldə edə biləcəyiniz sahələrindən birinə çevirməkdir. Ali təhsil müəssisələrinin muxtariyyəti reallığa yox, əslində yalnız vədə çevrilir. Distant təhsilin tətbiqi gələcək tələbələri müəllimlərlə canlı ünsiyyətdən tamamilə məhrum edir və bu, gələcəkdə cəmiyyətin deqradasiyasına gətirib çıxaracaq. Bolonya prosesinin bir hissəsi olaraq, təhsilin humanitar komponenti bir neçə saata çıxarıldı və ya ciddi şəkildə məhdudlaşdırıldı. Müasir Avropanın təhsil məkanında humanitar fənlər lazımsız, səmərəsiz hesab olunur [6, s. 156].

İmtahan və ya test şəklində yekun nəzarətə əsaslanan tələbələrin biliyinin qiymətləndirilməsinin ənənəvi sistemi tələbələrin sistemli işini kifayət qədər stimullaşdırmır. Semestr və ya tədris ili ərzində cari nəzarət olmadıqda və ya qeyri-kafi olduqda, imtahana və ya kreditə həddindən artıq yük qoyulur. Eyni zamanda, tələbənin imtahanda aldığı qiymət bir sıra təsadüfi amillərdən (bilet seçimi, tələbənin və imtahan verənin psixoloji və fiziki vəziyyəti və s.) müəyyən dərəcədə asılıdır. Belə bir sistemlə tələbələrin bilik və bacarıqlarının qiymətləndirilməsində kifayət qədər diferensiallaşma, həmçinin biliklərin mənimsənilməsində tələbələr arasında rəqabət aparılmır. Kumulyativ bal-reytinq sistemindən istifadə təhsilin bütün pillələrində tələbələrin biliyinin davamlı monitorinqini, nəzarət nəticələrinin bir mərhələdən digərinə inteqrasiyasını, semestr və ya tədris ilində fənn üzrə tələbənin inkişaf dinamikasının müəyyən edilməsini nəzərdə tutur.

Tələbələrin biliyini qiymətləndirmək üçün Bolonya sisteminin məqsədləri aşağıdakılardır:

-semestr ərzində fənlərin öyrənilməsi üzrə sistemli işə tələbələrin motivasiyasının artırılması;

-təhsil işinin keyfiyyətinin qiymətləndirilməsi idarəetmə sisteminə cəlb etməklə tələbələrin müstəqil fəaliyyətinin aktivləşdirilməsi;

-korrupsiya risklərinin azaldılması məqsədilə topladıqları ümumi ballar əsasında tələbələrin obyektiv qiymətləndirilməsinin formalaşdırılması üçün ədalətli mexanizmlərin işlənib hazırlanması;

-tələbələrin bilik və bacarıqlarına nəzarət (monitorinq və qiymətləndirmə) sisteminin tətbiqi yolu ilə təhsilin keyfiyyətinin yüksəldilməsi;

-məzmunun, eləcə də tədris metodlarının yenilənməsi və təkmilləşdirilməsi üzrə professor-müəllim heyətinin, tələbələrin işinin aktivləşdirilməsi; təlim nəticələrinin tələbələrin biliyinin qiymətləndirilməsinin beynəlxalq sistemi ilə müqayisəsinin təmin edilməsi [10, s. 4].

Bolonya sistemi maksimum 100 baldan ibarətdir. 100 bal özündə tələbənin dərsə davamiyyətindən tutmuş, dərslərə hazırlıq səviyyəsinə və həmçinin təhvil verilmiş sərbəst işdən əldə edilmiş balları özündə cəmləşdirir. Aşağıda verilmiş şəkildə 100 ballıq qiymətləndirmənin meyarları ilə tanış ola bilərik.

**Şəkil 2: Bolonya sistemində əksər universitetlərdə tətbiq olunan 100 ballıq qiymətləndirmə sisteminin meyarları** [4, s. 5].




Onu da əlavə etməliyik ki, **şəkil 2**-də qeyd olunmuş bölgü sistemi, yuxarıda da qeyd etdiyimiz kimi, universitetlərə görə dəyişə bilər. Belə ki, bu qiymətləndirmə sistemi Azərbaycan Dövlət İqtisad Universitetində tam bu şəkildə tətbiq edilir, amma biz müxtəlif universitetlərdə müxtəlif imtahana giriş və imtahanda qiymətləndimə sistemləri görə bilərik.

Bolonya sistemində tələbənin dərsdəki qeydiyyatı i/e, q/b və bal olaraq aparılır. Belə ki, tələbə dərsdə iştirak edirsə - i/e, dərsə gəlməyibsə - q/b və nəhayət, dərsdə iştirak edir və seminarda verdiyi cavaba uyğun bal olaraq qeydiyyat aparılır.

**Şəkil 2**-də qeyd etdiyimiz kimi, maksimum 100 baldan 50 balı tələbə imtahandan toplaya bilər. Bəs tələbə bu 50 balı imtahandan hansı meyarlara əsasən qazana bilər? Əvvəlcə onu qeyd edək ki, tələbə semestr və imtahanla birlikdə 51 bal toplamış olarsa, o, imtahandan keçmiş sayılır. Amma burada bir nüansı da qeyd etməliyik ki, imtahandan toplanan bal 17-dən az olmamalıdır. İmtahan zamanı tələbə 5 sual cavablandırır. Hansı ki, hər sual ona maksimum 10 bal qazandıra bilər. Bəs hər sual üçün 0 – 10 aralığında qiymətləndirmə hansı meyarlara əsasən aparılır? Bu suala cavab tapmaq üçün aşağıdakı şəklə nəzər salaq.

**10 BAL**

-Tələbə keçirilən materialı tam başa düşüb.

-Verilən cavab hərtərəflidir.

-Tələbə mövzunun izahını fasiləsiz olaraq verə bilir, tərifin mahiyyətinin açıqlamasını tam verə bilir, verilmiş praktiki misalları fərqli təhlil etməyi və nəticə çıxarmağı bacarır.

**9 BAL**

-Tələbə keçirilən materialı tam başa düşüb.

-Təhlil və nəticəyə kifayət qədər diqqət edilməyib.

-Tələbə mövzunun izahını fasiləsiz olaraq verə bilir, tərifin mahiyyətinin açıqlamasını tam verə bilir, lakin verilmiş praktik misalların təhlilini verə bilsə də, nəticə çıxarmağında problemlər var.

**8 BAL**

-Tələbə cavabında müəyyən qüsurlara yol verib.

-Verilən cavablarda əskikliklər var.

-Tələbə mövzunun izahını fasiləsiz olaraq verə bilir, tərifin mahiyyətinin açıqlamasını ümumən verə bilir, lakin verilmiş praktiki misalların təhlilində və nəticə çıxarmağında problemlər var.

**7 BAL**

-Tələbə keçirilən materialı tam başa düşüb.

-Nəzəri cəhətdən əsaslandırmaqda çətinlik çəkib

-Tələbə mövzunun izahını fasiləsiz olaraq verə bilir, tərifin mahiyyətinin açıqlamasını ümumən verə bilir, lakin verilmiş praktiki misalların təhlilində və nəticə çıxarmağında bəzən az, bəzən isə ciddi nöqsanlar var.

**6BAL**

-Tələbənin cavabı əsasən doğrudur.

-Verilən cavab hərtərəfli deyil.

-Tələbə mövzunun izahını fasiləsiz olaraq verə bilmir, tərifin mahiyyətinin açıqlamasını qismən verə bilir, praktiki misalların təhlilinə və nəticəsinə ümumiyyətlə toxunulmayıb.

**5BAL**

-Tələbənin cavabında çatışmazlıqlar var.

-Mövzunu tam əhatə edə bilmir.

-Tələbə mövzunun izahında nöqsanlara yol verir, tərifin mahiyyətinin açıqlamasını tam verə bilmir, praktik misalların təhlilinə və nəticəsinə ümumiyyətlə toxunulmayıb.

**4BAL**

-Tələbənin cavabı qismən doğrudur.

-Mövzunu izah edərkən səhvlərə yol verib.

-Tələbə mövzunun izahını qismən verir, tərifin mahiyyətinin açıqlamasını verəndə səhvlərə yol verir, praktiki misalların təhlilinə və nəticəsinə ümumiyyətlə toxunulmayıb.

**3BAL**

-Tələbənin mövzudan xəbəri var.

-Məlumatı az olduğu üçün fikrini əsaslandıra bilmir.

-Tələbənin mövzudan qismən xəbəri olduğu üçün əsaslı cavablar verə bilmir, tərifin mahiyyətinin açıqlamasını verə bilmir, praktiki misalların təhlilinə və nəticəsinə ümumiyyətlə toxunulmayıb.

**2 BAL**

-Tələbənin mövzudan minimum məlumatı var.

-Təriflərdə ciddi nöqsanlara yol verib.

-Tələbənin mövzudan demək olar məlumatsızdır, tərifin mahiyyətinin açıqlamasını verə bilmir, praktiki misalların təhlilinə və nəticəsinə ümumiyyətlə toxunulmayıb.

**0BAL**

-Suala cavab verilməyib. VƏRƏQ BOŞDUR! [4, s. 24].

Ənənəvi təhsil sisteminə gəldikdə isə, əvvəlcə onu qeyd etmək lazımdır ki, ölkəmiz Sovet rejimi dövründə SSRİ-də mövcud olan vahid təhsil sisteminə tabe idi. Heç kəsə sirr deyil ki, SSRİ təhsil sistemi elmi biliklərin öyrədilməsi ilə yanaşı sovet ideologiyasının təbliğinə xüsusi önəm verirdi. Nəticə etibarı ilə Azərbaycan dünya təhsil sistemindən faktiki olaraq məhrum olunmuş vəziyyətdə idi. Aydın məsələdir ki, SSRİ-nin tərkibində olan bir ölkənin milli və dövləti maraqlarına uyğun təhsil islahatları həyata keçirmək üçün heç bir şansı yox idi. Lakin Sovet dövlətinin dağılması ölkəmizdə bir çox sahələrdə olduğu kimi, təhsil sahəsində də müstəqil siyasət tətbiq etməyinə şərait yarandı. Nəticədə ölkəmizin müasir dünya təhsil sisteminə inteqrasiya edilməsi üçün təxirəsalınmaz tədbirlər həyata keçirilməyə başlanıldı.

Bildiyimiz kimi, ölkəmizdə 1999-cu ildə "Azərbaycan Respublikasının Təhsil Qanunu" qəbul edilmişdir. Bu qanun qəbul edildikdən sonra təlim-tərbiyənin məzmunu, təhsil sistemində tədrisin təşkili, elmi-metodiki, həmçinin informasiya təminatının təkmilləşdirilməsi, maddi-texniki bazanın formalaşdırılması, elmi-tədqiqat və beynəlxalq əlaqələr sahəsində əsaslı işlər görülmüşdür [1].

Yeni qiymətləndirmə sisteminin məzmunu və mahiyyəti daha geniş və əhatəli olduğuna görə ənənəvi qiymətləndirmə mexanizmini sıradan çıxara bilmişdir. Ənənəvi təlim prosesində qiymətləndirmə dedikdə, biliyi rəqəmlə hesaba alma nəzərdə tutulurdu. Bu zaman tələbənin biliyi əvvəlcə necə təyin edilmişdirsə, daha sonrakı hallarda müxtəlif situasiyalar zamanı da, həmin nəticə əsas götürülürdü. Amma yeni sistemdə qiymətləndirmə məhz, tələbənin bir şəxsiyyət kimi dəyərləndirilməsini ön plana çəkir və ona əsasən dəyərləndirilir.

Əlavə olaraq qeyd etməliyik ki, müasir təhsil sistemində fərdi yanaşma ön planda durur və əsas məqsəd kimi hər bir tələbənin inkişafının təmin edilməsi qəbul edilir. Təlimçi hər bir tələbənin mənimsəmə səviyyəsinə uyğun olaraq qiymətləndirmə vasitələri tətbiq etməlidir. Ancaq bu halda təlim prosesi zəif tələbələrin də, nəticə əldə etməsinə müsbət təsir göstərir [2, s. 65].

Müasir qiymətləndirmə ənənəvi qiymətləndirmədən üstün edən cəhətlərindən biri də qiymətləndirmə standartlarının 4 meyar səviyyəsində təyin edilməsidir ki, bu da tələbələrin bilik, bacarıq və vərdişləri hansı səviyyədə ol-

masını daha dəqiq təyin etməyə şərait yaradır. Belə ki, fərdi, qrup və kollektiv iş formalarında meyarlara əsasən qiymətləndirmə tətbiq edilir. Ənənəvi qiymətləndirmədə isə bu şəkildə standart meyar olmur və əsas meyar göstəricisi kimi müəyyən mövzular əsas götürülürdü. Tələbənin qiyməti mövzunu öyrənib danışmağa əsasən təyin edilirdi. Ənənəvi qiymətləndirmənin əsas meyarları təhsilalanın şifahi cavabları, yoxlama yazıları hesab olunurdu. Müasir qiymətləndirmədə isə çox səmərəli, optimal vasitələrdən istifadə olunur.

Xüsusi ilə qeyd etməliyik ki, qiymətləndirmə təhsil sisteminin əsasını təşkil edir. Qiymətləndirmənin hansı səviyyədə olması, gələcəyi görmək, nəticələri təhlil edib inkişaf etdirmək baxımından çox vacibdir. Doğru qiymətləndirmə ilə yüksək səviyyədə idarə etmək, təhsil islahatları aparmaq və nəticələr əldə etmək mümkündür [3, s. 15].

Yekun olaraq onu qeyd etmək istədim ki, əslində hər iki sistemdə həm ənənəvi, həm də müasir Bolonya sistemində dövrünə görə yüksək nəticələr əldə edilib. Belə olan halda sual yarana bilər: hər iki sistem mükəmməldirsə bəs niyə sürətli Bolonya sisteminə keçidə can atılır? Qeyd etdiyim kimi, hər sistem öz dövrünə görə mükəmməl olub. Yəni indiki dövrdə artıq ənənəvi sistem günümüzün reallıqlarına cavab verə bilmir. Qloballaşan dünyamızda dünya təhsil sisteminə inteqrasiya olunmağın yolu məhz Bolonya sistemindən keçir.

**Problemin aktuallığı.** Məqalənin mövzusu olan təhsildə qiymətləndirmə günümüzdə müstəsna əhəmiyyətə malikdir. Aydın məsələdir ki, doğru qiymətləndirmə olmayan bir təhsil sistemində inkişafdan və keyfiyyətdən danışmaq olmaz.

**Problemin elmi yeniliyi.** Bolonya sisteminin tətbiqi dünya ölkələrinin təhsil sistemini bir növ bir-birinə bağladı. Nəticədə universitetlər arasında əlaqələr genişləndi və tələbə mübadiləsi kifayət qədər əlçatan oldu.

**Problemin praktik əhəmiyyəti.** Məhz doğru və ədalətli qiymətləndirmə ilə tələbələri daha yüksək nəticələrə motivə etmək və onlar arasında rəqabət mühiti formalaşdırmaq olar. Ədalətli qiymətləndirmə, həmçinin təhsilin gələcək inkişafı və idarəedilməsi baxımından da çox vacibdir.

**Ədəbiyyat:**


1. Azərbaycan Respublikasının Təhsil Qanunu. https://e-qanun.az/framework/18343.
2. Cavadov, İ.A. Ümumtəhsil məktəblərində monitorinq və qiymətləndirmə üzrə işin sistemi / İ.A. Cavadov. -Bakı, -2006. -s. 150.
3. Şərifov T. Qiymətləndirmə keyfiyyətə nəzarətin və təlim vasitəsilə idarəetmənin müasir mexanizmi kimi. // -Bakı, Azərbaycan məktəbi, -2002. № 3, - s.14 – 22.
4. Azadov E.H. Kredit sistemi ilə təhsil alan tələbələrin biliyinin qiymətləndirilməsi. -2019, -s. 35.
5. Краснова Т. И. Оценивание учебной деятельности студентов. Т.И. Краснова. Аналитический обзор международных тенденций развития высшего образования. -2003. № 6. -С. 45–53.
6. Гусаковский М. А., Барченок А. В., Краснова Т. И. Критерии оценки качества современного университетского образования. -2011. -С. 147.
7. Документ Юнеско П. Реформа и развитие высшего образования": Пособие по образованию в области прав человека с участием молодежи. Совет Европы. Париж: Издательство ЮНЕСКО, -1995. -С. 425.
8. Олейникова О. Н. Болонский процесс и сопоставимость программ, дипломови квалификаций высшего образования. Вестник Московского государственного областного университета. Серия: Психологические науки. -2009. №. 3-2. -С. 13-25.
9. Автономизация вузов России и Болонский процесс. Высшее образование в России. -2006. № 6, -С. 25–27.
10. Шеховцов А. Н., Шеховцова Н. А. Традиции Болонского университета и современный Болонский процесс. Вестник Волгоградского государственного университета. Серия 4: История. Регионоведение. Международные отношения. -2013. №. 1, -С. 151-157.
11. Мишюлина М.В. Методические рекомендации по внедрению балльнорейтинговой системы оценки успеваемости студентов [Текст]. М.В. Мишюлина. Санкт-Петербург, -2013. -38 с.


**E-mail:** zalovagunay24@gmail.com
**Rəyçilər:** *ped.ü.fəls.dok.,dos.* **V. Bəşirov,**
*ped.ü fəls.dok.* **Ş. Tahirova**
**Redaksiyaya daxil olub:** 08.06.2022

UOT 371

***Əsmət İdris qızı İsmayılxanova***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## İNTERAKTİV VƏ ƏNƏNƏVİ TƏLİM METODLARININ MÜQAYİSƏLİ TƏHLİLİ

***Асмет Идрис гызы Исмаилханова***
*доктор философии по педагогике, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

## СРАВНИТЕЛЬНЫЙ АНАЛИЗ ИНТЕРАКТИВНЫХ И ТРАДИЦИОННЫХ МЕТОДОВ ОБУЧЕНИЯ

***Asmat Idris Ismailkhanova***
*doctor of philosophy in pedagogy, associate professor*
*Azerbaijan State Pedagogical University*

## COMPARATIVE ANALYSIS OF INTERACTIVE AND TRADITIONAL METHODS OF TEACHING

**Xülasə.** Müəllif bu məqalədə Azərbaycan təhsilinin dünya ölkələri standartlarının tələbləri səviyyəsinə qaldırılmasının iki istiqamətini göstərmişdir. İnteraktiv təlim metodlarının mahiyyət və məzmununu səciyyələndirmiş və əsas bir neçə cəhətini göstərmişdir. Müəllimin rəhbərliyi altında şagirdlərin hansı müsbət işlərə imza atdıqlarından bəhs etmişdir, müasir dövrdə həm inkişaf etmiş xarici ölkələrin təhsilə tətbiq etdikləri interaktiv metodların, həm də novator müəllimlərin qabaqcıl iş təcrübəsinin öyrənilməsi və təhsil-tərbiyə sahəsinə tətbiqini mərhələlərlə izah etmişdir. Hətta hər bir təcrübənin səmərəliliyini, müasirliyini şərtləndirən cəhətlərin müəyyən edilməsinə, bu cəhətlərin yeniləşdirilməklə tətbiqinə imkan yaradan metodları qeyd etmişdir. İnteraktiv təlim metodlarının xüsusiyyətlərini qeyd etmiş, ənənəvi təlimlə interaktiv təlimin oxşar və fərqli cəhətlərinin təhlilini vermişdir.

***Açar sözlər:*** *demokratikləşmə, fərdiləşmə, diferensiallaşdırma, humanistləşdirmə, inteqrasiya, interaktivlik, standartlar, milli dəyərlər, modernləşmə, fasilitator, problem-situasiya*

**Резюме.** В данной статье автор показал два направления, с помощью которых возможно поднять уровень образования в Азербайджане до уровня мировых стандартов. Автор охарактеризовал сущность и содержание интерактивных методов обучения на основе нескольких основных аспектов этих методов. В статье повествуется о положительной деятельности учащихся под руководством учителя, поэтапно объясняется применение в современную эпоху интерактивных методов образования, используемых в развитых зарубежных странах, а также передовой опыт работы учителей-новаторов в области обучения и воспитания. Также упомянуты методы, позволяющие определить аспекты эффективности каждой такой практики и её соответствия современным требованиям, и применять эти аспекты путем их обновления.

Отмечены особенности интерактивных методов обучения, предоставлен анализ сходных и отличительных черт между традиционными и интерактивными методами обучения.

***Ключевые слова:*** *демократизация, индивидуализация, дифференциация, гуманизация, интеграция, интерактивность, стандарты, национальные ценности, модернизация, фасилитатор, проблема-ситуация*

**Summary.** Author showed two possible ways to raise the level of education in Azerbaijan to the level of international standards. She characterized the essence and content of interactive methods of teaching based on several key aspects of these methods. The article describes the positive contribution of students

under the guidance of teacher, explains in stages the use of interactive methods of education in the modern era, as used in developed countries, as well as the best practices of innovative teaching for education. Author reviews techniques to identify aspects of the effectiveness of each such practice and their compliance with modern requirements, and to apply these aspects by updating them. The article also covers the features of interactive teaching methods, provides analysis of similarities and differences between traditional and interactive methods of teaching.

***Key words:*** *democratization, individualization, differentiation, humanization, integration, interactivity, standards, national values, modernization, facilitator, problem-situation*

Azərbaycan Respublikasının təhsil sistemi çox yüksək sürətlə inkişaf etdirilir. Təhsil sistemimizin dünya ölkələrinin standartlarının tələbləri səviyyəsinə qaldırılması bu sahədəki fəaliyyətin iki istiqamətdə təşkil edilməsi ilə əlaqədardır. Birincisi, Respublikamızın öz daxilində təhsilimizdə əldə edilmiş müvəffəqiyyətlərin öyrənilməsi, təhlil edilməsi və ümumiləşdirilməsindən ibarətdir. Belə ki, ümumtəhsil məktəblərində təlim-tərbiyə sahəsindəki nailiyyətlərin məzmunu və mahiyyətini öyrənməklə təhsilimizin indiki vəziyyətini müəyyənləşdirmək böyük əhəmiyyət kəsb edir və vətəndaş cəmiyyətinin yeni istiqamətdə formalaşdırılmasında hansı müvəffəqiyyətlərin əldə olunduğunu və gələcəyimiz üçün hansı əlverişli şəraitin yarandığını aşkara çıxarmağa imkan yaradır. Aparılan araşdırmaların nəticələri onu deməyə əsas verir ki, Azərbaycanda həm ayrı-ayrı fənn müəllimlərinin, həm də ümumtəhsil müəssisələrinin strukturunun müasir cəmiyyətin tələbləri ilə üst-üstə düşməsi nəticəsində həm hərtərəfli inkişaf etmiş şəxsiyyətin formalaşdırılması, həm qazanılan nailiyyətlərin düzgün qiymətləndirilməsi, həm də təhsilin idarə edilməsi istiqamətində əlverişli təcrübələr toplanmışdır. Həmin təcrübələrin ümumiləşdirilməsi, onlardan maksimum dərəcədə istifadə edilməsi ölkəmizin təhsil sisteminin milli zəmində qurulmasına böyük təkan verir.

İkinci istiqamət isə hər cəhətdən inkişaf etmiş xarici dövlətlərin təhsil təcrübəsində olan ən əlverişli məqamların öyrənilməsi, ümumiləşdirilməsi və milli dəyərlər nəzərə alınmaqla tətbiq edilməsi çox aktual məsələdir. Azərbaycan müstəqillik qazandıqdan sonra bu istiqamətdə mühüm addımlar atılmışdır. Pedaqoji yeniliklər kimi öyrənilən belə təcrübələrin keyfiyyəti vətəndaşlarımızın inkişaf səviyyəsi ilə müəyyən edilir və yeniyetmə və gənclərdə formalaşan həyat üçün zəruri olan bacarıqlar onların ümumi səviyyəsinin ən vacib göstəricisi kimi meydana çıxır.

Ənənəvi təlim metodlarının ən mühüm cəhəti ondan ibarətdir ki, hər hansı bir yanaşma təcrübi və ya eksperimental qaydada sınaqdan keçirilir, daha sonra isə lazımi innovasiyanın tətbiq olunmasına qərar verilir. XXI əsrin əvvəllərində Azərbaycanın təhsilinin yenidən qurulmasına qərar verildi və təhsilimizin qərb dövlətlərinin təhsilinə inteqrasiyası, modernləşdirilməsi, bu işlərin təşkilində interaktiv metodlardan istifadə edilməsi aktual problem kimi qarşıda dayanır. Bu cür problemlərin həll edilməsi üçün mühüm pedaqoji tədqiqatların aparılmasına çox böyük ehtiyac vardır. Azərbaycan Respublikasının təhsilinin inkişafı dinamikası, interaktiv metodlar sayəsində yaradılmış müəllif məktəblərinin, yenilikci müəllimlərin iş təcrübələri öyrənilməli və digər ümumtəhsil məktəblərində tətbiq olunmalı, psixoloji-pedaqoji araşdırmalardan alınan nəticələr sistemləşdirilməli və təlim-tərbiyə prosesinin məzmunu bilavasitə yeniləşdirilməlidir. Təhsil-tərbiyə sahəsindəki bu problemlərin həll edilməsi ümumilikdə təhsilə, eyni zamanda, pedaqoji prosesə interaktiv metod anlayışının gətirilməsi qarşıda dayanan ən aktual problemdir və texnoloji yanaşmaların təhsilə tətbiqini tələb edir.

Müasir dövrdə həm inkişaf etmiş xarici ölkələrin təhsilə tətbiq etdikləri interaktiv metodların, həm də novator müəllimlərin qabaqcıl iş təcrübəsinin öyrənilməsi və təhsil-tərbiyə sahəsinə tətbiqi çox mühüm məsələdir. Hətta hər bir təcrübənin səmərəliliyini, müasirliyini şərtləndirən cəhətlərin müəyyən edilməsinə, bu cəhətlərin yeniləşdirilməklə tətbiqinə imkan yaratmaq lazımdır. Bəs görək interaktiv təlim metodlarının əsas mahiyyəti və məzmunu nədən ibarətdir?

Aparılmış pedaqoji tədqiqatların nəticələri onu deməyə əsas verir ki, müasir təlim texnologiyaları bu xüsusiyyətləri ilə səciyyələnir: - təlim prosesində müəllim fəaldır və şagirdləri də yaradıcı fəallığa cəlb edir; - aktiv fəaliyyət göstərən şagirdlərə elementar yaradıcı bacarıqlar verilir; - həm müəllim şagirdlərlə, həm də şa-

girdlər bir-biri ilə əməkdaşıq edir; - hərəkətli, musiqili, rollu, didaktik, süjetli oyunlar təşkil edilir, müsbət psixoloji mühit və sosial bərabərlik üçün şərait yaradılır; - müəllim elə bir tematik material təqdim edir ki, o, həm hər bir şagirdin milli düşüncə tərzinin formalaşmasına, həm də yaradıcı təfəkkürünün inkişafına təsir edir. Bəs görəsən müasir pedaqoji texnologiyalar məktəblilərdə hansı müsbət keyfiyyətləri aşılayır: - hər bir hadisə haqqında müstəqil düşünmək və sərbəst fikir yürütmək; - topladığı və öyrəndiyi biliyi sərbəst şəkildə təhlil etmək bacarığı;- öz biliyini obyektiv qiymətləndirməyi bacarmaq; - müəllim və şagird yoldaşları ilə əməkdaşlıq etmək bacarığı (iş prosesində digər yoldaşları ilə işləməyi, problemin həlli prosesində işin bölüşdürülməsini bacarmaq); - onlarda digər yoldaşlarını dinləmək mədəniyyəti aşılamaq, onların fikirlərinə hörmətlə yanaşmaq və hər dəfə çətinliklə üzləşəndə dözümlü olmaq; - aldığı nəticənin düzgün olduğuna əmin olduqda onu həm izah, həm də sübut etmək bacarığı; - əməkdaşlıq şəraitində problemin həlli yollarını müəyyən etmək və düzgün qərar qəbul etmək.

Mövcud təlim texnologiyaları dərsdən əvvəlki hazırlıq mərhələsində fənn müəllimindən, dərs prosesində isə şagirddən fəal olmağı tələb edir. Texnologiyaların köməyi ilə təlimin təhsilverici, tərbiyəedici və inkişafetdirici funksiyaları özünü daha qabarıq göstərir. Bu da təlim prosesinin keyfiyyətinin yüksəlməsinə təsir göstərir. İnteraktiv təlim-tədris prosesinin düzgün təşkili və idarə olunması üçün tətbiq olunan metodların cəmidir. İnteraktiv təlimin bir neçə səciyyəvi cəhəti mövcuddur. Bunlar aşağıdakılardır: -hər bir fənn müəllimi şüurlu surətdə idraki problem situasiya yaradır; - bu problemin həll edilməsində hər bir şagirdin tədqiqatçılıq bacarığı formalaşır; - yeni biliklərin şagirdlər tərəfindən müstəqil kəşf edilməsi və mənimsənilməsi üçün şərait yaradılır. Bu cür yanaşmanın əsas cəhəti ondan ibarətdir ki, təlim həm məktəbliləri yeni biliklərlə silahlandırır, həm təfəkkürünü inkişaf etdirilməklə müstəqil şəkildə daha çox yeni biliklər əldə edirlər. Bunda əsas məqsəd şagirdlərdə müsbət əxlaqi keyfiyyətlər və qabiliyyətlər inkişaf etdirməkdən ibarətdir. Bəs görək şagirdlər müəllimin rəhbərliyi altında daha hansı müsbət işlərin yerinə yetirilməsinə nail olurlar? -Müəllimin seçdiyi, şagirdlər tərəfindən asan dərk edilən, əsas tədris materiallarının öyrənilməsi zamanı əldə olunan faktların, qanunauyğunluqların aşkar edilməsinə; - onlardan nəticə çıxarmaq bacarığına; -ən vacib ümumiləşdirmələrin aparılmasına.

Təlim prosesində şagirdlərin mövqeyi kəşf etmək, bir sözlə, tədqiqatçılıq mövqeyidir. Şagird bacardığı qədər qarşısına çıxan problemləri həll edir. Təlim prosesində şagirdlər elmi bilikləri güclü axtarış və kəşflər sayəsində mənimsəyirlər. Təlim zamanı müəllimin əsas mövqeyi bələdçilik (fasilitator) etməkdir. Bəs müəllimin əsas rolu nədən ibarətdir? -Dərsin tədrisi zamanı problemli vəziyyət (problem-situasiya) yaratmaq; -bu vəziyyəti planlı şəkildə qurmaq; - şagirdlərin tədqiqatçılıq qabiliyyətlərinin üzə çıxarılmasına şərait yaratmaq; -problemin müvəffəqiyyətlə həll edilməsinə kömək etmək.

İnteraktiv təlim metodunun aşağıdakı xüsusiyyətləri vardır: - təlim prosesinin subyekt – subyekt xarakterli olması; - şagirdlərin müstəqil öyrənmə bacarığı, fəallığı və sərbəstliyi; - bütün dərs boyu şagirdlərin fəal olması; - problem-situasiyanın təlim prosesinin əvvəlində yaradılması, bütün dərsin verilmiş problemin həll edilməsinə həsr olunması; - bu zaman istiqamətverici və düşündürücü suallarla şagirdləri müstəqil şəkildə yeni bilikləri kəşf etməyə yönəltmək; - dərsdə əks əlaqə yaratmaq, dərsi dialoq şəklində təşkil etmək; -təlim prosesində qarşılıqlı fəaliyyəti və əməkdaşlığı təmin etmək. Bildiyimiz kimi, yeni pedaqoji təfəkkür bu prinsiplərlə xarakterizə olunur: demokratikləşmə, fərdiləşmə, diferensiallaşdırma, humanistləşdirmə, inteqrasiya. Bu prinsiplər şagird şəxsiyyətinin inkişaf etdirilməsinə şərait yaradır. İnteraktiv metod təlim zamanı öyrədənlə öyrənən arasındakı prosesin gedişindən, yəni dərsin mövzusundan, şərhdən, istifadə olunan rollu oyunlardan, dialoqdan o an ortaya çıxan yanaşma və izahdır. Bu cür yanaşmalar qabaqcadan planlaşdırılmır, yəni dərsin gedişi zamanı şagirdlərin sərbəstliyi, müstəqilliyi və ya onların müdaxiləsi zamanı meydana çıxır. Hətta interaktivlik şagirdlərin öz aralarında da olur. Təlim prosesində müəllimlə şagirdlər bərabər hüquqlu olurlar. Lakin bələdçi-fasilitator olaraq müəllim bir növ məsləhətçi vəzifəsini yerinə yetirir. Öyrənənlərin hərəkətlərinə müdaxilə etməyərəkdən problem-situasiyanı yaradır, məsləhətlərini verir, axtarışı haradan

başlamağa yardım edir. Şagirdlər isə özləri öz aralarında diskussiya apararaq tədqiqatı sərbəst şəkildə aparırlar. İnteraktiv təlim dedikdə, təlim prosesində yaranan şagirdlərin öyrənmə bacarığı, qarşılıqlı anlaşma, əməkdaşlıq və öyrədən-öyrənən münasibəti başa düşülür. İnteraktiv (fəal) təlim metodunda isə şagirdlərin dərs prosesində yiyələnməli olduqları üsullar, vasitələr, fikirlər, işlər nəzərdə tutulur. Müasir dərsi müəllim öyrətmə prosesində xüsusi bacarıq və qabiliyyətlə qurmalıdır. O, dərsdə işgüzar mühit yaratmalıdır.

Belə ki: -təlim prosesində şagirdlərin müstəqilliyi təmin olunmalıdır; - verilən mövzuya müvafiq priyomlardan istifadə olunmalıdır; - interaktivlik və çeviklik təmin olunmalıdır; - problemli təlimdən istifadə olunmalıdır.

İnteraktiv dərsin müəllimi öz fənninə ciddi hazırlaşmalıdır. Hər bir mövzunun tədrisində müəllim nələri edəcəyini, hansı priyomlardan, üsullardan, vasitələrdən istifadə edəcəyini qabaqcadan müəyyənləşdirməlidir. Həmin mövzuyla bağlı elmi-texniki yenilikləri şagirdlərə anındaca çatdırmalıdır. Şagirdlərin dünyagörüşünü inkişaf etdirmək üçün öz biliklərini də yeniləməli və daim yeni biliklərin axtarışında olmalıdır. Dərsdə əyaniliyə xüsusi fikir verilməlidir. Müasir dərs tək bilik verməklə deyil, eyni zamanda tərbiyələndirməyi də yerinə yetirməlidir. Təlim şagirdlərin mənəvi dünyasını zənginləşdirməli, onların əxlaqına təsir etməli, vətənpərvərlik, əməksevərlik, nəciblik kimi müsbət əxlaqi keyfiyyətlər tərbiyə etməlidir. Dərsdə milli dəyərlər gözlənilməlidir. İnteraktivlik özündə dialoq, qarşılıqlı fəaliyyət göstərmək kimi müsbət keyfiyyətləri birləşdirir. Təlim prosesində hər bir yenilikçi müəllimlərin bir-birinin dərsini dinləməsi, "açıq dərs"lərin keçirilməsi, müəllimlərin tətbiq etdiyi metodların öyrənilməsi və yayılması faydalıdır. Bu zaman keçilən dərslər tənqidi təfəkkürün süzgəcindən keçir, ümumiləşdirilir. Eyni zamanda müəllimlər yeni metodları tətbiqetmə imkanı qazanırlar.

Müəllim təlim prosesini elə təşkil etməlidir ki, şagirdlər yeni bilikləri tədqiqat yolu ilə əldə etsinlər. Yəni dərsdə problemin həlli qrup və cütlüklər formasında axtarılır, qruplar əldə etdikləri nəticəni özlərinin işçi vərəqlərində yazırlar və sonda həll etdikləri problemdən alınan nəticələrin təqdimatını keçirirlər. Bu zaman hər bir qrup bu təqdimatda fəal iştirak edir, təqdimatın sonunda alınan nəticələr arasında əlaqə yaradılır, verilən məlumatlar sistemləşdirilir. Daha sonra tədqiqatın əvvəlində irəli sürülən fərziyyələrlə tədqiqatın yekun nəticələrinin müqayisəsi aparılır. Bu zaman şagirdlər nəticələrin hansının üst-üstə düşdüyünü, hansıların isə yeni olduğunun müşahidə edərək ümumi nəticəyə gəlirlər və problem qoyulur və motivasiya yaradılır.

Motivasiya isə təhrik etmədir. Öyrənənlərin dərketmə marağını fəal şəkildə qoyulmuş problemin həll edilməsinə istiqamətləndirir. Motivasiyanın başqa bir vəzifəsi isə tədqiqat sualını ortaya qoymağa yardım edir. Tədqiqat sualı isə, öz növbəsində, həm ilkin fərziyyələr irəli sürməyə, həm də aparılacaq tədqiqat işlərinin düzgün təşkilinə şərait yaradır. Ənənəvi təlimdə ən mürəkkəb problem istifadə edilən pedaqoji texnologiyaların qeyri-çevikliyi idi. Bu cür təlimdə şagirdin əsas bilik mənbəyi həm müəllim, həm də dərsliklər və dərs vəsaitləri idi ki, şagirdlər bununla kifayətlənirdilər. Müasir dövrdə isə mənbələr müqayisəolunmaz dərəcədə geniş və çoxçeşidlidir. Elə ona görə də müasir təlimin əsas vəzifəsi şagirdlərə öyrənməyi öyrətmək, bilikləri sərbəst, müstəqil şəkildə əldə etməyə istiqamətləndirməkdir.

Dünya ölkələrinin təcrübəsindən aydın görünür ki, interaktiv təlim metodları təlimin keyfiyyətini artırmağa yönələn ən güclü vasitədir və bu metodlar dərsi şagirdlər üçün cəlbedici və maraqlı edir. Respublikamızda təhsil sahəsində mühüm layihələr həyata keçirilir. Bunlardan biri də təlim metodlarının tətbiqi layihəsidir ki, son dövrlərdə ölkəmizdə interaktiv dərslərin planlaşdırılması, hazırlanması üçün təcrübələr əldə edilmiş, ayrı-ayrı fənn müəllimlərində bu sahədə biliklər, bacarıqlar və vərdişlər formalaşdırılmağa başlanılmışdır. Lakin hələ də bu sahədə müəllimlər müəyyən problemlərlə üzləşirlər. Belə ki, yeniliklərin həyata keçirilməsi sahəsində təcrübələr çoxaldıqca yeni tədris materialına, metodik tövsiyələrə, yeni məlumat mənbələrinə ehtiyac yaranır. Onu da qeyd edək ki, əgər hər bir müəllim fəal təlimdən istifadə edərsə şagirdlərin idrak fəallığı və dərs zamanı əməkdaşlıq həvəsi yüksələr. Fəal təlim modelinə bunlar daxildir: təlimin məzmunu, üsulları, öyrədici mühit və qiymətləndirmə.

Nəyi öyrətmək deyəndə təlimin məzmunu, necə öyrətmək dedikdə təlimin metodları, hansı şəraitdə öyrətmək deyəndə öyrədici mühit, komponentlərin səmərəsini müəyyən edən amillərə uyğun olan nəticənin aşkarlanması dedikdə isə qiymətləndirmə nəzərdə tutulur. Şagirdlər interaktiv təlimin tamhüquqlu iştirakçısı olurlar və əldə etdikləri elmi bilikləri kəşflər və axtarışlar hesabına öyrənirlər.

Bir çox xüsusiyyətlər mövcuddur ki, onları ancaq fəal təlimə şamil edirlər. Bu xüsusiyyətlər aşağıdakılardır:

-şagird təfəkkürünün sərbəstliyi və müstəqilliyi;

- öyrənənlərin fəal öyrənmə mövqeyi;

- şagirdlər arasında əməkdaşlıq və sinifdə onların qarşılıqlı fəaliyyəti;

- əsas məqsədə çatmaq üçün şagirdlərin öyrəndikləri bilikləri yaradıcı şəkildə tətbiq etməyə.

İnteraktiv təlimin müəllimi dərsdə hər bir şagirdə fərdi yanaşdıqda, şagirdlərin istər maraq və qabiliyyətlərini, istərsə də bilik, bacarıq və vərdişlərinin inkişaf etdirilməsi üçün ən əlverişli metodlardan və müxtəlif informasiya texnologiyalarından istifadə etdikdə təlim prosesi daha maraqlı və səmərəli alınar.

**Problemin aktuallığı.** Təlim prosesinin müasirləşdirilməsi, ənənəvi təlim prosesindən interaktiv təlimə keçilməsi ümumtəhsil müəssisələrinin qarşısında ən aktual problem kimi dayanmışdır.

**Problemin elmi yeniliyi.** Müasir dövrdə təlim prosesində yeni konsepsiyalar tətbiq olunur. Buna görə də təlimin keyfiyyətinin yüksəldilməsi üçün artıq interaktiv metodlardan istifadə etmək zəruridir. Məqalədə interaktiv təlim metodlarının əhəmiyyəti qabarıq şəkildə verilmiş və bu sahədə əldə ediləcək uğurlar haqqında geniş məlumatlar verilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədə bəhs olunduğu kimi ümumtəhsil müəssisələrində təlim prosesinin düzgün qurulması üçün interaktiv təlim metodlarından istifadə edilməsi müəllimlərin dərsi daha maraqlı və günün tələbləri səviyyəsində qurmasına vəsilə olacaqdır.

**Ədəbiyyat:**

1. “Təhsildə innovasiyalar haqqında“ mövzusunda elmi-praktik konfransın materialları. 25 aprel 2014-cü il
2. Dəmirov A.H., Məmmədov S.M., İsmayılov Ş.N. Yeni təlim texnologiyaları və müasir dərs. -Bakı:– 2007, -109 s
3. Paşayev Ə.X., Rüstəmov F.A Pedaqoji innovasiyalar. Pedaqoji tədqiqatlar (elmi məqalələr məcmuəsi),- 2002, № 2-3

**E-mail:** a.ismayilxanova@gmail.com

**Rəyçilər:** *ped.elm.dok., prof.* **R.L. Hüseynzadə**
*ped.ü.fəls.dok., dos.* **H.A. Cəfərov**
**Redaksiyaya daxil olub:** 08.06.2022

*UOT 371*

***Lalə Kamal qızı Rəhimova***
*fəlsəfə doktoru proqramı üzrə doktorant,*
*Gəncə Dövlət Universitetinin müəllimi*
*https://orcid.org/0000-0002-7731-9728*

## PEŞƏ SƏRİŞTƏSİ ANLAYIŞININ MAHİYYƏTİNƏ DAİR

***Лала Камал гызы Рагимова***
*докторант по программе доктора философии,*
*преподаватель Гянджинского Государственного Университета*

## О СУТИ ПОНЯТИЯ ПРОФЕССИОНАЛЬНОЙ КОМПЕТЕНЦИИ

***Lala Kamal Rahimova***
*doctoral student in the program of doctor of philosophy,*
*teacher of Ganja State University*

## ON THE ESSENCE OF THE CONCEPT OF PROFESSIONAL COMPETENCE

**Xülasə.** Məqalədə peşə səriştəsi anlayışına müxtəlif yanaşmalar şərh edilir, bu anlayışın mahiyyəti izah edilir. Səriştə əsaslı yanaşma problemi üzrə tədqiqatların təhlili əsasında bu anlayışın formalaşmasının üç mərhələsi qeyd edilir. Məqalədə daha sonra peşə səriştəsi anlayışının əsas komponentləri, strukturu və təsnifatı araşdırılır.
***Açar sözlər:*** *səriştə, peşə səriştəsi, bacarıq, vərdiş, səviyyə, qiymətləndirmə*

**Резюме.** В статье рассматриваются разные подходы к понятию профессиональной компетенции, излагается суть этого понятия. В результате анализа исследований в этой области выделяются 3 этапа формирования данного понятия. Далее в статье анализируется классификация, структура и основные компоненты понятия профессиональной компетенции.
***Ключевые слова****: компетенция, профессиональная компетенция, умения, навыки, уровень, оценивание*

**Summary.** The article discusses different approaches to the concept of professional competence, outlines the essence of this concept. As a result of the analysis of research in this area, 3 stages of the formation of this concept are distinguished. Further, the article analyzes the classification, structure and main components of the concept of professional competence.
***Key words:*** *competence, professional competence, abilities, skills, level, assessment*

Ölkəmizdə üçpilləli ali təhsil sisteminə (bakalavr, magistr, doktorantura) keçid yeni təhsil standartlarının yaradılmasını aktuallaşdırdı. Bu keçid respublika ali təhsil müəssisələrinin Bolonya prosesinə qoşulmasını sürətləndirdi. Universitetlərdə kadr hazırlığına verilən tələblər səriştə əsaslı yanaşmanı zəruri edir. Bu yanaşmanın məqsədi təkcə savadlı məzun yetişdirmək yox, həmçinin universitet məzununu məhsuldar fəaliyyətə qadir, öz fəaliyyətinin nəticələrinə cavabdeh, özünüinkişafa hazır, yüksək səriştəli şəxs kimi formalaşdırmaq, peşə fəaliyyətinə hazırlamaqdır. Təhsil fəaliyyətinin nəticəsi kimi "səriştə" anlayışı yeni məktəb kurikulumunda da mühüm yer tutur. "Səriştə" anlayışı müxtəlif tədqiqatlarda araşdırma obyekti olmuşdur.

Ümumən "Səriştəlilik" anlayışı latın sözü olan "competentia" sözündən götürülmüşdür və "mühakimə etməyə səlahiyyətli", "danışmağa hüququ olmaq" mənalarını verir. Elə hal-hazırda da bu ifadə bir çox hallarda səriştə deyil, beynəlxalq terminə çevrilən "kompetensiya" kimi işlədilir (1).

Təhsilə səriştə əsaslı yanaşma konsepsiyasını tədqiq edən İ.A. Zimnyaya təhsil sisteminin müxtəlif səviyyələrində əsas sosial səriştələrin formalaşmasını araşdırır (4). O.E. Lebedev "səriştə əsaslı yanaşmanı təhsil məqsədlərinin müəyyən edilməsi, təhsil məzmunun seçilməsi, təhsil prosesinin təşkili və nəticələrinin qiymətləndirilməsi üçün ümumi prinsiplərin məcmusu kimi" müəyyən edir.

Səriştə əsaslı yanaşma problemi üzrə tədqiqatların təhlili əsasında bu anlayışın formalaşmasının üç mərhələsini qeyd etmək olar (N.V. Kuzmina, A.K. Markova, J. Raven, R. Uayt, N. Çomski və başqaları).

Səriştə əsaslı yanaşmanın formalaşmasında *birinci mərhələ* 1960-1970-ci illərə təsadüf edir. Bu dövrdə "səriştə" anlayışı N. Çomski (1965) tərəfindən elmi aparata daxil edilmişdir. Səriştəyə əsaslanan yanaşmanın inkişafının *ikinci mərhələsi* 1970-1990-cı illərə təsadüf edir. Bu mərhələdə "sosial səriştələr/bacarıqlar" anlayışının məzmunu işlənib hazırlanır. J. Raven (John Raven) öz tədqiqatında səriştə və onun növlərinin şərhini verir, sonradan bunları səriştələr kimi təqdim etmişdir. Onun "Müasir cəmiyyətdə səriştə" əsərində səriştə "sosial əhəmiyyətli sahədə həyat uğuru" kimi şərh olunur. Müəllif öz əsərində səriştələrin 39 növünü nəzərdən keçirir, onları "motivasiyalı qabiliyyətlər" kimi müəyyən edir. Bu, bütün dünyada səriştələrin konsepsiya və növlərinin şərhi problemlərinin fəal tədqiqinə stimul yaratdı. J. Raven səriştə səviyyəsi ilə insan fəaliyyətinin nəticəsi arasında əlaqəni araşdırır. Müəllifin fikrincə, səriştə insan fəaliyyətinin müxtəlif komponentlərinin səmərəli həyata keçirilməsi və əhəmiyyətli nəticələr əldə etməsi üçün qabiliyyət kimi çıxış edir.

Səriştələrin əsas komponentləri bunlardır: hadisə və situasiyaları təhlil etmək, əvvəlki təcrübəyə əsaslanmaq, gələcək maneələri görmək, təşəbbüskar olmaq və rəhbərlik bacarığı. Buradan belə nəticə çıxır ki, səriştə müstəqil komponentlər məcmusundan ibarətdir, insanın bir növ subyektiv xüsusiyyətləridir. Bu xüsusiyyət insan fəaliyyətinin müxtəlif istiqamətlərində özünü göstərə bilər. C. Raven insanın müəyyən peşə fəaliyyətində ehtiyac duyduğu bir sıra keyfiyyət və bacarıqları önə çəkir: müstəqil işləmək bacarığı; məsuliyyət daşımaq; təşəbbüs etmək; problemləri görməyə və həll etməyə hazır olmaq; yeni situasiyaları təhlil etmək bacarığı; əməkdaşlıq bacarığı; müstəqil bilik əldə etmək; əsaslandırılmış qərarlar qəbul etmək bacarığı və s.

Səriştəyə əsaslanan yanaşmanın inkişafının *üçüncü mərhələsində* təhsil sahəsində səriştələrin elmi konsepsiyası tədqiq edilir. YUNESKO-nun sənədləri və materialları təhsil nəticəsi kimi səriştələrin siyahısını əhatə edir. 1990-cı ildə A.K. Markova peşə səriştəsini əmək psixologiyası kontekstində tədqiq etməyi təklif edir. L.M. Mitina, öz növbəsində, pedaqoji səriştələri tədqiq etmişdir (5). Onun tədqiqatlarından belə məlum olur ki, səriştə - bilik və bacarıqlar kompleksindən, bunların təlimində tətbiqi yollarından, üsul və vasitələrindən ibarətdir. Müəlliflər hesab edirlər ki, səriştəlilik tələbənin daha məlumatlı olduğu, təhsil almağa hazır olduğu fənn sahəsi ilə müəyyən edilir. Səriştə bakalavrın peşə fəaliyyətini həyata keçirməyə hazır olmasının nəticəsi olub, onun mühüm peşə keyfiyyətlərinin sintezidir. Təhsildə bacarıqlara əsaslanan yanaşmanın tətbiqi 2000-ci ildən etibarən daha geniş yayılmışdır.

"Səriştə" anlayışına tədqiqatçılar aşağıdakıları aid edir: davranış, idrak, əməliyyat, texnologiya, motivasiya, sosial, etik komponentlər, təlim nəticələri və s. Şəriştəyə əsaslanan yanaşmaya həsr olunmuş tədqiqatlarda "səriştə" anlayışının ümumi qəbul edilmiş tərifi yoxdur. Pedaqoji elmlərdə tələbə "səriştələrinin" şərhi ilə bağlı məsələlər hələ də müzakirə olunmaqdadır. Bu, normativ sənədlərdə səriştə əsaslı yanaşmanın dəqiq müəyyən edilmiş təhsil nəticəsinin olmaması ilə bağlıdır. Bəzi sənədlərdə o, əsas səriştələr toplusu kimi təqdim edilir. Digərlərində isə universal bilik, bacarıq, həyat təcrübəsi və məsuliyyətin vahid sistemi kimi müəyyən edilir. Yəni, "səriştə" bilik və təcrübəyə əsaslanır, nəticə əldə etməyə imkan verən bilik və bacarıqların tətbiqinin yaradıcı təzahürüdür. Başqa sözlə, "səriştə" universitetdə formalaşmış, peşəkar fəaliyyəti təmin etməyə imkan verən bilik, bacarıq və fəaliyyət metodlarının məcmusudur. Səriştəyə əsaslanan yanaşmanın əsas elementi təhsilin məzmun və keyfiyyətcə əsas səriştələr əsasında yenilənməsidir.

Ümumtəhsil məktəbi şagirdlərinin müstəqil fəaliyyət təcrübəsi və şəxsi məsuliyyəti, əsas səriştələr, yeni universal bilik, bacarıq və onların sistemini formalaşdırmalıdır. Tədqiqatlarda

unemployment is increasing, the number of people subjected to mobbing has also increased due to this, it has been proven by scientific research. In the article, behaviors that can be considered mobbing, which are among the main socio-psychological problems of today, are analyzed, the main aspects and classification of these behaviors are analyzed.

***Key words:*** *mobbing, enterprises, mobbing behavior, psychological pressure in the workplace*

Mobbinq, güc fərqinə əsaslanaraq sistemli, əvvəlcədən düşünülmüş və davamlı olaraq qarşı tərəfi qorxutmaq, şəxsiyyətini alçaltmaq və qurumda insanlar arasında mobbinq obyekti olan insana qarşı mənfi münasibət, nifrət yaratmaq, kollektivdən təcrid etmək, tənhalaşdırmaq, yoxmuş kimi davranmaq və buna bənzər davranışları əhatə edən psixoloji təzyiq mexanizmi olaraq ifadə edilə bilər.

Heinz Leymann mobbinq davranışlarını 5 fərqli qrupda 45 davranış olaraq müəyyənləşdirmişdir. Leymann tərəfindən səciyyələndirilən mobbinq davranışları əsasən bunlardır:

- *Birinci qrup:* insanın kollektiv içində ünsiyyətini və özünü ifadə etməsini məhdudlaşdıran davranışlar müşahidə edilir;
- *İkinci qrup:* insanın kollektiv içindəki sosial münasibətlərinə mane olmaq kimi davranışları mövcud olur;
- *Üçüncü qrup:* insanın kollektiv içərisində nüfuzuna xələl gətirən davranışlar özünü göstərir;
- *Dördüncü qrup*: İnsanın həyat şəraiti və peşə statusuna mənfi təsir göstərən davranışlar müşahidə edilir;
- *Beşinci qrup:* insanın fiziki və psixi sağlamlığına birbaşa təsir edən davranışlar mövcud olur (1, s.17-19).

Hər hansı bir müəssisədə çalışan bir işçinin yuxarıdakı davranışlardan hər hansı birinə və ya hamısına məruz qalması, həmin şəxsin yaşadıqlarını mobbinq olaraq ifadə etməsi üçün kifayət deyil. Bu davranışların sistemli şəkildə davamlı olaraq baş verməsi mobbinqin əsas şərtlərindən biridir. Bundan əlavə, bu davranışlara məruz qalan şəxsin bu təsirlərin qarşısını almaqda gücsüz və çarəsiz olması, özünü müdafiə edə bilməməsi başqa bir şərt olaraq göstərilir.

Einarsen və Skoqstad mobbinqi son altı ay ərzində baş verən həftədə bir dəfə və ya arada bir təkrarlanan davranış kimi qeyd edir. Leymanna görə də davranış həftədə bir dəfə təkrarlanmalı və ən azı altı ay davam etməlidir. (2, s.33-51.)

Gündəlik həyatda mobbinqin çox tez-tez baş verdiyini qeyd edən Leymann, belə bir vəziyyətin mütəmadi olaraq ortaya çıxmasının mobbinqə məruz qalan insana psixoloji, sosial və hətta fizioloji zərər verəcəyini bildirmişdir. Buna görə də, əsas olan mobbinq qurbanına mənfi təsir göstərən davranışın mahiyyəti deyil, bu davranışların tezliyidir. Mahiyyətcə məqsədli edilməyən bir davranış kimi görünən bu davranışlar sistemli və qəsdən təkrar edildikdə mobbinq qurbanı olan insan üçün təhlükə yaradır.

Mütəxəssislər mobbinq davranışlarına daxil olan əsas davranışları aşağıdakı kimi müəyyənləşdirmişlər:

*Birinci qrup: İnsanın ünsiyyətini və özünüifadəsini məhdudlaşdıran davranışlar.* Aşağıdakı davranışlar bu kateqoriyaya daxildir:

1. Şəxsin özünü ifadə etmək imkanı rəhbər tərəfindən məhdudlaşdırılır.
2. İnsanın sözü daim kəsilir.
3. Özünü ifadə etmək imkanları həmkarları tərəfindən məhdudlaşdırılır.
4. İnsan qurumda davamlı olaraq danlanır və onunla yüksək səslə, alçaldıcı tonda danışılır.
5. İnsan daima fəaliyyətinə görə tənqid olunur.
6. İnsanın şəxsi həyatı daim kollektiv üzvləri tərəfindən tənqid olunur.
7. İnsan telefonla narahat edilir.
8. İnsan sözlü hədələrə məruz qalır.
9. Həmin şəxsi hədələmək məqsədi ilə yazılı mesajları göndərilir.

*İkinci Qrup: İnsanı sosial təcridə yönələn davranışlar.* Mobbinqdə əsas məqsəd insana psixoloji təzyiq göstərərək iş yerindən uzaqlaşdırmaqdır. Təzyiqlərdən yorulan zərərçəkmiş ya haqlı olaraq öz istəyi ilə işindən ayrılır, ya da məcbur işdən çıxarılır. Bu kateqoriyaya aşağıdakı davranışlar daxildir:

1. İnsanın ətrafındakı insanlar artıq onunla danışmamağa başlayır.
2. Şəxsin heç kimlə danışmasına və görüşməsinə icazə verilmir.
3. İnsan digər işçilərdən təcrid olunaraq ayrı bir yerdə işləməyə məcbur edilir.

4. Şəxsin həmkarları ilə danışması qadağan edilir.

5. İnsana sanki o yoxmuş kimi davranılır, onun hüquqlarına və şəxsiyyətinə hörmət edilmir.

*Üçüncü qrup: İnsanın qurum içindəki nüfuzuna xələl gətirən davranışlar.* İnsan mobbinq tətbiq edən şəxs tərəfindən müxtəlif münasibət və davranışlarla kollektiv içərisində utandırılır, daim ələ salınır və alçaldılır. Bu kateqoriyaya aşağıdakı davranışlar daxildir:

1. İnsanın arxasınca mənfi fikirlər söylənilir.

2. Onun haqqında əsassız söz-söhbətlər yayılır.

3. Gülünc vəziyyətə salınaraq məsxərəyə qoyulur.

4. İnsana ruhi xəstəymiş kimi davranırlar.

5. Onu psixoloji müayinədən keçməyə məcbur edirlər.

6. İnsanın hər hansı bir vəziyyətdə üzr istəməsinə istehza ilə yanaşılır.

7. Yerişi və səsi təqlid edilərək məsxərəyə qoyulur.

8. Şəxsin siyasi baxışları və ya dini inancı məsxərəyə qoyulur.

9. Şəxsi həyatı gülüş obyekti olur.

10. İnsanın milliyyəti ələ salınır.

11. Özünə güvəninə mənfi təsir edəcək işlə məşğul olmağa məcbur edilir.

12. İnsanın səyi və uğuru haqsız olaraq mühakimə olunur.

13. İnsanın qərarları daim mühakimə edilir.

14. Şəxs aşağılayıcı adlarla çağırılır.

*Dördüncü qrup: İnsanın peşəkarlığına qarşı yönələn davranışlar.* Mobbinq prosesində ümumiyyətlə işçilərin şəxsiyyətinə, etibarlılığına və peşəkarlığına məqsədli hücumlar başlayır.

Mobbinqdə insanların peşə bacarıqlarını, imicini və qabiliyyətini alçaldan davranışlar mövcuddur. Bütün bunlar insana olan inamın itməsinə səbəb olur. Bu vəziyyət insanın peşəkarlığına qarşı kollektivdə şübhə yaradır və onun ətrafındakı insanlarda ona qarşı inamsızlıq meydana gətirir. Hər hansı bir qurumda insana qarşı meydana gələn güvənsizlik insanı və onun işini dəyərsiz edir. Bu isə öz növbəsində şəxsin özünüqiymətləndirməsinin aşağı düşməsinə səbəb olur. Bu kateqoriyaya aşağıdakı davranışlar daxildir:

1. İnsana önəmli tapşırıqlar və vəzifələr verilmir.

2. Ona verilən tapşırıqlar geri alınır və şəxsin vəzifələri məhdudlaşdırılır.

3. İnsan mənasız işlərə məcbur edilir.

4. Qabiliyyətindən aşağı olan tapşırıqlar verilir.

5. İnsanın işi daima dəyişdirilir.

6. Onun özünə inamına mənfi təsir edən işlər verilir.

7. İnsana nüfuzunu aşağı salan işlər tapşırılır.

*Beşinci qrup: Sağlamlığa birbaşa təsir edən davranışlar.* Mobbinqə məruz qalan insan ən çox emosional, fizioloji və psixoloji təsirlərlə qarşılaşır. Psixoloji sarsıntıların səbəb olduğu fizioloji problemlər və xəstəliklər insanı daha da çətin vəziyyətə salır. Bu kateqoriyaya aşağıdakı davranışlar daxildir:

1. İnsan fiziki olaraq ağır işləri görməyə məcbur edilir.

2. Ona fiziki zorakılıq tətbiq edilir.

3. Şəxs qorxudulur.

4. İnsana fiziki olaraq ziyan vurulur.

Bu davranışların hamısı mobbinq hadisəsində özünü göstərməyə bilər. Əsasən bu davranışların sistemli və davamlı şəkildə həyata keçirilməsinə diqqət yetirilməlidir. Çünki iş həyatında insanlar bir çox hallarda yuxarıda bəhs edilən davranışlarla qarşılaşırlar. Əsas odur ki, bu davranışlar qəsdən və davamlı olaraq edilsin.

Mobbinq ixtisas hazırlığı, yaş, irq, cins, inanc, milliyyət və ya başqa hər hansı bir səbəbdən qurban kimi seçilən şəxsin narahat edilməsi ilə başlayan və zorakılığı getdikcə artan sistemli bir prosesdir.

**Problemin aktuallığı.** Mobbinq işçilərdə ağır fiziki və psixoloji problemlərə səbəb olan və nəticələri həm müəssisəyə, həm də bütövlükdə cəmiyyətə təsir edən vacib sosial-psixoloji problemlərindən biridir. Bunun üçün də mobbinq davranışları ilə bağlı düzgün diaqnozun qoyulması və bu problemlə mübarizə yollarının axtarılması həm müəssisədə işçilərin və həm də qurumun məhsuldarlığı və səmərəli fəaliyyəti baxımından mühüm rol oynayır.

**Problemin elmi yeniliyi.** Məqalədə qurumlarda mobbinq hesab edilə biləcək davranışların sosial-psixoloji təhlili verilmiş, elmi-nəzəri mənbələr əsasında elmi ümumiləşdirmələr aparılmışdır. Bu elmi ümumiləşdirmlər əsasında problemin təhlil edilməsi elmi yeniliyi müəyyən edir.

**Problemin praktik əhəmiyyəti.** Məqalədən psixoloqlar, müəssisə və qurumlarda rəhbər vəzifələrdə çalışanlar, eyni zamanda idarəetmə və menecment psixologiyası sahəsində mütəxəssislər və geniş ictimaiyyət faydalanmaqla müasir dövrdə hər hansı bir qurumda istər rəhbərlə işçi, istərsə də işçi-işçi arasında olan mobbinq probleminin sosial-psixoloji təhlili ilə bağlı ümumi qanunauyğunluqlar haqqında məlumat əldə edərək bu problemi yaşayan insanlara gərəkli yardım göstərmə imkanına sahib olarlar.

**Ədəbiyyat:**


1. Davenport, N., Schwartz, R.D., Elliott, G.P. Mobbing: İşyerinde Duygusal Taciz. (Çeviri: Osman Cem Önertoy). -İstanbul: Sistem Yayıncılık, -2003.
2. Helen Cowie, et. al., “Measuring Workplace Bullying”, Agression and Violent Behavior, 7, -2002
3. Криста Колодей. Моббинг. Психотеррор на рабочем месте и в школе. -Москва: Издательство Гуманитарный центр, -2021.
4. Pelit, N. ve Pelit, E. Mobbing ve Örgütsel Sinizm (Teori-Süreç ve Örgütlere Yansımaları) . -Ankara: Detay Yayıncılık, -2014.
5. Seyidov, S.İ. Menecmentin psixologiyası. / S.İ. Seyidov. -Bakı, -2011.
6. Tutar, H. Mobbing (Nedenleri ve Başa Çıkma Stratejileri; Kuramsal Yaklaşım). -Ankara: Detay Yayınları, -2015.
7. Yusifov, E. Konfliktologiya. / E. Yusifov, M. Ramazanov.-Bakı, -2018.


**E-mail:** solmazhasanli@hotmail.com
**Rəyçilər:** *psixol.elm.dok., prof.* **R.İ. Əliyev,**
*psixol.ü.fəls.dok.* **R.T. Rzayeva**
**Redaksiyaya daxil olub:** 23.01.2023.

*UOT 159.9*

***Adilə Ağaməmməd qızı Mürsəlova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin müəllimi*
ORCID 0000-0002-6190-4201

# SAĞLAMLIQ İMKANLARI MƏHDUD UŞAQLAR ÜÇÜN XÜSUSİ (KORREKSİYA) MƏKTƏBLƏRDƏ NİTQİN İNKİŞAFI ÜZRƏ KOMPLEKS İŞİN TƏŞKİLİ

***Адиля Агамамед гызы Мурсалова***
*преподаватель Азербайджанского Государственного Педагогического Университета*

# ОРГАНИЗАЦИЯ КОМПЛЕКСНОЙ РАБОТЫ ПО РАЗВИТИЮ РЕЧИ В СПЕЦИАЛЬНЫХ (КОРРЕКЦИОННЫХ) ШКОЛАХ ДЛЯ ДЕТЕЙ С ОГРАНИЧЕННЫМИ ВОЗМОЖНОСТЯМИ ЗДОРОВЬЯ

***Adila Aqamammad Mursalova***
*teacher at Azerbaijan State Pedagogikal University*

# ORGANIZATION OF COMPLEX WORK ON THE DEVELOPMENT OF SPEECH IN SPECIAL (CORRECTIONAL) SCHOOLS FOR CHILDREN WITH LIMITED HEALTH OPPORTUNITIES

**Xülasə.** Sağlamlıq imkanları məhdud uşaqlar xüsusi (korreksiyaedici) təhsilə və tərbiyəyə ehtiyacı olan, psixo-fiziki inkişafında geriləmə və zəifliyi olan uşaqlardır. Bu uşaqların əsas kateqoriyalarına: əqli gerilikli, psixi inkişaf ləngliyi, eşitmə, görmə, dayaq-hərəkət aparatı çatışmazlıqları olan, həmçinin nitq pozulmaları, emosional-iradi, hərəkət sahə, mürəkkəb inkişaf və davranış pozulmaları olan, ağır xroniki somatofiziki xəstəlikli uşaqlar da daxildir.

***Açar sözlər:*** *əqli gerilik, inkişaf pozulmaları, nitq patologiyaları, eşitmə və görmə pozulmaları, nitq fəaliyyəti*

**Резюме.** Дети с ограниченными возможностями здоровья – это дети, нуждающиеся в специальном (коррекционном) обучении и воспитании, имеющие задержку и недоразвитие в психофизическом развитии. К основным категориям этих детей относятся: дети с умственной отсталостью, задержкой психического развития, с нарушениями слуха, зрения, опорно-двигательного аппарата, а также с нарушениями речи, эмоционально-волевыми нарушениями, двигательными нарушениями, комплексными нарушениями развития и поведения, дети с тяжелыми хроническими соматофизическими нарушениями.

***Ключевые слова:*** *умственная отсталость, нарушения развития, речевые патологии, нарушения слуха и зрения, речевая деятельность*

**Summary.** Children with disabilities are children who need special (correctional) education and upbringing, who have a delay and underdevelopment in psychophysical development. The main categories of these children include: children with mental retardation, mental retardation, hearing, vision, musculoskeletal disorders, as well as speech disorders, emotional-volitional disorders, movement disorders, complex developmental and behavioral disorders, children with severe chronic somatophysical disorders.

***Key words:*** *mental retardation, developmental disorders, speech pathologies, hearing and vision disorders, speech activity*

Birincili inkişaf pozulmalarının təbiəti və ağırlığından asılı olaraq orqanizmin üzv və sistemlərinin işini məhdudlaşdıran ikincili törəmə nəticələri, xüsusi korreksiya -kompensasiya işinin aparılmasını tələb edir.

Müasir tədqiqatçıların əsərlərində, nitqin norma və patologiyasında eyni formalaşma qanunauyğunluqlarının olmasına baxmayaraq, sağlamlıq imkanları məhdud uşaqlarda onun aşağıdakı bir sıra xüsusiyyətləri fərqləndirilir:

- bu uşaqların əksəriyyətində nitq inkişafının müddətində kənaraçıxmalar və bu prosesin özünəməxsus inkişafı qeyd edilir;

- sağlam həmyaşıdları ilə müqayisədə onlarda müxtəlif nitq inkişaf pozuntuları nisbətən daha çox rast gəlinir;

- nitq inkişaf pozulmaları, o cümlədən onun mürəkkəb formaları olan uşaqların sayı durmadan artır.

- onların əksəriyyətində informasiyanı qəbul etmək və onu emal etmək bacarığının pozulması ilə bağlı nitq çatışmazlıqları üstünlük təşkil edir.

Qeyd etmək lazımdır ki, nitq inkişafındakı gerilik bu uşaqlarda körpəlikdən başlayır və erkən uşaqlıqda daha artmaqda davam edir. {1} Nitq inkişafının bu cür formalaşması ətraf mühitə maraq, emosional-iradi sahə, xüsusilə də böyüklərlə emosional ünsiyyətin, fonematik eşitmənin formalaşmamasını və artikulyasiya aparatının inkişafsızlığını şərtləndirir.

Bu uşaqlarda nitq fəaliyyətinin pozulmaları müxtəlif və çoxşaxəli olur. Pozulmalar müxtəlif inkişaf çatışmazlığı növləri kimi: əqli gerilik, psixi inkişafın ləngliyi, uşaq serebral iflici, eşitmə, görmə qüsurları, nitqi qüsurlu uşaqlarda məhdud kommunikativ vərdiş və bacarıqların formalaşmaması zamanı sosial-psixoloji laqeydlik, emosional deprivasiya kimi təzahür edə bilər.

İnkişaf qüsurları zamanı uşaqlarda nitq fəaliyyətinin pozulması onların psixi inkişafının ümumi qanunauyğunluğunu təşkil edir. Bu qanunauyğunluğun mahiyyəti ondan ibarətdir ki, əgər lazımi korreksiya tədbirləri aparılmazsa, o zaman uşağın nitqli ünsiyyəti və sosial mühitlə qarşılıqlı əlaqə və qarşılıqlı fəaliyyəti pozulur, onun ətraf aləm haqqında təsəvvür dairəsi, informasiyanı qəbul və emal etmək bacarığı məhdudlaşır, baş verən sosial adaptasiya çətinlikləri uşağın ümumi psixi inkişafına mənfi təsir göstərir. Bununla yanaşı, nitq pozulmaları sağlamlıq imkanları məhdud uşaqlarda şəxsiyyətin formalaşmasına bu və ya digər dərəcədə təsir göstərir. Təbii ki, nitq pozğunluğu zamanı uşağın ümumi psixoloji və şəxsiyyət kimi inkişafının və ayrı-ayrı funksiyalarının pozulma dərəcəsi eyni ola bilməz və bu daha çox mövcud qüsurun təbiətindən ayrı-ayrı psixi proses və funksiyaların pozulmalarının ifadəliliyindən, tibbi-pedaqoji təsirin səmərəliliyi, uşağın həyat şəraiti, tərbiyə və bir sıra digər amillərdən asılıdır. Buna görə də nitq funksiyaları pozulmuş uşaqların əksəriyyəti üçün ən vacib şərtlər: nitq pozulmalarının səbəblərini erkən müəyyən edilməsi, nitqin formalaşmasında maneələrin aradan qaldırılması və uşaq şəxsiyyətinin formalaşdırılması üçün daha əlverişli imkanların yaradılması, vaxtında korreksiya, inkişaf sosial reabilitasiya və adaptasiya yardımının təşkil edilməsidir (2).

Sağlamlıq imkanları məhdud uşaqlarda nitq pozulmaları onların sosial adaptasiyasında və ətrafdakı insanlarla qarşılıqlı münasibət qurmasında əlavə çətinliklər yaradır. Lakin bu, çətinliklərin aşılmaz olduğu anlamına gəlmir.

Qüsurların fərqli təbiətinə baxmayaraq, bu uşaqlarda nitq fəaliyyətinin sistemli pozulmalarının mövcud tipik təzahürləri müşahidə olunur. Əsas aparıcı əlamətlərdən biri nitqin çox gec meydana çıxmasıdır. Belə ki, uşaqların əksəriyyətində 3-4, bəzən isə 5 yaşlılarda ilk sözlərin yaranması müşahidə olunur və bu sözlər qrammatik və fonetik cəhətdən kifayət qədər formalaşmamış olur. Nitq inkişafsızlığının ən qabarıq göstəricisi ilk baxışda müraciət edilən, ünvanlanan nitqin nisbətən yaxşı anlaşılması ilə ziddiyyət təşkil edən ekspressiv nitqin geriliyidir. Sağlamlıq imkanları məhdud uşaqların nitqi ətrafdakılar üçün az anlaşılan olur. Lakin uşaqlar öz nitqlərinə tənqidi yanaşa bilirlər. Uşaqlarda yaşla bağlı nitq fəaliyyətinın fəallığı xüsusi təlim olmadan, kəskin şəkildə aşağı düşməsi müşahidə olunur.

Nitq fəaliyyətinin inkişafsızlığı sağlamlıq imkanları məhdud uşaqlarda intellektual, sensor və emosional-iradi sahələrin formalaşmasına da mənfi təsir göstərir.

Diqqətin qeyri-kafi sabitliyi, onun paylanma imkanlarının məhdudluğu qeyd olunur. Semantik, məntiqi hafizənin nisbətən mühafizəsi fonunda uşaqlarda verbal hafizənin aşağı olması, yaddasaxlamanın məhdudluğunu şərtləndirir. Uşaqlar çətin, mürəkkəb təlimatları, tapşırıqların element və ardıcıllığını unudur, yadasalmada əziyyət çəkirlər.

Sağlamlıq imkanları məhdud uşaqlarda idrak fəaliyyətinin pozulmaları ilə nitq inkişafının çatışmazlıqları arasında qarşılıqlı əlaqənin olması, onların əksəriyyətində dərketmənin spesifik xüsusiyyətlərini şərtləndirmiş olur. Nitqin pozulmaları təfəkkürün özünəməxsusluğunu təyin edir. Belə ki, uşaqlar bütövlükdə yaşlarına uyğun fikri əməliyyatları mənimsəmək üçün lazımı imkanlara malik olsalar da, onlar sözlü-məntiqi təfəkkürün inkişafında geri qalır, xüsusi təlim almadan təhlil və tərkib, müqayisə və ümumiləşdirmə əməliyyatlarını çətinliklə mənimsəyirlər (2).

Sağlamlıq imkanları məhdud uşaqlarda ümumi somatik zəifliklə yanaşı, həm də hərəkətlərin pis koordinasiya olunması, dozalaşdırılmış hərəkətlərin yerinə yetirilməsində qeyri - müəyyənlik, hərəkət sürəti və çevikliyinin azalması kimi hərəkət sahəsinin inkişafında bir qədər geriləmələrlə xarakterizə olunurlar. Ən böyük çətinliklər sözlü təlimatlara uyğun hərəkətlərin icrası zamanı meydana çıxır.

Xüsusi təhsil müəssisələrində nitqin inkişafı üzrə məşğələlərin əsas vəzifələri sağlamlıq imkanları məhdud uşaqlarda səs nitq mədəniyyətinin tərbiyəsi, lüğətin zənginləşdirilməsi, möhkəmləndirilməsi və aktivləşdirilməsi, nitqin qrammatik cəhətdən düzgün tərtibinin təkmilləşdirilməsi, danışıq nitqinin formalaşdırılması, nitqin bədii inkişafına marağın artırılmasıdır.

Sağlamlıq imkanları məhdud uşaqların xüsusi təhsil ehtiyacları fərqlidir və yaşından, təbiətindən, ilkin sağlamlıq pozulmaların strukturundan ağırlıq və çox vaxt onların nəticələrindən asılıdır. Bununla yanaşı, onların xüsusi pedaqoji təsir metodlarından istifadənin obyektiv ehtiyacını təyin edən iştirakçılardan da çox asılıdır.

Xüsusi təhsil müəssisələrində psixi inkişafın mahiyyəti, şəxsiyyətin formalaşmasında intellektual və emosional amillərin psixoloji bütövlüyü, xüsusiyyətləri və spesifikliyi, intellektual, sensor, motor və digər pozulmaların təsiri altında psixikanın formalaşması, insanın psixi inkişafında təlimin aparıcı rolu haqqında müasir baxışlar nəzərə alınmaqla korreksiya və pedaqoji prosesin məzmun və məqsədləri müəyyən olunur (3).

Xüsusi təhsil: pedaqoji texnologiyaları bilən müəllimlər, dərslik, tədris vasitələri, didaktik və əyani materiallarla, ünsiyyət vasitələrinin inkişafı üçün metod və metodika, kollektiv və fərdi istifadə üçün texniki tədris vasitələri ilə sağlamlıq imkanları məhdud uşaqların təhsil proqramını mənimsəməsinə imkan verən psixoloji, tibbi, sosial xidmətləri göstərilir.

Sağlamlıq imkanları məhdud uşaqlarda nitqin inkişafı, nitq vərdiş və bacarıqları üzrə iş təlim sisteminin əsas həlqələrindən biri olaraq, korreksiya məktəblərində praktiki olaraq bütün dərslərdə həyata keçirilir. Buna görə də bu kateqoriyaya aid olan uşaqlarda nitqin inkişafı xüsusi (korreksiya) məktəblərində bütün tədris fənlərinin təlimi prosesində həll edilməli ən vacib vəzifələrdən biridir. Sağlamlıq imkanları məhdud uşaqların nitq inkişafına bu qədər diqqətin yetirilməsi heç də təsadüfi deyildir. Müxtəlif nitq pozğunluqlarının aradan qaldırılması üzrə iş zamanı məktəblilərdə nitq vərdiş və bacarıqlarının formalaşdırılması ilə eyni vaxtda onların idrak qabiliyyətləri inkişaf etdirilir, psixi funksiyaları təkmilləşdirilir. Bütün tədris fənləri materiallarının mənimsəmənin müvəffəqiyyəti, ümumi inkişaf dərəcəsi sağlamlıq imkanları məhdud uşaqlarda nitqin nə qədər formalaşdırılmasından asılıdır. İnsan fəaliyyətinin planlaşdırılması və tənzimlənməsi vasitəsi olaraq nitq uşağın davranışının formalaşmasına da təsir edir, peşə və əmək bacarıqlarının daha mükəmməl mənimsənilməsinə kömək edirək sosiallaşmasına çox böyük töhfə verir.

Sağlamlıq imkanları məhdud uşaqların xüsusi məktəbdə, tədris fənlərinin təlimi, xüsusilə də, texnologiya dərslərində nitqinin inkişafı üzrə iş aşağıda qeyd olunan vəzifələrin həyata keçirilməsini əhatə edir:

- şagirdlərin nitqini inkişaf etdirmək;
- nitq qüsurlarını aradan qaldırmaq və ünsiyyət bacarıqlarını əmək prosesində tətbiq etmək;
- lüğəti konkretləşdirmək, zənginləşdirmək və aktivləşdirmək;
- şifahi nitqin dialoji və monoloji formalarının, qrammatik cəhətdən düzgün, rabitəli cümlələri qurmaq bacarığının inkişafı;
- mövcud nitq nöqsanlarının korreksiyası və fikrin şifahi və yazılı şəkildə ardıcıl və məntiqi şəkildə ifadə etmək bacarığını inkişaf etdirmək (3).

Sadalanan bütün vəzifələr bir-biri ilə qarşılıqlı əlaqədə və kollektiv şəkildə həll olunur. Bu, hər bir nitq vahidi (səs, söz, cümlə, mətn)

ilk növbədə ünsiyyət prosesində reallaşması ilə bağlıdır.

Beləliklə də, xüsusi məktəb şəraitində sağlamlıq imkanları məhdud uşaqlarda nitqin inkişafı bir sıra fənlərin tədrisində aktuallıq təşkil edir.

Məktəbdə tədris olunan ana dili dərsləri bütün tədris, təlim və tərbiyə iş sistemində böyük əhəmiyyətə malikdir. Ana dilinin oxu, nitq inkişafı və qrammatika kimi ayrı-ayrılıqda tədrisi şagirdlərin ümumi inkişafını, ətraf aləm haqqında dünyagörüşünü nəzərə çarpacaq dərəcədə genişləndirməklə yanaşı, həm də doğma dilin semantik, leksik, fonetik qrammatik qanunlarını mənimsəməkdə müstəsna rol oynayır. Uşaqlar insanlar, onların həyat tərzi, fəaliyyəti, təbiət haqqında bilik, bacarıq və vərdişlər əldə edirlər.

Oxu prosesində yeni sözlərlə tanışlıq, onların mənaları, tətbiq üsulları izah edilir və istifadəsi üçün şərait yaradılır. Bundan əlavə, oxu dərsləri uşaqlarda şifahi nitqin ardıcıl inkişafına kömək edir, lüğət üzərində iş prosesində artıq məlum olan sözlərin mənaları genişlənir və təkmilləşir, oxunan mətni ardıcıl şəkildə təqdim etmək bacarığı ildən-ilə yaxşılaşır. Qrammatikanın öyrənilməsi rabitəli nitqin inkişafına təkan verir. Uşaqlarda danışıq səslərinin formalaşması, düzgün tələffüz vərdişlərinin yaranması, heca, söz və cümlə qurmaq onlar arasında qrammatik əlaqələr qurmaqla müstəqil nitq bacarıqlarına yiyələnmə həyata keçirilir.

Ana dili dərslərində şagirdlərin nitqini aktivləşdirmə üsulları: təqdim edilən mövzu və ya şəkil üzrə nəqletmə, sual-cavab, şəkillərdən istifadə etməklə nitqin planlaşdırılması, kitab üzrə iş zamanı oxu və yazı vərdişlərinin inkişafı, uşaqlarda müstəqil, sərbəst nitqin formalaşdırılması həyata keçirilir.

Beləliklə də ana dili dərsləri uşaqlarda ardıcıl şifahi nitqin inkişafına, yazı vərdişlərinin yaranmasına və möhkəmlənməsinə kömək edir. Uşaqlarda oxunmuş mətnin ardıcıl təqdimat bacarığı ildən-ilə təkmilləşir.

Riyaziyyat dərslərində müəllim şagirdlərin riyazi nitqinin inkişaf etdirilməsi, onun riyazi lüğətinin (riyazi terminlər, ifadələrlə) zənginləşdirməsi üzrə də iş aparır. Müşahidələr göstərir ki, riyazi nitqin dəqiqliyi, konkret və lakonikliyi riyazi anlayışların inkişafına müsbət təsir göstərir və bir məsələnin, nümunənin həlli yolunu yazmaq (nəqletmək) bacarığının formalaşmasına, riyazi əməliyyatların şüurlu olaraq yerinə yetirilməsinə kömək edir. Müəllim riyaziyyat dərslərində sağlamlıq imkanları məhdud uşaqların nitqinə ciddi diqqət yetirib riyazi misal və məsələlərin həllinin düzgünlüyünü qiymətləndirməklə yanaşı, həm də, tələffüzə, oxu və yazının savadlılığına, fikrini ifadə edərkən düzgün cümlə qurmaq bacarığını, rəqəmlərin, riyazi termin və anlayışların ifadə tərzini də dəyərləndirir. Riyaziyyat dərsində müəllim uşaqlarda səs tələffüzünün düzgünlüyünə diqqət yetirməli və loqopedlə əlaqəsi olmalı, tələffüz, nitq çatışmazlığının korreksiyasına yönəldilmiş loqopedin işini nəzərə almalı, qoyulmuş səslərin avtomatlaşdırılmasına çalışmalıdır.

Nitqin inkişafında təsviri sənət dərsləri də istisna deyil. Bu dərslər əyləncəli və ifadəli olduqları üçün uşaqlarda artan maraq oyadır və öz-özünə nitq fəaliyyətini stimullaşdırır. Rəsm dərsləri digər tədris fənləri ilə birgə uşaq şəxsiyyətinin, onun nitqinin formalaşmasına uğurlu təsir göstərir.

Xüsusi məktəbdə əmək təlimi dərsləri bütün tədris və tərbiyə iş sistemində çox böyük əhəmiyyətə malikdir. Uşaqların əmək təlimi onların əlçatan əmək fəaliyyətlərinə cəlb edilməsini və onlarda böyüklərin əməyinə emosional pozitiv münasibətin formalaşmasını nəzərdə tutur. Əmək tərbiyəsinin əsas vəzifəsi uşaqlarda vicdanla işləmək ehtiyacını formalaşdırmaq, istehsalda iştirak etmək üçün zəruri olan əmək vərdişlərinə və istehsalat təcrübəsini mənimsəməyə kömək etməkdir. Əmək bütövlükdə uşağın tərbiyəsinə: onun əqli, fiziki, əxlaqi və estetik inkişafına təsir göstərir. Əmək təlimi sayəsində uşaqlarda fikir dairəsi genişlənir, idrak qabiliyyətləri təkmilləşdirilir, müqayisə, təhlil və tərkib, ümumiləşdirmə, konkretləşdirmə kimi təfəkkür fəaliyyətinin əsas prosesləri formalaşır. Əmək tərbiyəsi prosesində uşaqlarda əməyin gözəlliyini və dəyişdirici gücünü dərk etmək və hiss etmək, gözəl şeylər yaratmaq bacarığı formalaşır. Uşaqların işi üçün uyğun şərait yaradılsa, estetik tərbiyədə uğur əldə edilə bilər. Əməyin düzgün təşkili şagirdlərin bədən tərbiyəsinə də kömək edir: qolların, çiyinlərin və ayaqların əzələləri inkişaf edir, düzgün qamət, yeriş inkişaf edir; bütövlükdə bədən güclənir və nəhayət, əmək yüksək əxlaqi keyfiyyətlərin formalaşması pro-

sesində ən mühüm amil kimi uşaqlarda əməyə hörmət, onun ictimai əhəmiyyətini anlamaq və bu kimi xüsusiyyətləri inkişaf etdirir.

Əmək təlimi dərslərində nitq inkişafı üzrə işin əsas məzmununa ətraf aləm və hadisələri haqqında təsəvvür dairəsini genişləndirmək, şagirdlərin nitq motivasiyasını daim artırmaq, eyni zamanda şifahi nitqin bütün aspektlərini (fonemik, leksik, qrammatik) inkişaf etdirmək, fikrin daha aydın və dolğun ifadəsi üçün linqvistik bazasını təşkil etmək, məktəblilərə rabitəli mülahizələrini tərtib etmək bacarığı daxildir.

Məşğələlər zamanı sağlamlıq imkanları məhdud şagirdlərin ümumi – əqli və fiziki inkişafı əhəmiyyətli dərəcədə artır, ətraf aləm haqqında təsəvvürləri genişlənir, onlar təbiət, insanlar, onların əmək fəaliyyəti haqqında çoxlu maraqlı bilik, bacarıq və vərdişlər qazanırlar. Təlim prosesində uşaqların istifadə edilən yeni sözlərlə tanışlığı yaradılır, söz və ifadələrin mənaları izah edilir. Onlar şifahi və yazılı göstərişlərə əsasən tapşırıqları yerinə yetirməyi, öz fəaliyyətləri haqqında məlumat verməyi, nitqin köməyi ilə fəaliyyətlərini tənzimləməyi öyrənirlər. Bundan əlavə, əmək təlimi prosesində lüğət üzərində iş zamanı artıq məlum olan sözlərin mənaları genişlənir və incələnir.

**Problemin elmi yeniliyi.** Əmək təlimi dərslərində nitq inkişafı üzrə işin əsas məzmununa ətraf aləm və hadisələri haqqında təsəvvür dairəsini genişləndirmək, şagirdlərin nitq motivasiyasını daim artırmaq, eyni zamanda şifahi nitqin bütün aspektlərini (fonemik, leksik, qrammatik) inkişaf etdirmək, fikrin daha aydın və dolğun ifadəsi üçün linqvistik bazasını təşkil etmək, məktəblilərə rabitəli mülahizələrini tərtib etmək bacarığı daxildir.

Məşğələlər zamanı sağlamlıq imkanları məhdud şagirdlərin ümumi - əqli və fiziki inkişafı əhəmiyyətli dərəcədə artır, ətraf aləm haqqında təsəvvürləri genişlənir, onlar təbiət, insanlar, onların əmək fəaliyyəti haqqında çoxlu maraqlı bilik, bacarıq və vərdişlər qazanırlar. Təlim prosesində uşaqların istifadə edilən yeni sözlərlə tanışlığı yaradılır, söz və ifadələrin mənaları izah edilir. Onlar şifahi və yazılı göstərişlərə əsasən tapşırıqları yerinə yetirməyi, öz fəaliyyətləri haqqında məlumat verməyi, nitqin köməyi ilə fəaliyyətlərini tənzimləməyi öyrənirlər. Bundan əlavə, əmək təlimi prosesində lüğət üzərində iş zamanı artıq məlum olan sözlərin mənaları genişlənir və incələnir.

**Problemin praktik əhəmiyyəti.** Beləliklə də, xüsusi təhsil şəraitində sağlamlıq imkanları məhdud uşaqların korreksiya və inkişafetdirici təlimi, idrak proseslərinin nitqin və şəxsiyyətin inkişafına, çatışmazlıqların səbəb olduğu sosial məhdudiyyətləri aradan qaldırmağa yönəldilmiş kompleks reabilitasiya və adaptasiya üsullarından biridir.

**Ədəbiyyat:**

1. Hüseynova N. Loqopediya. / N. Hüseynova, T. Ağayeva. -Bakı, -2017
2. Рубинштейн С. Я. Психология умственно отсталого школьника. / С.Я. Рубинштейн. – М.: Просвещение, -1986.
3. Чевелёва Н.А. Развитие речи детей в процессе ручной деятельности в школе для детей с тяжёлыми нарушениями речи. -М., -1961

**E-mail:** loqoped55@mail.ru

**Rəyçilər:** *filol.ü.fəls.dok.,* dos. **T.H. Ağayeva**
*ped.ü.fəls.dok.,* **M.Ş. Məlikov**
**Redaksiyaya daxil olub:** 09.02.2023.

*UOT 159.9*

***Fəridə Şahlar qızı Şükürova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dillər Universiteti*

# EŞİDİB-ANLAMA VƏ DANIŞIQ BACARIQLARININ İNTEQRATİV ŞƏKİLDƏ TƏDRİSİ MƏSƏLƏLƏRİ

***Фарида Шахлар гызы Шукюрова***
*доктор философии по педагогике*
*Азербайджанский Университет Языков*

# ВОПРОСЫ ПРЕПОДАВАНИЯ НАВЫКОВ АУДИРОВАНИЯ И ГОВОРЕНИЯ В ИНТЕГРАТИВНОЙ ФОРМЕ

***Farida Shahlar Shukurova***
*doctor of philosophy in pedagogy*
*Azerbaijan University of Languages*

# ISSUES OF INTEGRATED TEACHING OF LISTENING AND SPEAKING SKILLS

**Xülasə.** Məqalədə eşidib-anlama və danışıq bacarıqlarının inteqrativ şəkildə tədrisi araşdırılır və bunun günü tələbi olduğu vurğulanır. Hər bir dil öyrənən bu dildən ünsiyyət vasitəsi kimi istifadə etməyi qarşısına məqsəd qoyur. Eşidib-anlama və danışıq da məhz şifahi ünsiyyətin effektivliyini təmin edən əsas bacarıqlardır. Deyiləni doğru anlayıb ona uyğun şəkildə cavab vermək üçün də eşidib-anlama və danışığın birgə inteqrativ şəkildə tədrisi mütləqdir.

***Açar sözlər:*** *kommunikasiya, inteqrativ, strategiya, koqnitiv, autentik*

**Резюме.** В статье исследуются вопросы преподавания навыков аудирования и говорения в интегративной форме и подчеркивается, что это является требованием дня. Каждый, кто изучает язык стремится использовать его как средство общения. Аудирование и говорение являются основными навыками, обеспечивающими эффективность устного общения. Для того чтобы правильно понимать, о чем идет речь, и реагировать соответствующим образом, важным является преподавание аудирования и говорения в интегративной форме.

***Ключевые слова:*** *коммуникация, интегративный, стратегия, когнитивный, аутентичный*

**Summary.** The article explores the issue of integrative teaching of listening and speaking skills and emphasizes that this has become the requirement of the day. Every language learner strives to use the language as a means of communication. Listening and speaking are the main skills that ensure the effectiveness of oral communication. Teaching listening and speaking in an integrative way is essential in understanding what is being said and respond appropriately.

***Key words:*** *communication, integrative, strategy, cognitive, authentic*

İngilis dilinin səmərəli və günün tələblərinə cavab verəcək şəkildə tədris olunması bu gün qarşıya qoyulan əsas məsələlərdəndir. Məlumdur ki, bu gün bütün dünyada, o cümlədən ölkəmizdə bu məsələyə xüsusi diqqət ayrılır. Bu iş iyirmi birinci yüzilliyin böyük elmi nailiyyətlərinə əsaslanır. Respublikamızda aparılan təhsil islahatları çərçivəsində xarici dillərin, eyni zamanda ingilis dilinin tədrisinin dünyada qəbul edilmiş müasir yanaşma və metodların tətbiqi ilə həyata keçirilməsi məsələsi bir məqsəd kimi qarşıya çıxır. Bütün bu deyilənlər xarici dillərin həm ixtisas kimi, həm də qeyri-ixtisas sahələrində tədrisi ilə məşğul olan ali məktəbləri də öz proq-

ramlarını və fəaliyyətlərini bu islahatlardan irəli gələn tələblərə uyğun şəkildə qurmağa çalışırlar.

Məlumdur ki, bu gün respublikamızda fəaliyyət göstərən ali və orta ixtisas məktəblərində xarici dillər, o cümlədən ingilis dili müxtəlif səviyyələrdə tədris olunur. Bu prosesdə ixtisası dil olan fakültələrdə tədris, başqa ixtisaslarda dilin tədrisindən əsaslı şəkildə fərqlənir ki, bu da tamamilə məqsədyönlü şəkildə belə təşkil olunmuşdur. Belə ki, ixtisası dil olan fakültələrdə xarici dil gələcəyin müəllimləri, tərcüməçiləri və ya filoloqlarına digər ixtisas sahiblərinə nisbətən daha dərinləşmiş proqram əsasında tədris olunur. Digər sahələrdə isə xüsusi məqsədlər üçün xarici dilə daha çox üstünlük verilir. Belə ki, müəllim olmaq üçün sadəcə dil biliklərinin olması kifayət deyil, eyni zamanda tədris prosesinə şəxsi yanaşmalarını tətbiq edə bilmək üçün onlara praktik bacarıqların öyrədilməsi də vacibdir. İngilis dilinin hansı məqsədlə tədris olunmasından asılı olmayaraq, qarşıya qoyulan əsas məqsəd dilə yaxşı yiyələnmiş, ondan effektiv ünsiyyət vasitəsi kimi istifadə edə bilən səriştəli mütəxəssislər hazırlamaqdır.

Bu prosesdə yazı, oxu, eşidib-anlama və danışıq bacarıqlarının effektiv şəkildə tədris olunması xüsusi əhəmiyyət kəsb edir. Belə ki, hər bir dil öyrənənin hədəfi dildən istifadə edərək həm yazılı, həm də şifahi ünsiyyət qura bilmək və kommunikativ məqsədlərini uğurla reallaşdırmaqdır. Şifahi ünsiyyətin səmərəli şəkildə qurulmasının əsasında duran danışıq və eşidib-anlama bacarıqlarının olduğunu nəzərə alaraq bu bacarıqların inteqrativ şəkildə tədrisinin həyata keçirilməsi bizə qarşıya qoyulan məqsədə daha sürətli çatmağa imkan verəcəkdir. Həmçinin nəzərə almaq lazımdır ki, bu gün hər bir sahədə olduğu kimi, xarici dillərin tədrisində də informasiya-kommunikasiya texnologiyalarının rolu danılmazdır. Eşidib-anlamanın tədrisi zamanı bu texnologiyalardan səmərəli şəkildə istifadənin uğura aparan yolda xüsusi əhəmiyyəti aydın görünür.

Eşidib-anlama və danışıq bacarıqlarının niyə birgə tədris olunması məsələsi günümüzün tələbi olaraq meydana çıxır. Belə ki, hər bir dil öyrənən bu dildən ünsiyyət vasitəsi kimi istifadə etməyi qarşısına məqsəd qoyur. Eşidib-anlama və danışıq da məhz şifahi ünsiyyətin effektivliyini təmin edən əsas bacarıqlar kimi qarşımıza çıxır. Ünsiyyətə girən şəxslərin bir-birlərini anlaması və kommunikasiyanın adekvat şəkildə davam etdirilə bilməsi üçün tərəflərin bir-birlərini düzgün başa düşməsi vacibdir. Deyiləni doğru anlayıb ona uyğun şəkildə cavab vermək üçün də eşidib-anlama və danışığın birgə inteqrativ şəkildə tədrisi mütləq bir amil kimi qarşıya çıxır.

Təəssüflə qeyd etməliyik ki, dinləyib-anlamanın tədrisinə kifayət qədər diqqət verilmir və bu da öz növbəsində tələbələrin danışma bacarıqlarının zəif inkişafına gətirib çıxarır. Yadda saxlamaq lazımdır ki, kommunikasiyanın effektiv şəkildə davam etməsi hər iki bacarığın süzgün tədrisindən və öyrənilməsinin səviyyəsindən asılıdır. Bir çox hallarda müəllimlər danışıq bacarığının inkişafına daha çox diqqət ayırsalar da istənilən nəticəni əldə edə bilmirlər. bunun da əsas səbəbi tələbələrin eşidib-anlama bacarıqlarının kifayət qədər inkişaf etməməsi ilə əlaqədardır. Məlumdur ki, xarici dilin, o cümlədən ingilis dilinin tədrisi zamanı daha çox diqqət qrammatika və lüğət ehtiyatının artırılmasına yönəlir. Beləliklə, müəllim tələbələrin nitqinin daha axıcı olacağını düşünürlər. Əlbəttə ki, dil materiallarının öyrənilməsi vacib amillərdəndir. Ancaq bu öz-özlüyündə ünsiyyət prosesində dildən düzgün və adekvat şəkildə istifadəni təmin edə bilmir. Belə ki, eşidib-anlama bacarıqları zəif olan tələbələr müəllimin dil materiallarının izahı zamanı istifadə etdiyi nitqini də anlamaqda çətinlik çəkir, bəzən materialın ana dilində izahına da ehtiyac yaranır. Bunun qarşısını almaq, dil öyrənənləri prosesə bərabərhüquqlu tərəfdaş kimi cəlb etmək üçün lazımi dinləmə materiallarının dərsdə istifadəsinə çox yer verilməsi və düzgün istifadəsi önəmlidir. Deyilənləri nəzərə alaraq qeyd etmək lazımdır ki, son dövrlərdə Azərbaycanda da təhsil sahəsində davam edən islahatlar, qəbul və buraxılış imtahanlarının keçirilməsi proseduruna edilmiş dəyişikliklər digər komponentlərlə yanaşı dinləyib-anlama bacarığının da yoxlanmasını artıq prosesin bir hissəsi kimi qarşıya qoyulub. Bu, həm orta məktəb, həm ali məktəb, eyni zamanda doktorantura səviyyələrində aparılan imtahanların tərkib hissəsinə çevrilmişdir. Bu da öz növbəsində xarici dilin öyrənilməsində eşidib-anlamanın nə qədər vacib rola malik olduğunu sübut edən amillərdəndir.

Son dövrlərdə dinləmə yalnız anlamaq üçün deyil, eyni zamanda dil öyrənmənin bir hissəsi kimi yoxlanılır. Bunu dünyaca tanınmış tətbiqi dilçi və xarici dilin tədrisi sahəsində mütəxəssis C. Riçards belə ifadə edir: "Dinləmə zamanı dinləyicilər dilin müxtəlif formalarda istifadəsinin fərqinə varır və bunu özlərinin inkişaf etməkdə olan kommunikativ səriştələrinin bir hissəsi çevirirlər" (7, s. 1).

Kommunikativ kompetensiyanın inkişafını isə səlis danışıq olmadan təsəvvür etmək mümkün deyil. Ənənəvi təlim metodlarında nəzərdə tutulmuş eşitdiyini təkrar et, dialoqu əzbərlə kimi ancaq cümlələri öyrənmək və təkrar etmək deyil, öyrəndiyi nəzəri bilikləri praktik şəkildə tətbiq edərək adekvat olan ünsiyyətə girmək bacarığını formalaşdırmaq müasir kommunikativ yanaşmanın tələbi kimi danışığın tədrisinin effektiv həyata keçirilməsini təmin etməkdə müəllimləri yönləndirir. Bunun məntiqi nəticəsi olaraq günümüzdə dilin tədrisində qrammatika əsaslı sillabusların istifadəsindən anlayışlar, funksiyalar, bacarıqlar, tapşırıqları özündə ehtiva edən kommunikasiya əsaslı sillabuslara keçid də bu məqsədə xidmət edir. Tədrisin bu şəkildə təşkili zamanı səlis danışığı təmin etmək məqsədilə istifadə edilən bir çox tapşırıq növləri dil öyrənənləri real kommunikasiyaya hazırlayan effektiv vasitələrdir. Beləliklə, dil öyrənənlər uğurlu ünsiyyət qurmaq və şifahi nitq bacarıqlarını inkişaf etdirmək üçün tələb olunan strategiyaları formalaşdırır və tədricən inkişaf etdirirlər.

Məlumdur ki, hər hansı xarici dildə danışmaq özü-özlüyündə bir neçə faktora əsaslanan mürəkkəb bir bacarıqdır. Belə ki, hər hansı xarici dildə, o cümlədən ingilis dilində danışa bilmək üçün dil öyrənənlər nəzəri dil biliklərinə yiyələnməklə yanaşı, psixoloji cəhətdən də hazırlıqlı olmalı, müxtəlif kontekstlərdə lazım olan və uyğun struktur və formalardan düzgün istifadə etməyi bacarmalıdırlar. Danışıq bacarığının inkişaf etdirilməsində dil öyrənənlərin hissləri, əhval-ruhiyyəsi, yanaşma və tərzləri, motivasiya səviyyələri xüsusi əhəmiyyətə malikdir. Bütün bu affektiv amillərlə yanaşı yaş, sosiomədəni biliklər, eşidib-anlamanın səviyyəsi də xarici dildə danışmanın keyfiyyətinə təsir edən amillərdəndir. Nəzərə almaq lazımdır ki, danışıq özü bir çox məqsədlərə xidmət edir və hər bir məqsəd müxtəlif bacarıqları ehtiva edir (6, s. 201).

Qeyd etmək lazımdır ki, yuxarıda haqqında danışılan məqsədlər danışığın baş verdiyi kontekstdən asılı olaraq dəyişir. Bunlara misal olaraq təsadüfi söhbətlər zamanı məqsəd başqaları ilə ünsiyyətə başlamaq, müzakirələr aparanda fikir bildirmək, hər hansı məqamı aydınlaşdırmaq, digərlərini inandırmaq, bəzi hallarda nəyisə təsvir etmək, şikayətlənmək, xahiş etmək və başqa bu kimi halları göstərə bilərik. Bütün bunlar danışıq və eşidib-anlamanın birgə inteqrativ şəkildə tədrisini şərtləndirir. Belə ki, effektiv danışıq bacarıqlarına yiyələnmək üçün tələbələrin aydın izahlara və düzgün nümunələrlə təmin edilməsinə ehtiyac yaranır. Bu nümunələr düzgün seçilmiş autentik audio-vizual materiallar vasitəsilə daha effektiv şəkildə nümayiş etdirilə bilir. Bura mahnılar, podkastlar, radio proqramlar, televiziya verilişləri, cizgi və kinofilmlər kimi bir çox başqa materiallar aiddir. Bu materialların istifadəsi zamanı tələbələr vurğunun, tonun, intonasiyanın necə istifadəsini və dəyişməsini müşahidə edirlər. Qeyd etmək lazımdır ki, autentik videomateriallar tələbələrə yalnız dilin verbal şəkildə istifadəsini deyil, eyni zamanda jestlər, üz ifadəsi, duruş kimi qeyri-verbal elementləri də nümayiş etdirir.

K. Şuminin fikrincə, danışığın tədrisi ilə məşğul olan müəllim və təlimçilər bir neçə sualı hər zaman nəzərdə saxlamalıdırlar:

* İngilis dilini xarici dil kimi öyrənən böyüklərin şifahi nitqinə təsir edən amillər nələrdir?

* Danışığın effektivliyini təmin edən əsas komponentlər hansılardır?

* İngilis dilini xarici dil kimi öyrənən böyüklərin danışıq bacarıqları necə inkişaf etdirilə bilər? (8, s. 209)

Dil biliyinin çoxşaxəli bir anlayış olduğunu nəzərə alaraq qeyd etmək lazımdır ki, o, özündə müxtəlif bacarıq və fəaliyyətlərin fərqli səviyyələrini ehtiva edir. Əvvəldə də qeyd etdiyimiz kimi, danışığın tədrisi zamanı bir çox faktorlar nəzər alınmalıdır. Bunlara yaş və ya yetkinliklə bağlı məhdudiyyətlər, eşitmə mühitinin olub-olmaması, sosiomədəni və affektiv faktorlar aiddir. Nəzərə almaq lazımdır ki, bir çox hallarda kiçik yaşlı uşaqlar eşitdiklərini olduğu kimi təkrarlama və ya yamsılama bacarıqlarına malik olduqları üçün onların tələffüz və danışıqları böyüklərə nisbətən daha yaxşı inkişaf etmiş olur. Kraşen, Lonq və Skarsellanın araşdırmala-

rının nəticəsinə əsasən dil öyrənməyə erkən yaşlarında təbii dil mühitində başlayanlar, gec başlayanlarda nisbətən daha səriştəli olur (4, s. 211).

Bu fikri nəzərə alaraq qeyd etmək lazımdır ki, ixtisası dil olan ali məktəblərdə xüsusən də aşağı kurslarda təhsil alan tələbələrdə düzgün danışma bacarığının formalaşdırılması məsələsi xüsusilə əhəmiyyətlidir. Belə ki, dil fakültələrinin bu günkü tələbələri gələcəyin dil müəllimləridir və onların hər hansı bacarığa düzgün yiyələnməməsi gələcəkdə bu öyrəncilərin professional həyatlarına öz mənfi təsirini göstərəcəkdir. Onların tələbə ikən əldə etdikləri bilik və bacarığı müəllim kimi fəaliyyət göstərərkən öz şagirdlərinə doğru və uyğun şəkildə ötürmələrini təmin etmək üçün bu gün hər bir müəllim ciddi cəhdlə çalışmalı və tələbələri düzgün məcraya yönəltməyə çalışmalıdır.

Məlumdur ki, ölkəmizdə ingilis dilinin təbii eşitmə və öyrənmə mühiti yoxdur. Müəllim olaraq hər birimizin borcu və vəzifəsi bu mühiti süni şəkildə yaramaq, tələbələri mümkün qədər çox dil real istifadəsini əks etdirən materiallarla əhatə etməyə çalışmaqdır. Bu zaman eşidib-anlamanın rolu bir az da güclənir. Belə ki, bildiyimiz kimi dəqiq və səlis danışmaq eşitdiyini düzgün anlama ilə bilavasitə əlaqədardır. Tələbələrin dil səviyyəsi, yaş həddi və maraq dairələrinə uyğun şəkildə seçilmiş dinləmə materialları onlarda dilin mənimsənilməsinin əsas mexanizmi olan eşidib-anlaman bacarığının inkişaf etdirilməsində çox mühüm yer tutur. Tələbələrin sərbəst danışmalarına mane olan və bu bacarığın inkişafını ləngidən natamam formaların və ya qısaltmaların, yanlış başlamalar, fikri tamamlamaq və ya vaxt qazanmaq məqsədilə istifadə olunan sözlərin işlədilməsi kimi şifahi nitqə xas olan xüsusiyyətlər də doğru seçilmiş materiallarda öz əksini tapır və dil daşıyıcılarının təbii mühitdə onlardan necə istifadə etdiklərini əyani şəkildə nümayiş etdirir.

Eyni zamanda qeyd etmək lazımdır ki, tələbələrin dilini öyrəndikləri xalqın və mühitin sosiomədəni xüsusiyyətlərini də müəyyən qədər öyrənmələri, həmçinin qeyri-verbal ünsiyyət vasitələrini anlamaları və ötürülən mesajı düzgün açmaq üçün tələb olunan strategiyalara yiyələnmələri də lazımi amillərdəndir. Göstərilən amillərin düzgün şəkildə dəyərləndirilməməsi bir çox hallarda yanlış anlaşılmalara gətirib çıxarır. Bəzən belə uğursuzluğa məruz qalan tələbələr öyrənmə həvəslərini itirir və ya necə davranmalı olduqlarını, öyrənməyə necə davam edəcəklərini bilmirlər. Bunun qarşısını almaq, tələbələri öyrənməyə həvəsləndirmək üçün müəllim olaraq bizim vəzifəmiz onların hər birinin ayrı fərd olduğunu, fərqli maraqları və öyrənmə üslublarının olduğunu, müxtəlif öyrənmə mühitlərindən gəldiklərini nəzərə almaq və onlara səviyyələrinə uyğun olan və öyrənmələrini stimullaşdıra bilək yanaşma və metodlar seçməkdir. C. Harmerin fikrincə, tamamilə fərqli bilik səviyyələrinə və koqnitiv bacarıqlara malik olan insanlar "düzgün" şərait yaradıldıqda nəzərəçarpacaq dərəcədə yaxşı dil öyrənmə qabiliyyətinə nümayiş etdirirlər (2, s. 86).

Nəzərə almaq lazımdır ki, tələbələri lazımi şəkildə real situasiyalarla tanış etmək məqsədilə informasiya-kommunikasiya texnologiyalarının istifadəsi mühüm əhəmiyyət kəsb edir. Belə ki, müxtəlif audio-video materialları təqdim etmək üçün fərqli texnoloji vasitələrdən istifadə edilir. Bu texnologiyalara misal olaraq interaktiv lövhələr, rəqəmsal proyektorlar, kompüterlər, tabletlər, ağıllı telefonları göstərmək olar. Müasir dövrdə texnologiyaların çox sürətlə inkişaf etdiyini nəzərə alsaq, bu siyahını şərait və imkanlardan asılı olaraq daha da genişləndirmək olar. Qeyd etmək lazımdır ki, təlim texnologiyalarının sinif şəraitində məqsədyönlü şəkildə istifadə edilməsi həqiqətən də dil öyrənmə prosesində, xüsusilə eşidib-anlama və danışıq bacarıqlarının inkişaf etdirilməsində çox müsbət nəticələrə gətirib çıxarır. Tələbələrə dilin müxtəlif situasiyalarda istifadəsini əyani şəkildə nümayiş etdirmək, dil daşıyıcılarının fərqli sosial vəziyyətlərdə verbal və qeyri-verbal ünsiyyət vasitələrindən necə istifadə etdiyini göstərmək, autentik dil materialları ilə onları tanış etməkdə texnoloji vasitələrin köməyi əvəzsizdir. Belə ki, tələbələri öyrənilən dillə mümkün qədər çox əhatə etmək onların bu dildən daha sərbəst, həmçinin daha effektiv istifadəsini şərtləndirir. Bu məqsədlə tələbələrin dil səviyyəsi və maraq dairələri nəzərə alınmaqla seçilmiş qısa autentik filmlərin, radio verilişlərin, podkastların rolu xüsusilə diqqətəlayiqdir. Misal üçün hər hansı bir radio proqram dinlənildikdən və ya film izləndikdən sonra tələbələrlə bu materiallarda istifadə edilmiş dil nümunələrinin və fərqli dil

funksiyalarının təhlili aparılır və mənimsənilməsi üçün müxtəlif şəkillərdə istifadəsi təşkil edilir.

Tələbələrin uğurlu dil öyrənmələri arzu olunan nəticələr əldə edə bilmələri üçün onların uyğun strategiyalar formalaşdırmağa ehtiyacı var. Strategiyaların düzgün seçilməsi dil öyrənənlərin uğur əldə etməsini şərtləndirən amillərdəndir. C. Purpura tələbələrin dil öyrənmə prosesində müxtəlif strategiyalardan istifadə etdiyini vurğulayır və qeyd edir ki, metakoqnitiv strategiyalar dil öyrənənlərə öz davranışlarını planlamağa və öyrənmə prosesinə nəzarət etməyə kömək edir. Sosial strategiyalar vasitəsilə isə onlar yoldaşları və başqaları ilə ünsiyyətə girir və əməkdaşlıq edə bilirlər. Affektiv strategiyalar isə öz növbəsində inanclarını, hisslərini, idarə etməyə və uyğun yanaşmaları seçməyə imkan verir. O, hesab edir ki, tələbələr xarici dili öyrənərkən və tapşırıqları yerinə yetirərkən strategiyalardan ya şüurlu və məqsədyönlü şəkildə, ya da qeyri-şüuri və avtomatik olaraq istifadə edirlər. Bu strateji kompetensiyalar tələbələrin hissləri, motivasiyası və qavrayış formaları ilə birləşərək öyrənmə üsullarını formalaşdırır (5, s. 533).

Bu məsələ nə qədər mübahisəli olsa da, hər bir tələbənin fərqli öyrənmə üsulu, motivasiya səviyyəsi və strategiyası olması şübhə doğurmur. Hər bir işdə olduğu kimi, dil öyrənmə prosesində də motivasiyanın rolu və əhəmiyyəti danılmazdır. Təhsil sahəsində çalışan hər kəsə, xüsusən də hər bir müəllimə məlumdur ki. Motivasiyası yüksək olan tələbələri öyrətmək motivasiya səviyyəsi aşağı olanları öyrətməkdən daha asandır. Zoltan Dörnyei hesab edir ki, tələbələrin özlərini necə görmələri və xarici dildə danışan bir fərd olaraq qəbul etmələri arasında spesifik əlaqə var. O, dil öyrənənlərin özlərinə aid etdikləri motivasiyaedici amilləri 3 fərqli cəhətdən izah edir:

1. İdeal 2-ci dil məni (an ideal L2 self)
2. Olmağı hədəflədiyi 2-ci dil məni (an Ought-to L2 self)
3. 2-ci dili davamlı öyrənmə təcrübəsi (the L2 learning experience).(9)

Tələbələr, adətən, danışıq bacarığı ilə əlaqədar bu tipli hədəflər qoyur, bir çox hallarda dil öyrənmə prosesində uğurlarını ancaq danışmanın səviyyəsi uyğun olaraq öz məqsədlərinə çatıb-çatmadıqlarını yoxlaya bilirlər. Məhz bu səbəbdən də ingilis dilində nitq bacarıqlarına yüksək səviyyədə yiyələnmək bir çox dil öyrənənlərin ən çox üstünlük verdikləri cəhətdir. Bu fakt metodistləri və təhsil ekspertlərini hər zaman şifahi nitq bacarıqlarının necə daha yaxşı inkişaf etdirilə bilməsi məsələsinə daha çox diqqət ayırmağa, daha effektiv üsullar axtarmağa sövq edir.

D. Hayms danışıq və kommunikasiya haqqında danışarkən qeyd edirdi ki, xarici dili öyrənənlər düzgün və səmərəli şəkildə ünsiyyət qura bilmək üçün yalnız dil biliklərinə yiyələnmək deyil, eyni zamanda fərqli situasiyalarda və əlaqələrin qurulması zamanı dili öyrənilən cəmiyyətə məxsus mədəni cəhətdən məqbul hesab edilən müxtəlif vasitələrdən istifadə etməyi də bacarmalıdırlar. (3) Onun kommunikativ kompetensiya ilə bağlı nəzəriyyəsini əsas götürən Kanale və Sveyn qrammatik, diskursiv, sosiolinqvistik və strateji kompetensiyaları bura daxil edir və qeyd edirlər ki, bunlar müvafiq olaraq linqvistik sistemə məxsus xüsusiyyətləri və ünsiyyətin funksional aspektlərini əks etdirir (1).

Yuxarıda qeyd etdiyimiz nəzəriyyələr də səmərəli danışıq bacarığının xarici dil öyrənmə prosesindəki xüsusi əhəmiyyətini bir daha nəzərə çatdırır. Məlumdur ki, şifahi nitqin əsas funksiyaları qarşılıqlı ünsiyyət və informasiyanın ötürülməsidir. Əslində gündəlik danışığın çox hissəsi qarşılıqlı ünsiyyəti ehtiva edir. Məhz bu səbəbdən də ingilis dilinin tədrisi prosesində dərs zamanı tələbələrə daha çox kommunikativyönlü tapşırıq və fəaliyyət növləri təqdim edilməlidir. Bu da öz növbəsində, müəllimlərdən tapşırıq və təlimatları tələbələrin ehtiyaclarına uyğunlaşdırmağı və onlara başqalarını necə dinləməyi, onlarla necə danışmağı və ümumi mənaya, verilən kontekstə uyğun şəkildə müzakirələr apara bilməyi və fikir bildirməyi öyrətməyi tələb edir. Gündəlik kommunikasiyadan əlavə tələbələrin lüğət ehtiyatları və dil bacarıqları inkişaf etdikcə fərqli situasiyalarda tələb olunan şəkildə verbal və qeyri-verbal ünsiyyət strategiyalarına yiyələnəcəklər. Nəticə etibarı ilə, fikir mübadiləsi onlara real həyatda baş verə biləcək müxtəlif vəziyyətlərdə öz düşüncələrini adekvat olaraq ifadə edə biləcəkləri diskurs yaratmağa imkan verəcəkdir. Bu məqsədə çatmağın ən optimal yolu isə dinləyib-anlama və danışıq bacarıqlarının inteqrativ şəkildə tədrisidir.

peyvənd yolu ilə daha yaxşı bəhrə əldə etməyi, torpağa qulluq etməklə məhsuldarlığı artırmağı öyrənirlər. "Fotosintez", "Bitkilərdə tənəffüs" mövzusunda şagirdlər canlı və cansız təbiət arasında vəhdətin olması, üzvi maddələrin əmələ gəlməsi və parçalanması arasında qarşılıqlı əlaqənin olması, onların biri-birindən asılılığının qanunauyğunluğunu dərk edirlər. Beləliklə, şagirdlər elmi dünyagörüşünün bir sıra əsas ideyalarını mənimsəyirlər.

VIII sinif biologiya kursunun tədrisində dünyagörüşü bitki və heyvanlar haqqında şagirdlərin qazandıqları biliklərə əsaslanmalıdırlar. Bu kursun mövzularında hüceyrə, toxuma və orqanlar sistemi anlayışlarının tədrisində həyatın vahidliyi, hüceyrə, toxuma və orqanların quruluşu ilə funksiyaları arasında asılılıq, orqanizmin tam vahid olması kimi anlayışlar yaradılır. "Sinir sistemi" bəhsində insan beyninin bütün heyvanların beyninə nisbətən daha yaxşı inkişaf etməsi, nitqin, şüurun yaranması kimi mühüm dünyagörüşü formalaşdırılır. Sinir sisteminin inkişaf etməsi təkamülün nəticəsi olduğu insanda "ruhun" olmasının heç bir elmi əsası olmadığı əyani sübutlarla izah olunmalıdır. Şagirdlərə başa salmaq lazımdır ki, insanın nitqi, təfəkkürü və ali şüurun inkişafı insan təkamülünün, əməyin, ictimai amillərin nəticəsidir (3, s. 218).

"Tənəffüs bəhsi"ni keçdikdə tənəffüs orqanlarının quruluşundan asılı olaraq tənəffüs prosesinin getməsinin qanunauyğunluğu öyrədilir.

Xəstəliklər, onlarla mübarizə tədbirləri, tənəffüs, həzm, ürək qan-damar sistemi xəstəlikləri, dərinin yoluxucu xəstəlikləri, onların profilaktikası şagirdlərdə gigiyenik bilikləri formalaşdırır (4, s. 66). İnsanda müəyyən xəstəliklərin əmələ gəlməsinin heç bir ilahi qüvvədən asılı olmadığı, onların bakteriyalar, vitaminlər və hormonların çatışmamasının nəticəsi olduğu kimi dünyagörüşünü formalaşdırmaq vacibdir. Gözün quruluşu və görmə proseslərinin qanunauyğunluğunu izah edərkən gözdə heç bir qeyri-adi halların olmadığı, "gözdəymənin" əsassız olduğu, eşitmə orqanını tədris edərkən insanın qulağına bəzən müxtəlif yad səslərin gəlməsi, onu kimsə çağırması, kosmosda insanın elə bir sürətlə aşağı düşməsi kimi hallar insanın psixi fəaliyyəti, onun daxili vahiməsi ilə əlaqədar olduğu şagirdlərə başa salınır (5, s.132).

Yuxarı sinif (IX sinif) biologiya kursunda şagirdlərin bitki, heyvan və insan orqanizminin quruluşu, funksiyası, onların qarşılıqlı əlaqəsi kimi qanunauyğunluqlar haqqında qazandıqları biliklər nəinki genişləndirilir, ümumiləşdirilir, eyni zamanda, dialektik materializmin qanunlarına əsaslanaraq dünyagörüşü formalaşdırılır. IX sinif biologiya kursunun tədrisinin qarşısında duran əsas vəzifələrdən biri şagirdlərdə düzgün dünyagörüşü formalaşdırmaq, milli tərbiyə aşılamaq, təbiətə məhəbbət hissi ruhunda tərbiyə etməkdən ibarətdir.

Kursun tədrisində şagirdlər ilk əvvəl bioloji inkişaf prinsiplərini, həyatın, materiyanın inkişaf sistemində yerini öyrənirlər. Şagirdlər həyatın maddiliyi ilə materiyanın hərəkət formaları arasında nə kimi qarşılıqlı əlaqə olduğunu canlı aləmin əmələ gəlməsi və inkişafının insan şüurundan asılı olmayaraq mövcud olduğunu başa düşürlər. "Hüceyrə haqqında təlim" bəhsində canlılarda gedən fiziki-kimyəvi proseslərin, materiyanın hərəkət formaları, "Üzvi aləmin təkamülü" bəhsində materiyanın təkamül mərhələlərinin həyatın yaranmasını təşkil etməsi baxımından öyrədilməsi nəzərdə tutulmalıdır. Şagirdlər bilməlidirlər ki, canlı aləmin inkişafı, onun müxtəlifliyi və təkamülə yalnız kəmiyyətin keyfiyyətə keçməsi nəticəsində mümkün olur (6, s. 95).

Yuxarıdakı izahatlardan aydın olur ki, şagirdlərdə elmi dünyagörüşü formalaşdırmaq biologiya tədrisinin əsas vəzifələrindən biridir. Dünyagörüşü mahiyyəti və məzmununa görə çətin və mürəkkəbdir. Ona görə bu anlayış tədricən formalaşdırılmalı və sistemlə həyata keçirilməlidir. Bu problemi yalnız dərs prosesində yerinə yetirmək ağılasızmazdır. Ona görə düzgün dünyagörüşü formalaşdırmaq üçün biologiya gecələri keçirilməli, dərnəklər təşkil olunmalı, şagirdləri təbiətə, elmi muzeylərə, zooparklara, seleksiya və genetika təcrübə sahələrinə ekskursiyalara aparmaq məktəbin və müəllimin əsas vəzifəsi olmalıdır. Şagirdlərdə elmi-dünyagörüşü formalaşdırmaq üçün aşağıdakı ümumi sxemi təklif edirik (7, s. 60-63).




Yuxarıda deyilənlərdən aşağıdakı qənaətə gəlmək olar.

1) İndiki şəraitdə şagirdlərdə dünyagörüşü formalaşdırmaq həlli çətin olan sosioloji problemə çevrilmişdir. Məktəblərimizdə bəzi müəllimlər, o cümlədən biologiya müəllimləri, nəinki dünyagörüşü formalaşdırmağa səy göstərmirlər, hətta ondan tamamilə yan keçir və əksinə, hər şeyi qeyri-elmi uydurmalarla izah etməyə çalışırlar. Ona görə də şagirdlərdə biologiyanın və digər təbiət elmlərinin tədrisi prosesində müstəqil düşünmək, mühakimə etmək bacarıqları aşılanmalı, həyat hadisələrinin dialektik baxımdan izah etməyə alışdırmalı, ictimai fəallıq, həyat hadisələrinə elmi mövqedən yanaşmaq bacarıqları formalaşdırılmalıdır.

2. Proqram və dərsliklərin elmi dünyagörüşü baxımından məzmunu daima təkmilləşdirilməlidir. Məktəblərdə, ictimai yerlərdə, kütləvi informasiya vasitələrində, həm də gənclərin tərbiyəsinə, onların kamil və hərtərəfli insan kimi formalaşmasına xidmət edən məlumatlar verilməlidir. Sosioloji işin forma və metodları təkmilləşdirilməli və dövlətin nəzarəti altında olmalı, təlim-tərbiyənin vahid idarə sistemi yaradılmalı, təhsil sisteminin dəqiq xətti müəyyənləşdirilməlidir.

**Problemin aktuallığı.** Ümumtəhsil məktəblərində elmlərin, xüsusilə biologiya elminin əsaslarının öyrədilməsi dünyaya realist baxışlarının formalaşmasına gətirib çıxarır. Buna görə hər bir biologiya müəllimi tədris prosesində şagirdlərdə dünyagörüşü tərbiyə etməyin metodlarından istifadə etməyi bacarmalıdır. Yaradılmış elmi dünyagörüşü nəticəsində şagirdlər təbiəti və onun qanunauyğunluqlarını düzgün dərk edir, onu sistemə salırlar. Bütün bunlar məqalənin işlənilməsini şərtləndirən amillərdir.

**Problemin elmi yeniliyi.** Ümumtəhsil məktəblərinin VIII-IX sinif şagirdlərində biologiyanın

tədrisində elmi dünyagörüşünün formalaşmasının imkanları ilk dəfə tədqiq olunmuşdur.

Dərsdə istifadə olunan material nümunələrinin şagirdlərin elmi dünyagörüşünə təsirinin mövcud vəziyyəti öyrənilmiş, imkanları araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqatda həll olunan məsələlər biologiyanın tədrisi metodikası fənninin tədrisində şagirdlərdə elmi dünyagörüşü üzrə metodik göstərişlərin yaranmasında müəyyən əhəmiyyətə malikdir. Məqalədə verilmiş, təhlil edilmiş fikirlərdən biologiya müəllimləri faydalana bilər.

**Ədəbiyyat:**


1. Kazımov, N. Ali məktəb Pedaqogikası. / N. Kazımov -Bakı, -1999, -337 s.
2. Hüseynov Ə.M. Orta məktəbdə biologiya tədrisinin nəzəri və metodik əsasları. / Ə.M. Hüseynov.- Bakı, -2000, -266 s.
3. Hüseynov Ə.M., Məhərrəmov Ə.M. Biologiya tədrisinin elmi və metodik əsasları. -Bakı, -2015. 138 səh.
4. Hacıyeva , G.N. Biologiyanın tədrisi metodikası. / G.N. Hacıyeva. -Bakı, -2019.- 358 s.
5. Biologiya VIII sinif. / Nüşabə Məmmədova, Brilyant Həsənova, Könül Mahmudova [və b.] - Bakı, - 2015, -173 s.
6. Biologiya 9-cu sinif dərslik. / Seyidli Y. və b., -Bakı, -2016. -203 s.
7. Hüseynov Ə.M. Orta məktəbdə biologiyadan sinifdənkənar məşğələlərin təşkili və aparılması. -Bakı, - 2008. -145 s.


**E-mail:** aliyannagi.maharramov@gmail.com

**Rəyçilər**: *biol.ü.fəls.dok., dos.* **X.Q. İbrahimova**
*biol.ü.fəls.dok.* **Q.M. Əliyev**
**Redaksiyaya daxil olub:** 06.01.2023.

UOT 372.857

**Qəzənfər Musa oğlu Əliyev**
*biologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun aparıcı elmi işçisi*

# BİOLOGİYANIN TƏDRİSİNDƏ ŞAGİRDLƏRDƏ EKOLOJİ TƏFƏKKÜRÜN İNKİŞAFI

**Газанфар Муса оглу Алиев**
*доктор философии по биологии, ведущий научный сотрудник*
*Института Образования Азербайджанской Республики*

# РАЗВИТИЕ ЭКОЛОГИЧЕСКОГО МЫШЛЕНИЯ УЧАЩИХСЯ ПРИ ПРЕПОДАВАНИИ БИОЛОГИИ

**Gazanfar Musa Aliyev**
*doktor of philisophy in biology, leading researcher at the Instutute of Education of the Respublic of Azerbaijan*

# DEVELOPMENT OF ECOLOGICAL THINKING OF STUDENTS WHEN TEACHING BIOLOGY

**Xülasə.** Xaotik görünən təbiət və cəmiyyətin mükəmməl təşkil olunmuş sistem şəklində fəaliyyət göstərməsi, müxtəlif səviyyələrdə sistem daxilində özünütənzimləmə, təbiətin bütövlüyünü təmin edilməsi məsələləri geniş surətdə şərh edilmişdir.
***Açar sözlər:*** *təkamül, ekologiya, liozenoz, biosfer, biotop*

**Резюме.** Во-первых, кажущаяся хаотичной природа и общество функционируют как идеально организованная система. Саморегуляция внутри системы на разных уровнях широко трактовалась как вопрос обеспечения целостности природы.
***Ключевые слова:*** *эволюция, экология, лиосеноз, биосфер, биотоп*

**Summary.** Existing biotic and abiotic factors, mutual development resulting from co-formation and the environment. First, seemingly chaotic nature and society function as a perfectly organized system. Self-regulation within the system at different levels was widely interpreted as a matter of ensuring the integrity of nature.
***Key words:*** *evolution, ecology, lyosenosis, biosphere, biotope*

Biologiya fənninin tədrisində müəllimlər şagirdlərin ekoloji tərbiyəsi, ekoloji mədəniyyət, ekoloji təfəkkürün, ekoloji dünyagörüşün formalaşmasında ciddi səy göstərmək üçün ekologiyaya dair mövzuların tədrisinə ciddi fikir verməlidirlər.

İnsan cəmiyyəti biosferə təsir göstərən və ətraf mühiti dəyişdirən güclü qüvvəyə çevrilmişdir. İnsanın təsərrüfat fəaliyyəti nəticəsində biosferə birbaşa və ya dolayı yolla təsiri antropogen təsir adlanır. Antropogen təsir gücünə görə yalnız geoloji proseslə, miqyasına görə isə biosferdə baş verən maddələr və enerji dövranı ilə müqayisə edilə bilər. Cəmiyyətin yaşaması üçün ilkin bioloji məhsula və mineral xammala olan tələbat antropogen təsirin mahiyyətini təşkil edir. Həmin tələbatı ödəyən yeganə mənbə kimi biosfer çıxış edir.

Təbii sərvətin mənimsənilməsi, emalı və istifadəsi zamanı tullantılarla ətraf mühitin çirklənməsi biosferə antropogen təsirin ekoloji nəticələridir. Biosferin ilkin və təkrar tullantılarla çirklənməsi müşahidə olunur. İlkin tullantılar təbii sərvətin mənimsənilməsi nəticəsində istifadə tapmayan, təbii əlaqələri pozulmuş biosfer məhsullarının birbaşa qalıqlarından ibarətdir. Təbii sərvətin emalı, işlənməsi və istifadəsi nəticəsində meydana çıxan tullantılar (təkrar) adlandırılaraq, ətraf mühitin çirklənməsinə səbəb olur.

İkinci tullantılar sırasına həm də insan tərəfindən sintez edilmiş və təbii ekosistemlərə xas olmayan maddələr aiddir.

Biosferin çirklənməsi insan cəmiyyəti yaranan gündən mövcuddur. Ətraf mühitə antropogen təsirindən irəli gəlir. Antropogen təsirin yaranması tarixi xarakter daşısa da, sənaye dövrünə qədər (XVIII əsr) ətraf mühitin çirklənməsi lokal yayılaraq geniş əraziləri əhatə etmirdi. Əhalinin sayının az, təbii sərvətlərin isə bol olduğu dövrlərdə antropogen təsirin nəticələri də o qədər nəzərə çarpmırdı:

-yeni yaranan ibtidai insan təbiətdə "həll olaraq" liosferə adi bioloji növ kimi təsir göstərirdi;

-bioloji növ kimi formalaşmış insan (Homo Sapiens) intensiv şəkildə ovçuluqla və bitki toplamaqla məşğul olsa da, ekosistemlərdə köklü dəyişikliklər yaratmırdı;

-əkinçilik və heyvandarlığın yaranması ilə bağlı biosferə təsir intensivləşdirilmişdir. Geniş ərazilərdə mal-qaranın otarılması, meşələrin qırılaraq yandırılması, çəmənliklərin şumlanması nəticəsində əkin sahələrinin genişləndirilməsi təbii ekosistemlərin sıradan

Tədris zamanı müəllim, antropogen təsirin sənaye dövrü son 300 ili əhatə etməklə kulminasiya həddinə XX əsrdə çatmışdır. Bu mərhələdə biosferdə bütün ekoloji komponentlər güclü antropogen təsirə məruz qalaraq qlobal ekoloji təzadlar yaratmışdır. XVII əsrə qədər biosferdə ekoloji tarazlıq qlobal şəkildə pozulmamış qalır, ətraf mühitin çirklənməsi isə lokal xarakter daşıyırdı. Lakin XVII əsrdən başlayaraq sənayenin sürətli inkişafı və onun törəməsi olan güclü urbanizasiya biosferin sabitliyini pozan başlıca amilə çevrilmişdir. İqtisadiyyatın bütün sahələrinin, o cümlədən kənd təsərrüfatı istehsalının da sənayeləşdirilməsi və iri şəhərlərin yaranması biosferə antropogen təsiri artırmaqla, XX əsrin ortalarından başlayaraq, ekoloji bəlaların yaranması haqqında şagirdlərə fikrini şərh etməlidir.

Hal-hazırda 200-ə qədər təbii sərvətlərdən istifadə olunur. Müasir texnologiyanın təkmilləşməməsi mineral xammalın tam emalı və istifadəsini təmin etmir. Onun əksər hissəsi tullantı şəklində təbiətə qaytarılır. Bəzi mənbələrə görə, istehsal olunan məhsul istifadə olunan xammalın yalnız 1-2%-ni təşkil edir, yerdə qalanı isə tullantıya gedir.

Elmi-tərəqqinin inkişaf səviyyəsi bu gün 10 milyona yaxın maddə sintez etməyə imkan verir. Ümumdünya Səhiyyə Təşkilatının məlumatlarına əsasən hazırda 500 minə yaxın kimyəvi birləşmə praktiki tətbiqini tapır. Onlardan 40 minə yaxın birləşmə insan üçün zərərli, 12 mini isə toksik hesab olunur.

Biosferin antropagen çirklənməsinə, əsasən, sənaye, energetika və nəqliyyat vasitələri (birlikdə 76%) səbəb olur. Onların iştirakı təşkil edir: sənaye - 38%; energetika - 22%; nəqliyyat vasitələri - 16%; kənd təsərrüfatı - 14%; məişət tullantıları - 7%; digər mənbələr - 3%.

Biosferin antropogen təsirinin nəticələri və miqyası (1 ildə): Yerin təkindən 300 milyard ton mineral sərvət çıxarılır; o cümlədən, 100 milyard ton dəmir filizi; tikinti və dağ-mədən işləri zamanı 4 $km^3$ qrant və süxur daşınır; 800 milyon ton metal (müxtəlif) əridilir; 50-70 $km^2$ torpaq səhralaşma, şoranlaşma, tikinti və s. nəticəsində itirilir; 18 milyon hektar meşə sahəsi məhv edilir; minə yaxın bitki və heyvan növü itirilir; Dünya okeanına 10 milyon ton neft məhsulları düşərək onu çirkləndirir; 7 milyard ton şərti yanacaq yandırılır; 4 milyon ton pestisid istifadə olunur; 30 milyard ton sənaye və məişət tullantıları bərk, maye və qaz halında atmosferə, hidrosferə və litosferə atılaraq biosferi çirkləndirir.

Demoqrafik partlayış planetimizdə əhalinin sayının sürətli artımı deməkdir. Eramızın başlanğıcında Yer kürəsində əhalinin sayı 0,25 milyard nəfər olub, XVIII əsrin sonu – XIX əsrin əvvəllərində 1,0 milyard nəfər təşkil etmişdir. XIX əsrdə əhalinin sayı 1,0 milyarddan 1,65 milyard nəfərə çataraq bu göstərici XX əsrin sonunda 6 milyard nəfər təşkil etmişdir. Beləliklə, eramızın əvvəlindən XVIII əsrə qədər əhalinin sayı 4 dəfə, XX əsrin əvvəlində 6 dəfə və XX əsrin sonunda 24 dəfə artmışdır. Artım XX əsrə qədər 1,4 milyard nəfər, XX əsrdə isə 4,35 milyard nəfər təşkil edir.

XXI əsrin sonunda dünya əhalisinin sayı 12-13 milyard nəfər təşkil edəcəyi proqnozlaşdırılır.

Sənayenin inkişafı ilə bağlı iri şəhərlər yaranmağa başladı. Həmin şəhərlərin əhalisi kənd yerində yaşayan əhalinin (kəndlilərin) hesabına formalaşdı. Şəhərlər inkişaf etdikcə kənd əhalisinin şəhərə axını (urbanizasiyası) güclənirdi. Nəticədə şəhər və kənd əhalisinin sayında qeyri-

bərabərlik yaranmışdır və bu gün əhalinin yarıdan çoxu şəhərdə məskunlaşmışdır. Bəzi inkişaf etmiş ölkələrdə bu göstərici 75%-ə çatır.

Ətraf mühitin çirklənməsində və biosferin deqradasiyaya uğramasında iri şəhərlər əsas yer tutur. Əhalisi 1 milyon nəfər olan şəhər sutka ərzində 500 min ton çirkab su, 2 min ton bərk tullantı və 1,9 min ton müxtəlif aqreqat halında və kimyəvi tərkibdə atmosferi çirkləndirən maddə yaradır. Ətraf mühitin məişət tullantıları ilə çirklənməsi cəmiyyəti narahat edən ekoloji problemlərdən biridir.

Biosferi çirkləndirən mənbələr müxtəlif olduğu kimi, çirkləndiricilərin tərkibi də olduqca rəngarəngdir. Bu müxtəliflik nəzərə alınaraq, çirklənmənin təsnifatı tərtib olunmuşdur. Həmin təsnifatı çirkləndirici mənbəyə, çirklənmənin miqyası və obyektinə və çirkləndiricinin növü əsasında qurulmuşdur.

Çirklənmə yaranma mənbəyinə və növünə görə fiziki, kimyəvi, bioloji və biotik olub təsnifatı daha çox elmi-praktik əhəmiyyət kəsb edir. Fiziki çirklənmə mühitin istilik-energetik, elektromaqnit, dalğa, radioaktiv şüalanma və s. parametrlərinin normadan kənara çıxmasında müşahidə olunur: istilik (termal) çirklənmə - metallurgiya sənayesində; istilik elektrik stansiyalarında və s; səs-küyün artması - şəhərlər üçün səciyyəvidir; elektromaqnit şüalanma (EMS) – mühitin təbii elektromaqnit xassələrinin dəyişdirilməsi nəticəsində baş verir, əsas mənbə kimi müxtəlif teleradio qurğularının yaratdığı elektromaqnit şüaları çıxış edir.

Biologiyanın tədrisində metodik prinsiplər əsasında şagirdlərin ekoloji təfəkkürünün inkişaf etdirməklə XXI əsrin şəxsiyyətinin yetişdirilməsinə nail olmaq mümkündür. Ekoloji təfəkkürlü nəslin yetişdirilməsi isə cəmiyyətin bütün sahələrinin inkişafına zəmin yaradır.

**Problemin aktuallığı.** Ölkənin təhsil sistemi qarşısına başlıca vəzifə kimi insanın ekoloji təfəkkürünün inkişaf etdirilməsi qarşıya qoyulmuş mühüm məsələlərdən birisidir. Şagirdlərə hərtərəfli ekoloji bilik verilməsi ən vacib problemdir.

**Problemin elmi yeniliyi.** Şagirdlərin ekoloji təfəkkürünün inkişaf etdirilməsinin tədqiqi, bu sahədə yeni metodik iş sistemini işləmək, təhsil verənlərə çatdırılmalıdır.

**Problemin praktik əhəmiyyəti**. Məqalədə biologiya fənninin tədrisində şagirdlərin ekoloji təfəkkürünün inkişaf etdirilməsi üçün səmərəli və yolların dair kömək edəcək tövsiyələr verilmişdir.

**Ədəbiyyat:**


1. Babayev M.S. Ümumi biologiya. -Bakı, -2004.
2. Nəcəfov E.Ə. Orta məktəbdə ümumi biologiyanın tədrisi metodikası, -Bakı, -2004.
3. Mamontov, С.Г. Биология. / С.Г. Mamontov М.: Дрофа, 1997.
4. Ekoloji KİT-i A.N.Babayev-2011


**E-mail:** aliyevq.@mail.ru

**Rəyçilər**: *ped.ü.fəls.dok.*, dos. **H.M. Hacıyeva,**
*ped.ü.fəls.dok*. **İ.B. Əmirəliyeva**
**Redaksiyaya daxil olub:** 30.01.2023.

*UOT 372.857*

***Həqiqət Məhəmmədhacı qızı Hacıyeva***
*pedaqogika üzrə fəlsəfə doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

***Nərmin Cahangir qızı Qədirova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# ÜMUMTƏHSİL MƏKTƏBLƏRİNİN VII SİNFİNDƏ BİOLOGİYADAN QEYRİ-STANDART DƏRSLƏRİN TƏŞKİLİ YOLLARI

***Хагикат Махаммадхаджи гызы Гаджиева***
*доктор философии по педагогике, доцент*
*Азербайджанский Государственный Педагогический Университет*

***Нармин Джахангир гызы Гадирова***
*Азербайджанский Государственный Педагогический Университет*

# СПОСОБЫ ОРГАНИЗАЦИИ НЕСТАНДАРТНЫХ УРОКОВ ПО БИОЛОГИИ В VII КЛАССАХ ОБЩЕОБРАЗОВАТЕЛЬНЫХ ШКОЛ

***Hagigat Mahammadhaji Hajiyeva***
*doctor of philosophy in pedagogy, associate professor*
*Azerbaijan State Pedagogical University*

***Narmin Jahangir Gadirova***
*Azerbaijan State Pedagogical University*

# WAYS OF ORGANIZING NON-STANDARD LESSONS OF BIOLOGY IN THE VII CLASS OF GENERAL EDUCATION SCHOOLS

**Xülasə.** Məqalədə ümumtəhsil məktəblərinin VII sinfində qeyri-standart dərslərin təşkili yolları araşdırılır. Qeyri-standart dərslər fənlərin tədrisinə qeyri-adi yanaşmadır. Bu təlimin əsas xüsusiyyəti şagirdlər üçün problemli situasiyanın yaradılmasıdır. Biologiyadan qeyri-standart dərslər müxtəlif tiplərdə təşkil olunur. Məqalədə VII sinif biologiya dərslərində qeyri-standart dərsin təşkili ilə bağlı elmi-metodik tövsiyələr verilir.

***Açar sözlər:*** *standart dərs, qeyri-standart dərs, motivasiya, tədqiqat, inteqrasiya, ekskursiya, biologiya, refleksiya*

**Резюме.** В статье рассматриваются способы организации нестандартных уроков в VII классах общеобразовательных школ. Нестандартные уроки – это необычный подход к преподаванию предметов. Главной особенностью данного обучения является создание проблемной ситуации для учащихся. Нестандартные уроки по биологии могут быть организованы в разных видах. В статье даны научно-методические рекомендации по организации нестандартных уроков по биологии в VII классах.

***Ключевые слова:*** *стандартный урок, нестандартный урок, мотивация, исследование, интеграция, экскурсия, биология, рефлексия*

**Summary.** The article examines ways of organizing non-standard lessons in the VII grade of secondary schools. Non-standard lessons are an unusual approach to teaching subjects. The main feature of this training is the creation of a problem situation for students. Non-standard biology lessons are organize in

different types. In the article, scientific and methodical recommendations are given regarding the organization of non-standard lessons in VII grade biology lessons.

***Key words:*** *standard lesson, non-standard lesson, motivation, research, integration, excursion, biology, reflection*

Hər bir müəllimin qarşısında duran əsas vəzifə şagirdlərə fənn üzrə bilik və bacarıqlar aşılamaq, onlarda öyrənməyə, problemləri araşdırmağa həvəs oyatmaq, onları hərtərəfli inkişaf etmiş şəxsiyyət kimi yetişdirməkdir. Müəllim göstərilən vəzifələri təlim fəaliyyətində, o cümlədən dərslərdə həyata keçirilir. Azərbaycan məktəblərində daha çox tətbiq olunan, milli və fənn kurikulumunun standartlarına əsaslanan standart dərslərdə problemin həllinə o qədər də əhəmiyyət verilmir.

Standart tipli dərs 7 mərhələ üzrə icra olunur. Bu mərhələlərin ardıcıllığı aşağıdakı kimidir:

➢ dərsin birinci *motivasiya mərhələsində* şagirdlərin diqqəti mövzuya yönəldilir. Şagirdlərdə öyrənilən materiala qarşı maraq nə qədər yüksək olursa, şagirdin həmin materialı mənimsəməsi və dərsdə fəal iştirakı da bir o qədər artır. Bu səbəbdən, dərsdə motivasiyanın təşkili böyük əhəmiyyət kəsb edir. Motivasiya rəmzi materiallarla, yönləndirici suallar verməklə, həmçinin şeir və tapmacalarla yaradılır. Maraqlı yaradılmış motivasiya şagirdlərin fəallığını artırır, mövzuya ciddi yanaşmasını təmin edir;

➢ ikinci *tədqiqatın aparılması mərhələsində* şagirdlər mövzuya dair tədqiqata cəlb olunur, tədqiqat əsasında biliklər əldə edirlər. Dərsin məqsədinə uyğun iş üsulu seçilir, müvafiq iş formasında tədqiqat aparılır, müvafiq nəticə əldə edilir;

➢ dərsin 3-cü *informasiya mübadiləsi* mərhələsində şagirdlər tədqiqatın aparılması mərhələsindəki fəaliyyətlərinin nəticələrini təqdim edirlər. Bu mərhələdə şagirdlərdə təqdimetmə, sinif qarşısında çıxış etmə, aydın nitq söyləmə bacarıqları formalaşdır. Hər bir şagird qrupunun fəaliyyətini digər qrup üzvlərinə çatdırılır;

➢ 4-cü *informasiyanın müzakirəsi* mərhələsində müəllim köməkçi suallardan istifadə edərək şagirdləri müzakirəyə cəlb edir. Qabaqcadan hazırlanmış müzakirə suallarına şagirdlərdən cavab alınır. Şagirdlər üçün də qaranlıq qalan məsələlər aydınlaşdırılır;

➢ dərsin 5-ci *nəticə və ümumiləşdirmə* mərhələsində mövzuya dair qazanılan biliklər ümumiləşdirilir və nəticəyə çıxarılır. Ümumiləşdirmədə müxtəlif sxem və cədvəllərdən istifadə edilir;

➢ dərsin *yaradıcı tətbiqetmə* kimi 6-cı mərhələsində şagirdlərə yaradıcı fəaliyyətə əsaslanan tapşırıqlar verilir. Onlara öz təxəyyüllərindən istifadə etmək şəraiti yaradılır. Bu mərhələ şagirdlərin yaradıcı təfəkkürünün inkişaf etməsinə, habelə, dərs boyu qazandıqları bilik və bacarıqların tətbiqinə əsaslanır;

➢ dərsin son mərhələsi olan *qiymətləndirmə və ya refleksiyada* şagirdlərin fəaliyyəti məqsəddən çıxarılan meyarlar əsasında qiymətləndirilir. Şagirdlər həm özlərinin, həm də yoldaşlarının bilik və bacarıqlarını qiymətləndirmə imkanı yaradılır. Qiymətləndirmədə obyektivliyin qorunması məsələsi nəzarətdə saxlanılır.

*Refleksiya* sayəsində şagirdlərə imkan verilir ki, onlar dərsin bütün mərhələlərini təhlil edərək öz fikirlərini, dərslə bağlı ideyalarını çəkinmədən söyləsinlər.

Dərslərin bu cür ardıcıl mərhələlər üzrə təşkili bir çox üstünlüklərə malikdir. Lakin uşaq psixologiyası daim standart dərslərin keçilməsini qəbul etmir, ondan kənara çıxan daha maraqlı dərs formalarının təşkilini tələb edir. Ona görə fənnin tədrisində təkcə standart dərslərin təşkili kifayət etmir. Fənnin məzmununda qeyri-standart dərslərin tətbiqinə imkan verən mövzular mövcuddur. Həmin mövzuların imkanları daxilində qeyri-standart dərslərin tətbiqi şagirdlərin fəallığının artmasına səbəb olur. Lakin bu sahədə müəllimlərə kömək edəcək metodik işləmələr: qeyri-standart dərslərin təşkili qaydaları, formaları pedaqoji ədəbiyyatda az işlənmişdir. Ona görə də bu sahəyə diqqət artırılmalı, qeyri-standart dərslərin təşkili yolları tədqiq olunmalıdır. İnkişaf etmiş ölkələrdə qeyri-standart dərslərin təşkilinə diqqət yüksək səviyyədədir. Onların qabaqcıl praktikasına da müraciət edilməsi məsləhətdir.

Son illərdə Azərbaycanda da belə dərslərə maraq artmışdır. Bu, əsasən ölkəmizin təhsil

sahəsində gedən proseslərlə - şagirdlərin hərtərəfli inkişafına xidmət edən dərsliklərin yaradılması, yeni pedaqoji innovasiyaların tətbiqi, məktəblərdə fənn kabinetlərinə diqqətin artırılması ilə bağlıdır.

Qeyri-standart dərslər fənlərin tədrisinə qeyri-adi yanaşmadır. Bu təlimin əsas xüsusiyyəti şagirdlər üçün problemli situasiyanın yaradılmasıdır. Problemli situasiya şagirdi onlar üçün aydın olmayan problemin həllini araşdırmağa sövq edir. Şagirdlər üçün elə bir atmosfer yaradılır ki, hər biri özünü sübut etməyə, üzərinə düşən vəzifəni müvəffəqiyyətlə yerinə yetirməyə can atır və bunun nəticəsində sinif yaradıcı bir kollektivə çevrilir.

Biologiya fənni şagirdlərin intellektual, əxlaqi, habelə, yaradıcı keyfiyyətlərinin inkişafına geniş şərait yaradır. Fənnin tədrisinin əsas məqsədi şagirdlərin təlim prosesində yüksək nəticələr əldə edərək lazımi biliklərə yiyələnmələri, qazandıqları bilik və bacarıqlarından gələcək həyatlarında müxtəlif şəkildə istifadə etməyi öyrənmələridir. Biologiyanın tədrisində qeyri-standart dərslərin tətbiqi şagirdlərin əqli fəaliyyətini inkişaf etdirir, biliyin mənimsəmə səviyyəsini yüksəldir, onların təfəkkürünü, təxəyyülünü inkişaf etdirir.

Biologiya dərslərində qeyri-standart dərs formalarından istifadə həm şagirdlərin inkişaf məqsədlərinə səmərəli nail olmağı, həm də onların motivasiyasının dərs boyu qorunub saxlanmasını təmin edir. Belə dərslərin keçirilməsi şagirdlərə sərbəstlik, dərsdə biliyi müstəqil olaraq qazanması, bacarıqlarının üzə çıxarılması imkanlarını genişləndirir. Belə ki, qeyri-standart dərs formalarından biologiyanın tədrisində istifadə edilməsi:

-şagirdlərdə ətraf aləmi öyrənmək marağını artırır;

-canlılara qarşı mərhəmət və sevgi hisslərini aşılayır;

-qazandıqları bioloji biliklərdən müxtəlif fəaliyyət sahələrində istifadə etmək imkanları əldə edilir;

-şagirdlər yaradıcılıq, tədqiqatçılıq bacarıqlarını nümayiş etdirirlər;

-bütün bunlar onların peşə seçim fəaliyyətində müsbət rol oynayır.

Qeyri-standart dərslərin bu qədər üstünlükləri olmasına baxmayaraq, bəzi müəllimlər onu lazımi səviyyədə təşkil etməkdə çətinlik çəkirlər.

Qeyri-standart dərsləri təşkil edən müəllim bir sıra məsələləri diqqətdə saxlamalı olur.

Belə ki:

-sinfin maraqlarını nəzərə alır;

-şagirdlərin yaş və bilik səviyyəsinə uyğun qeyri-standart dərs formasını seçir;

-mövzunun məqsədi, imkanı baxımından dərsi təşkil edir.

Biologiyadan qeyri-standart dərslər müxtəlif tiplərdə təşkil olunur. Onlara dərs – yarış oyunları; oyun – dərslər; dərs – məsləhət; dərs – seminar; simulyasiya fəaliyyətinə əsaslanan dərslər; inteqrasiya edilmiş dərslər; dərs – ekskursiyalar; ümumiləşdirici dərslər və başqalarını aid etmək olar.

Digər sinif mövzularında olduğu kimi, VII sinifdə də dərslərin qeyri-standart formada keçilməsi imkanlarına malik mövzular mövcuddur. Həmin mövzular problem baxımından təhlil edildi və aşağıdakı nəticə alındı.

Qeyri-standart dərslərin *oyun – dərs* forması. Oyunların şagirdlərin həyatında böyük rolu vardır. Təlim xarakterli Oyunun əhəmiyyəti hələ Platonun dövründən məlumdur. Həmçinin, F.W.A. Froebelin (1859-1952) fikrincə: *"Uşaqlar oynamalıdır. O, öz fiziki və mənəvi inkişafını oyun vasitəsilə təmin edir. Oyun zamanı əldə edilən biliklər uşaqların zehnində daha yaxşı yerləşir"* (Leif Rustin, 1974, s.32) . Bu səbəbdən, bilik və bacarıqların mənimsənilməsində də oyunun rolu əvəzsizdir. Dərsdə oyunlardan istifadə edilməsi sinifdəki emosional atmosferi dəyişdirməyə kömək edir. Belə olan halda dərs daha canlı və şagirdlər üçün yaddaqalan olur. Oyun - dərs formasında viktorinalar, rollu oyunlar, əyləncəli oyunlar, müsabiqələr və başqalarından istifadə edilir. Oyun tipli qeyri-standart dərslərin əsasən çoxlu canlı obyektlərdən danışılan mövzuların tədrisində tətbiq edilməsi məsləhətdir.

Məsələn, "İkiləpəlilər sinfi. Xaççiçəklilər və gülçiçəklilər fəsiləsi" mövzusunun (dərslik s. 37) *"bioloji loto"su* təşkil edilir. Bu zaman kiçik, üzəri nömrələnmiş vərəqlərin üzərində müxtəlif bitki şəkilləri əks olunur. Vərəqlər şagirdlərə paylanılır. Müəllim hər hansı nömrəni elan edir. Həmin nömrəli vərəq kimdədirsə, o şagird vərəqini sinfə göstərərək həmin bitki haq-

qında məlumat verir – hansı fəsiləyə aid olduğunu, çiçək formulunu, çiçək qrupunu və s. söyləyir. Doğru cavab verə bilməyən şagirdlər "cəza" olaraq müxtəlif şeir, tapmaca, atalar sözü deyir və ya mahnı oxuyur.

Həmin sinifdə *"Dərman bitkilərinin müalicəvi xüsusiyyətləri və onlardan istifadə qaydaları"* mövzusunda (dərslik, s.47) rollu oyun təşkil olunur. Hər şagird bir dərman bitkisi rolunda çıxış edir. Çıxış zamanı şagirdlər həmin bitkini də özləri ilə birlikdə gətirirlər və bitkinin xüsusiyyətlərini, dərman məqsədilə hansı orqanından istifadə olunduğunu, nə zaman toplandığını bildirirlər.

Biologiyadan bir sıra mövzuların tədrisində qeyri-standart dərslərin *dərs-məsləhət* formasından istifadə edilməsi mümkündür. Qeyri-standart dərs – məsləhət formasında təşkil olunan dərslərin əsas məqsədi şagirdlərin mövzu ilə bağlı dünyagörüşünü artırmaq, obyekt və hadisələrə dair geniş məlumat verməkdir. Məsləhət dərslərində müəllimlərlə yanaşı peşəkarların da iştirakı onların öz təcrübələrini şagirdlərlə bölüşməklərinin təşkili nəzərdə tutulur. Bununla şagirdlər onları maraqlandıran suallara cavab tapırlar. Məsələn, VII sinifdə *"İnsan üçün təhlükəli olan qurd xəstəlikləri"* mövzusunu (dərslik, s.75) dərs – məsləhət formasında tədrisində müəllim sinfə məktəbin tibb işçisini, yaxud yaxınlıqdakı tibb müəssisəsinin həkimini dəvət edir. O, şagirdlərə insan üçün təhlükəli olan qurd xəstəlikləri, müxtəlif parazitlər, onlardan qorunma yolları barəsində məlumat verir. Dərs boyu şagirdlərlə diskussiya aparılır. Parazitlər və onlardan qorunma yolları barəsində şagirdlərin təklifləri dinlənilir və müzakirələr aparılır.

Biologiyadan qeyri-standart dərslərin *inteqrasiya edilmiş dərs* formasının tətbiqi də şagirdlər tərəfindən maraqla qarşılanır: Belə dərslərdə fənlər arasında dərin qarşılıqlı əlaqə yaradılır. Şagirdlərə yaşadıqları dünya, müxtəlif maddi və bədii mədəniyyət aləminin mövcudluğu barəsində geniş biliklər verilir, bu sahədə onlarda müxtəlif bacarıqlar formalaşdırılır. Məsələn, VII sinfin "Həşəratların müxtəlifliyi və təbiətdə rolu" mövzusunu (dərslik, s.95) təsviri incəsənət fənni ilə inteqrasiya edərək "Həşəratların həyatında rənglərin rolu" barəsində qeyri-standart dərs təşkil edilir. Şagirdlər həşəratların həyatında rənglərin əhəmiyyətini öyrənirlər. Rəngli boyalardan istifadə edərək müxtəlif həşərat rəsmlərini rəngləyirlər. Boyalarla işləmək stressi, yorğunluğu azaltdığı üçün şagirdlər dərsin sonunda özlərini daha gümrah və dincəlmiş hiss edirlər.

Tədrisdə *dərs – ekskursiya* formasında qeyri-standart dərslər təşkil edərək öyrənməyi maraqlı fəaliyyətə çevirmək mümkündür. Şagirdlər fənn və real həyat arasında əlaqəni dərk edirlər. Təbiətdəki obyektləri, orada baş verən hadisələri və prosesləri yaxından müşahidə edir, onlar üzərində tədqiqat aparmaqla bioloji xüsusiyyətlərini öyrənirlər. Ekskursiya dərslərini təşkil edən zaman əvvəlcə məktəb rəhbərliyindən icazə alınır. Daha sonra valideynlər məlumatlandırılır və şagirdlərə elan edilir. Ekskursiyadan bir neçə gün əvvəl şagirdlərlə birlikdə ekskursiyanın planı hazırlanır. Planda şagirdlərin orada hansı işləri görəcəkləri müzakirə edilir, davranış qaydaları haqqında şagirdlər məlumatlandırılır. Ekskursiya zamanı şagirdlər müxtəlif bitki və heyvan növləri ilə tanış olur, onlar üzərində müşahidələr aparır və öz dəftərlərində qeydlər edirlər. Növbəti dərs şagirdlərlə ekskursiya haqqında müzakirələr aparılır, orada qazandıqları bilikləri yoxlamaq üçün sual-cavab təşkil edilir. Məsələn, VII sinifdə biologiyadan *"Biomüxtəliflik. Nadir və nəsli kəsilməkdə olan yerli faunanın mühafizəsi"* mövzusunda (dərslik, s.141) şagirdlərlə Abşeron Milli Parkına ekskursiya təşkil edilməsi vacibdir. Şagirdlər burada nadir və nəsli kəsilməkdə olan heyvan və bitki növləri ilə tanış olurlar. Qazandıqları yeni bilikləri dəftərlərində qeyd edirlər. Canlılar haqqında onları maraqlandıran suallara cavab alırlar. Sonda ekskursiyada qazandıqları bilik və bacarıqlar haqqında müzakirə apararaq ekskursiyanı yekunlaşdırırlar.

Göründüyü kimi, biologiyanın tədrisində qeyri-standart dərslərin təşkili onu daha maraqlı və rəngarəng edir. Şagirdlərin dərsə və fənni öyrənməyə marağını artırır. Qeyri-standart dərslərin sadalanan üstünlüklərinə baxmayaraq, onun imkanlı mövzuların tədrisində tətbiqi məqsədəuyğun hesab edilir. Müəllimin tədris prosesinin səmərəli təşkilinə həm standart, həm də qeyri-standart dərslərdən yerində və səmərəli istifadə edilməsinə ciddi yanaşmalıdır.

**Problemin aktuallığı.** Biologiyanın tədrisində dərslərin qeyri-standart təşkili təlim müddətinin

daha maraqlı qurulmasına zəmin yaradır. Şagirdlərin öz yaradıcılıq potensialının fərqinə varmasına kömək edir. Lakin, ölkəmizdə ümumtəhsil məktəblərində biologiya dərslərində qeyri-standart dərslərdən az istifadə olunması problemi aktual edir.

**Problemin elmi yeniliyi.** Məqalədə ümumtəhsil məktəblərində biologiyanın (VII sinif) tədrisi prosesini şablonlardan uzaq təşkil etmək üçün metodiki tövsiyələr verilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Ümumtəhsil məktəblərində biologiyanın (VII sinif) tədrisində qeyri-standart dərslərin təşkili yolları baxımından müəllimlər məqalədə verilmiş materialdan öz praktik təcrübələrində istifadə edə bilər.

**Ədəbiyyat:**


1. Hacıyeva H., Qafarova P., Biologiyanın tədrisi metodikasının elmi əsasları. -Bakı, -2021.
2. Leif.J., Rustin.G. Genel Pedaqoji. -1974, -32 s.
3. Paşayev Ə., Pedaqogika. / Ə. Paşayev, F. Rüstəmov. -Bakı, -2010, -216 s.
4. Петрусинский, В.В. Игры - обучение, тренинг, досуг. / В.В. Петрусинский -М.: Новая школа, -1994. -368 с.
5. Seyidli, Y. Biologiya 7. Dərslik. / Y. Seyidli, X. Əhmədbəyli, N. Əliyeva. -Bakı, -2018.
6. Викторовна, Г.Е. Молодой учёный № 28 (132)


**E-mail:** qedirovanermin3@gmail.com

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **X.Q. İbrahimova,**
*biol.ü.fəls.dok.* **Q.M. Əliyev**
**Redaksiyaya daxil olub:** 30.01.2023.

*UOT 372.857*

***Xoşqədəm Qonaq qızı İbrahimova***
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

***Aynurə Vüqar qızı Abdullayeva***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# BİOLOGİYANIN TƏDRİSİNDƏ İDRAK FƏALİYYƏTİNİN YÜKSƏLDİLMƏSİNDƏ İLLÜSTRASİYALARDAN İSTİFADƏNİN XÜSUSİYYƏTLƏRİ

***Хошгадам Гонаг гызы Ибрагимова***
*доктор философии по педагогике*
*Азербайджанский Государственный Педагогический Университет*

***Айнура Вугар гызы Абдуллаева***
*Азербайджанский Государственный Педагогический Университет*

# ОСОБЕННОСТИ ИСПОЛЬЗОВАНИЯ ИЛЛЮСТРАЦИЙ В ПОВЫШЕНИИ ПОЗНАВАТЕЛЬНОЙ ДЕЯТЕЛЬНОСТИ ПРИ ПРЕПОДАВАНИИ БИОЛОГИИ

***Khoshgadam Gonag İbrahimova***
*doctor of philosophy in pedagogy*
*Azerbaijan State Pedagogical University*

***Aynura Vugar Abdullayeva***
*Azerbaijan State Pedagogical Universitet*

# CHARACTERISTICS OF USING ILLUSTRATIONS IN IMPROVING COGNITIVE ACTIVITY IN BIOLOGY TEACHING

**Xülasə**. Şagirdlərdə bioloji biliklərin mənimsənilməsində dərslik illüstrasiyaları ilə işin təşkili mühüm yer tutur. İllüstrasiyalar dərsliyin əsas hissəsini təşkil edir, mətnin məzmununu aydın şəkildə əks etdirir, onu tamamlayır və konkretləşdirir. Şagirdlər illüstrasiya üzərində düşünmək, zəruri faktları vurğulamaq, ayrı-ayrı obyektləri müqayisə etmək və nəticə çıxarmaq, prosesi təsvir etmək, onun əsasında hekayə qurmaq kimi bacarıqlara yiyələnirlər.

***Açar sözlər:*** *illüstrasiya, bioloji biliklər, informasiya mühiti, vizual tədris vasitəsi, təlim prosesi, idrak fəaliyyəti*

**Резюме**. Иллюстрации играют важную роль в усвоении учащимися биологических знаний. Иллюстрации составляют основную структуру учебника, наглядно отражают содержание текста, дополняют его и конкретизируют. Учащиеся приобретают такие навыки, как мышление с помощью иллюстраций, выделение обязательных фактов, сравнение отдельных объектов и подведение выводов, описание процесса, создание не его основе повествования.

***Ключевые слова:*** *иллюстрация, биологические знание, информационная среда, визуальное средство обучения, процесс обучения, познавательная деятельность*

**Summary**. Organization textbook illustrations plays an important role in students' assimilation of biological knowledge. Illustrations are the main part of the textbook, they clearly reflect the content of the text, complement it and clarify it. Students acquire skills such as thinking about the illustration, emphasizing the necessary facts, comparing individual objects and drawing conclusions, describing the process, building a story based on it.

***Key words***: *illustration, biological knowledge, information environment, visual teaching tool, learning process, cognitive activity*

Təhsil islahatı təhsil problemlərinin həlli – şagirdlərin bilik və bacarıqlarının keyfiyyətinin yüksəldilməsi, onlara müxtəlif bacarıqların öyrədilməsi və hər şeydən əvvəl, müxtəlif bilik mənbələrindən müstəqil istifadə və nəticələri tətbiq etmək bacarığı formalaşırır.

Öyrədici mühit təlim-tərbiyə prosesinə təsir edən amillərin, şərtlərin, təlimin qarşıya qoyduğu vəzifələrin və prinsiplərin həyata keçirilməsində önəmli rol oynayır.

Öyrədici mühitin düzgün təşkili bilik prosesinə müsbət münasibət, yeni biliklərin aşkar edilməsi, mənimsənilməsi və tətbiqi üçün münasib şəraitin yaradılması, ünsiyyətdə, qarşılıqlı əlaqədə olmaq, əməkdaşlıq etmək imkanlarını genişləndirmək, şəxsiyyətin inkişafı üçün imkanlarını genişləndirir və inkişaf etdirir.

İnformasiya mühitinə təlim prosesində istifadə edilən və şagirdlər tərəfindən qavranıla bilən bütün məlumat mənbələri kompleksi – müəllim, dərslik, əyani və didaktik vəsaitlər, televiziya, mətbuat, bədii, ensiklopedik məlumat, elmi və elmi-kütləvi ədəbiyyat, bədii nəşrlər, kompüter, müsahibə, müşahidə və eksperimentlər, televiziya, kino, teatr, muzey, sərgi, ekskursiya, səyahətlər və s. daxildir.

Vizual və texniki tədris vasitələrindən istifadə müvafiq məlumatların səmərəli mənimsənilməsinə kömək etməklə yanaşı, şagirdlərin idrak fəaliyyətini aktivləşdirir, nəzəriyyəni təcrübə ilə, həyatla əlaqələndirmək bacarığını inkişaf etdirir, texniki mədəniyyət bacarıqlarını formalaşdırır, diqqəti və dəqiqliyi inkişaf etdirir, öyrənməyə marağı artırır və onu daha əlçatan edir.

Şagirdlərin dərsliklə işləməyin ilkin bacarıqlarına yiyələnmələri üçün ondan dərsdə sistemli şəkildə istifadə etmək, onunla işləməyi öyrətmək lazımdır. Dərsliklə şagirdlərin təlim fəaliyyətinin səmərəliliyini artırmaq üçün şagirdlər bir sıra bacarıqlara yiyələnməlidirlər. Onlara dərslikdə fəaliyyət ardıcıllığını müəyyən etmək, onun mətni, illüstrasiyalarla işləmək, işin nəticələrini müstəqil tərtib etmək bacarığı daxildir. Bu bacarıqlar biologiya dərsliklərinin xüsusiyyətlərini nəzərə alaraq inkişaf etdirilməlidir.

Mətnlə işləmək bacarığının mənimsənilməsi şagirdlərin onu tez oxuyub başa düşmək, təkrar danışmaq, əsas fikirləri tapmaq, mətnin hissələrini qurmaq və onlara ad vermək, oxuduqları üçün plan tərtib etmək, mətni təkrar danışmaq bacarığında özünü göstərir.

İllustrasiyalarla işləmək bacarığına yiyələnmək üçün şagirdlərə illustrasiya üzərində düşünməyi, tərkibindəki zəruri obyektləri vurğulamağı, onun hissələrini tanımağı, ayrı-ayrı obyektləri müqayisə etməyi və nəticə çıxarmağı, illüstrasiyada təsvir olunan prosesi təsvir etməyi, onun əsasında hekayə qurmağı və s öyrətmək vacibdir.

Biologiya dərsliklərində müxtəlif illüstrativ materiallar var. İllüstrasiyaların əksəriyyəti bitkilərin, heyvanların, göbələklərin və s.-nin xarici və daxili quruluşunun, orqanizmlərin həyat proseslərinin, quruluş və funksiyaların əlaqəsinin, təbiətdəki münasibətlərin, orqanizmlərin ətraf mühitə uyğunlaşmasının, tədqiqatların sxematik təsviridir. Dərsliklərdə bioloji obyektlərin fotoşəkilləri də var, onlarla işləmək canlı təbiət haqqında real təsəvvürlərin formalaşmasına kömək edir.

Dərslik illüstrasiyaları ilə işləmək şagirdləri müxtəlif idrak fəaliyyətlərinə cəlb etməyə imkan verir:

- orqanları, orqan sistemlərini, növləri, bitki və heyvanları, həyat proseslərinin mərhələlərini tanımaq;
- illustrasiyaların məzmununu təhlil etmək üçün başlıqlardan istifadə etmək;
- suallara cavab vermək üçün lazım olan məlumatları tapmaq;
- illustrasiyalarda göstərilən obyektləri müqayisə etmək
- illustrasiyaya uyğun hekayə tərtib etmək;
- illüstrasiyalardan müstəqil bilik mənbəyi kimi istifadə etmək.

İllustrasiyaya uyğun olaraq bioloji obyektlərin və proseslərin xarakteristikalarını tərtib etmək, orqanizmlər arasında, orqanizmlərlə cansız təbiət arasında əlaqələri, orqanizmlərin ətraf mühitə uyğunlaşma xüsusiyyətlərini və s. müəyyən etmək bacarıqları inkişaf edir.

Dərsliklər və dərs vəsaitlərini rəqəmsal texnologiyalar çoxlu sayda rəngli illüstrasiyalarla zənginləşdirməyə imkan verir. Rəngli illüstrasiyalar və fotoşəkillər illüstrativ diapazonu genişləndirməyə, onlara daha çox emosionallıq, real həyatda olduğu kimi verməyə imkan verir. Sinifdə kompüterdən istifadə yeni materialı izah edərkən çoxlu illüstrativ materialdan istifadə et-

məyə imkan verir ki, bu da materialın daha yaxşı mənimsənilməsinə kömək edir.

Simvollardan istifadə etmək bacarığını öyrənmək illustrasiyalarda tez naviqasiya etməyə, ümumi materialı nəzərdən keçirməkdən plana keçməyə və bədənin hər hansı bir hissəsinin quruluşunun təfərrüatla-rını aşkar etməyə imkan verir. Belə ki, biologiya dərsliklərindəki illustrasiyalarda bu məqsədlər üçün tez-tez oxlardan istifadə olunur.




Göyərçinin skeletini təsvir edən illustrasiyaya baxarkən müəllim oxların məqsədini izah edir.

Təlim prosesində şagirdlərə heyvan orqanizminin sistemlərini və orqanlarını rənginə görə tanımağı öyrətmək vacibdir. Müəllim ilk dərslərdə izah etməlidir ki, dərsliyin sxemlərində həzm sistemi həmişə yaşıl, tənəffüs sistemi mavi, ifrazat sistemi qara, sinir sistemi sarı, qan dövranı sistemi qırmızı, cinsiyyət sistemi isə qəhvəyi rənglə göstərilir.




Gələcəkdə müəllim bu tip tapşırıqlardan istifadə edir: şəkildə çay xərçənginin hansı orqanlarının sistemləri göstərilir; çay xərçənginin həzm sisteminin orqanlarını ardıcıl olaraq sadalayın (yaşıl rənglə qeyd olunur); müvafiq şəkildə göstərilən həzm sisteminin bütün orqanlarını adlandırın; tənəffüs sistemini əmələ gətirən orqanları adlandırın və s.

Şagirdlərin idrak fəaliyyətinin illustrasiyalarla yüksəldilməsi suallara cavab tapmaq, hekayə tərtib etmək, illüstrasiyalardan müstəqil bilik mənbəyi kimi istifadə etmək tapşırıqları ilə asanlaşdırılır.

Suala cavab vermək və ya hüceyrənin, toxumaların, orqanların və ya orqanizmin quruluşu haqqında hekayə tərtib etmək üçün əvvəlcə

illüstrasiyalardan istifadə etmək məsləhətdir. Eyni zamanda, müəllim illüstrasiyaları əvvəlcədən təhlil etməli, aydın şəkildə tərtib edilmiş başlıqlarla seçməlidir ki, bu da şagirdlərin müəyyən tapşırığı təkbaşına yerinə yetirmələri üçün istifadə edilə bilər.




*VIII sinif. Bədənimizin dirəkləri mövzusu üzrə "Sümüklərin təsnifatı" hekayəsi*. Skeletin struktur funksional vahidi sümükdür. Sümük, sümük toxumasından yaranır, xaricdən birləşdirici toxuma ilə örtülüdür. Sümüklərin uclarında, böyümə zonasında qığırdaq toxuması vardır. İnsan skeleti 206 (Bəzi ədəbiyyatlarda 207, 220 və s. göstərilir.) sümükdən ibarətdir ki, bunun 85-i cüt, 36-sı təkdir. Sümüklər kişilərdə bədən çəkisinin 18%-ni, qadınlarda 16%-ni, yeni doğulmuşlarda isə 14%-ni təşkil edir. Formalarına görə sümüklər borulu, süngəri, yastı, qarışıq və havalı sümüklərə ayrılır (insan skeletinin sümüklərinin təsnifatının böyük müxtəlifliyi mövcuddur).

*Borulu sümüklər.* Ling vəzifəsini icra edir. Onların iki ucu (proksimal və distal) epifiz, bir cismi diafiz adlanır. Bazu, mil-dirsək, bud, qamış-incik sümükləri aiddir.

*Qısa borulu sümüklərin bir epifizi* (monoepifizar) olur. Bu sümüklərin əsas kütləsini diafiz təşkil edir və sümükləşmə daha tez baş verir. Bilək, əl darağı, ayaq daraqarxası, barmaq falanqaları aiddir.

*Süngəri sümüklər* – uzun borulu sümüklərin epifizlərində olduğu kimi xaricdən sıx maddənin nazik təbəqəsi ilə ötürülmüş süngəri maddədən əmələ gəlmişdir. Süngəri sümüklər vətərlərin icərisində yerləşən sesomoid sümüklərdir. Bunlara fəqərə cismi, diz qapağı aiddir.

*Yastı sümüklər* – iki qat sıx maddə lövhələri arasında yerləşən süngəri maddədən ibarətdir. Yastı sümüklərə kəllə, kürək, çanaq sümükləri aiddir.

*Qarışıq sümüklər* – müxtəlif sümük hissələrinin birləşməsindən ibarətdir (gücgah və fəqərələr). Məsələn, fəqərənin cismi süngəri sümüyə, qövş və cıxıntıları isə yastı sümüyə bənzəyir.

*Havalı sümüklər kəllədə yerləşir*. Havalı sümüklərin cisimlərində olan süngəri maddə sorulduqdan sonra yaranan boşluqlar (cib) hava ilə dolu olur. Alın, ənsə, gicgah, xəlbir, əng sümükləri aiddir.

Biologiya dərsliklərində müxtəlif bioloji prosesləri: qidalanma, tənəffüs, hərəkət, çoxalma, inkişaf, orqanizmlərin böyüməsini təsvir edən çoxlu illüstrasiyalar var. Təcrübə göstərir ki, şagirdllər həyat prosesləri haqqında bilikləri orqanizmlərin quruluşundan daha çətin öyrənirlər. Buna görə də sinifdə illüstrasiyalarla işin təşkili şagirdlər tərəfindən orqanizmlərin həyati fəaliyyəti haqqında biliklərin mənimsənilməsini asanlaşdıracaqdır. Məhz buna görə də şagirdlərin bioloji prosesləri əks etdirən illüstrasiyalarla işləməyə sistemli şəkildə cəlb edilməsi məqsədəuyğundur.

Şagirdlərin intellektual bacarıqlarını formalaşdırmaq üçün illüstrasiyalardan istifadə etmək də məqsədəuyğundur.

Şagirdlərlə illüstrasiyalarda təsvir olunan obyektləri müqayisə etmək, təhlil aparmaq (əsas əlamətləri müəyyən etmək, obyektin hissələri arasında asılılıq yaratmaq), quruluş və funk-

siyalar, orqanizmlər ilə ətraf mühit arasındakı əlaqəni qurmaq üçün iş aparılmalıdır.




İllustrasiyalardan istifadənin ilk mərhələlərində obyektləri müqayisə etmək, ətraf mühitlə əlaqələr qurmaq, müqayisə üçün xüsusiyyətləri müəyyən etmək, nəticə çıxarmaq, struktura görə funksiyaları müəyyənləşdirərkən şagirdlərin işinə daha çox diqqət yetirmək vacibdir.

Dərslik illüstrasiyaları ilə işləmək çox vacibdir. Anlayışların formalaşmasına, xüsusən şagirdlər müxtəlif materialları müqayisə edərkən illüstrasiyalar tədris materialını daha yaxşı mənimsəməyə imkan verir. Məsələn, "həzm, həzm sistemi" anlayışlarını formalaşdırarkən şagirdlərə müxtəlif heyvan siniflərinin həzm sistemini əks etdirən illüstrasiyaları müqayisə etmək və təhlil etmək tapşırıla bilər, beləliklə, anlayışlar yaxşı mənimsənilir. Bundan əlavə, bu, materialı digər mövzularla (məsələn, həzm sisteminin təkamülü) əlaqələndirməyə imkan verir, həmçinin şagirdlər özləri təhlil etməyi, müqayisə etməyi və nəticə çıxarmağı öyrənirlər və biliklər müstəqil əldə edirlər.

Bioloji anlayışların şagirdlər tərəfindən mənimsənilməsində onların dərslik illüstrasiyaları ilə işinin təşkili mühüm rol oynayır. Müasir biologiya dərsliklərində canlı obyektləri və onlarla baş verən prosesləri xarakterizə edən müxtəlif illüstrativ materiallar var.



Şagirdlərin tədris zamanı illüstrativ materiallarla işləmək bacarıqlarına yiyələnərkən illüstrasiyaları diqqətlə nəzərdən keçirməyi, zəruri obyektləri vurğulamağı, onun hissələrini tanımağı, ayrı-ayrı obyektləri müqayisə etməyi və nəticə çıxarmağı, bioloji prosesləri təsvir etməyi öyrənməyə müvəffəq olurlar.

**Problemin aktuallığı.** Şagirdlərin bioloji bilik və bacarıqların formalaşmasında dərslik illüstrasiyaları xüsusi əhəmiyyətə malikdir. İllüstrasiyalarla işləmək - şagirdlərdə illüstrasiya üzərində düşünməyi, tərkibindəki zəruri obyektləri vurğulamağı, onun hissələrini tanımağı, ayrı-ayrı obyektləri müqayisə etməyi və nəticə çıxarmağı, illüstrasiyada təsvir olunan prosesi təsvir etməyi, onun əsasında hekayə qurmaq və s. bacarıqların inkişafını sürətləndirir.

**Problemin elmi yeniliyi.** Təlimdə illüstrasiyalardan istifadə şagirdlərin idrak fəaliyyətinin, bilik və bacarıqlarının keyfiyyətinin yüksəldilməsinə imkan yaradır.

**Problemin praktik əhəmiyyəti.** Biologiyanın tədrisində illüstrasiyaların xüsusiyyətlərindən istifadə edərək tətbiq etdikdə şagirdlərin idrak fəaliyyətinin yüksəldilməsində əhəmiyyətli rol oynayır.

**Ədəbiyyat**:

1. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün biologiya fənni üzrə təhsil (kurikulumu). (VI-XI siniflər). 2013
2. X.Q.İbrahimova. Məktəb biologiya kursunda məsələ həllinin texnologiyası. Bakı, 2022 .
3. Методика преподавания биологии: учебник для студ. высш. учеб, заведений / [М.А.Якунчев, О.Н.Волкова, О. Н.Аксенова и др.] ; под ред. М. А.Якунчева. — М.: Издательский центр «Академия», -2008. — 320 с.
4. Пакулова В. М. Особенности современного урока биологии. // Биология в школе. - 2005. - № 8. - 6. 22 – 26
5. Пономарева И.Н., Соломин В.П., Сидельникова Г.Д. Общая методика обучения биологии: Учеб. пособие для студ. пед. вузов / под ред. И.Н. Пономарвоей. – М.: Издательский центр «Академия», 2003.
6. Сонин Н.И. Биология. 6 кл. Живой организм: учеб. для общеобразоват. Учреждений. – 8-е изд.,испр. – М.: Дрофа, 2002. – 176 с.
7. Трайтак Д.И., Суматохин С.В. Биология: Животные 7 кл.: Учебник для общеобразоват. учреждений. -М.: Мнемезина, 2004. - 272.

**E-mail**: xosqedem.ibrahimova@ 59 gmail /com
aynuraabdullayeva1999@gmail.com
**Rəyçilər**: *dos.* **P.M. Qafarova**
*biol.ü.fəls.dok.* **Q.M. Əliyev**
**Redaksiyaya daxil olub:** 30.01.2023.

# *HƏYAT BİLGİSİ FƏNNİNİN TƏDRİSİ METODİKASI*
# *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ПРЕДМЕТА ПОЗНАНИЕ МИРА*
# *METHOS OF TEACHING THE SUBJECT OF KNOWLEDGE OF THE WORLD*

*UOT 57:37.016*

***Elnurə Fazil qızı Səfərova***
*biologiya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin dosenti*
*https://orcid.org/0000-0002-4151-1750*

***Zərifə Rəsul qızı İsmayılova***
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*

## HƏYAT BİLGİSİ FƏNNİNİN TƏDRİSİNİN İNKLÜZİV SİNİFLƏRDƏ TƏŞKİLİ METODİKASI

***Эльнура Фазиль гызы Сафарова***
*доктор философии по биологии,*
*доцент Азербайджанского*
*Государственного Педагогического Университета*

***Зарифа Расул гызы Исмайлова***
*старший преподаватель Азербайджанского*
*Государственного Педагогического Университета*

## МЕТОДИКА ОРГАНИЗАЦИИ ПРЕПОДАВАНИЯ ПРЕДМЕТА ПОЗНАНИЕ МИРА В ИНКЛЮЗИВНЫХ КЛАССАХ

***Elnura Fazil Safarova***
*doctor of philosophy in biology,*
*associate professor at Azerbaijan State Pedagogical University*

***Zarifa Rasul Ismayilova***
*senior lecturer at Azerbaijan State Pedagogical University*

## METHODS OF ORGANIZING THE TEACHING OF THE SUBJECT “KNOWLEDGE of the WORLD” IN INCLUSIVE CLASSES

**Xülasə.** Məqalədə inklüziv siniflərdə Həyat bilgisi fənninin təşkili metodologiyası, təhsilin hamı üçün əlçatan olması üçün müvafiq resursların düzgün seçilməsi, nümunəvi dərsin cari planlaşdırılması verilmişdir. Bir fənnin tədrisi zamanı mövzulara uyğun olaraq seçilmiş resurslar tələbələrə dəstək olur və dərsin öyrənilməsinin keyfiyyətini artırır. Lüğətlər, kalkulyatorlar, yazı materialları, tərtibatlar və müxtəlif formalarda iş dəftərləri, rəngli kağızlar kimi variantların yerləşdirildiyi sahələr buna misal ola bilər. Müxtəlif rəngli resurslar, İKT alətləri, rahat stol və stullarla sakit ərazi yaradıla bilər. İnklüziv təhsilin məktəb həyatına gətirdiyi dəyişikliklər nəticəsində o, təkcə sağlamlıq imkanları məhdud uşaqların deyil, bütün uşaqların istifadə etməsi üçün nəzərdə tutulub.

***Açar sözlər:*** *inklüziv, bilik, metod, həyat bilgisi, sinif, kollektiv*

**Резюме.** В статье представлена методика организации предмета Познание мира в инклюзивных классах, правильный подбор актуальных ресурсов, чтобы сделать образование доступным для всех, текущее планирование образцового урока. При преподавании предмета ресурсы, выбранные в соответствии с темами, поддерживают учащихся и повышают качество усвоения урока. Примером этого могут быть зоны, где размещаются такие опции, как словари, калькуляторы, письменные принадлежности, макеты и разные формы рабочих тетрадей, цветные бумаги. Можно создать тихую зону с различными красочными ресурсами, средствами ИКТ и комфортными столами и стульями. В результате изменений, которые инклюзивное образование вносит в школьную жизнь, оно предназначено для использования всеми детьми, а не только детьми с ограниченными возможностями.

***Ключевые слова:*** *инклюзивное, знание, метод, Познание мира, класс, коллектив*

**Summary.** In the article, the method of organizing the subject of Life knowledge in inclusive classes, the correct selection of relevant resources to make education accessible to everyone, and the current planning of a sample lesson are given. In teaching the subject, the resources selected according to the topics support the students and increase the quality of learning the lesson. An example of this can be areas where options such as dictionaries, calculators, writing tools, models and different forms of workbooks, colored papers are placed. A quiet zone with various colorful resources, ICT tools and comfortable tables and chairs can be created. As a result of the changes that inclusive education brings to school life, it is intended to be used by all children, not only children with disabilities.

***Key words:*** *inclusive, knowledge, method, life knowledge, class, collective*

İnklüziv təhsil ümumi təhsilin inkişafı prosesidir. Təhsilin bütün uşaqların müxtəlif ehtiyaclarının ödənilməsi baxımından hamı üçün əlçatan olmasını nəzərdə tutur. Bu, xüsusi qayğıya ehtiyacı olan uşaqların da təhsil almasını təmin edir. İnklüziv təhsilin bir çox tərifləri və mənaları mövcuddur. İnklüziv təhsilin ümumi göstəriciləri aşağıdakılardır: [2]

- inklüziv təhsil məktəblərin daha münbit və bütün uşaqlar üçün faydalı olmasına yönələn fasiləsiz prosesdir;
- inklüziv təhsil təhsil mədəniyyətinin, hüquqi sənədlərin və təcrübələrin şagirdlərə uyğun olması üçün yenidən qurulmasını ehtiva edir;
- inklüziv təhsil bütün şagirdlərə uyğun olması üçün məktəbin dəyişməsini şərtləndirir;
- inklüziv təhsil uşaqların məktəbdə və icmada təhsilə çıxışına mane olan konkret səbəbləri müəyyənləşdirib aradan qaldırılması üçün davamlı fəaliyyətdir;
- inklüziv təhsil bütün maraqlı tərəflərin iştirakı ilə icra edilməli olan bir prosesdir.

İnklüziv təhsilin əsasında aşağıdakı istiqamətləri əsas götürən ideologiya durur: [3]

-bütün insanlara eyni münasibəti təmin edərək hər cür diskriminasiyadan uzaq durmaq;

-xüsusi təlim ehtiyacları olan uşaqlar üçün ümumtəhsil müəssisələrində şərait yaratmaq.

İnklüziv təhsilin məktəb həyatına gətirdiyi dəyişikliklərin nəticəsində yalnız sağlamlıq imkanları məhdud uşaqlar deyil, bütün uşaqların istifadə etməsi nəzərdə tutulur. SİM uşaqların ümumtəhsil məktəblərində təhsili bir çox ölkələrin, eləcə də Azərbaycanın cəlb olunduğu inklüziv təhsil sisteminin qanunauyğun inkişaf mərhələsidir. Bir dərs nümunəsində inklüziv sinifdə dərsin təşkilini aşağıdakı cari planlaşdırmada qeyd etmişəm. Sinfimizlə tanış olaq: sinfimizdə görmə məhdudiyyətli və eşitmə məhdudiyyətli uşaqlar təhsil alır.

II sinif. “Kollektiv” mövzusunun tədrisi [1]

Standart: 2.1.1.” Fərd”, “ailə” və” kollektiv” anlayışlarını fərqləndirir.

Təlim nəticəsi: Kollektiv anlayışını digər anlayışlardan fərqləndirir.

İnteqrasiya: A.d; T.i

İş üsulları: Beyin həmləsi, müzakirə, kublaşdırma.

İş forması: Kollektivlə iş, qrupla iş, fərdi iş.

Resurslar: İş vərəqləri, (kağız vərəqlərdən kəsilmiş fiqurlar), qiymətləndirmə kartları, kublaşdırma üsulu üçün hazırlanmış kub.

Motivasiya: OYUNUMUZUN QAYDASI

Uşaqların adı yazılmış kağızlar olan bir qabdan iki nəfərin adı seçilir. Seçilmiş bu iki nəfər ipçəkdi oynayır. İnklüziv şagirdlərimiz də oyuna cəlb edilir. Daha sonra oyun zamanı iştirakçılardan birinə 2 nəfər kömək edir.

Sual: Sizcə nə üçün kömək olunan iştirakçı qalib oldu?

https://www.youtube.com/watch?v=vXXjWbdV4_Q

Tədqiqat sualı: Kollektivlə işin əhəmiyyəti nədir?

Sinfə müraciət: Paylanılan iş vərəqlərində sadəcə birinci sualı işləyin. Digər sual üçün birlikdə videoya baxacağıq.

Tədqiqatın aparılması: Kublaşdırma üsulu ilə şagirdləri 6 qrupa bölürəm:

1) Şəkildə gördüyünüzü sözlə təsvir edin. İzləyəcəyiniz videoda atanın yerində olsanız uşaqlara birliyin əhəmiyyətini necə izah edərdiniz?

2) Şəkildə gördüyünüzü sözlə təsvir edin. İzləyəcəyiniz videoda atanın yerində olsanız uşaqlara birliyin nəticəsini necə izah edərdiniz?

3) Şəkildə gördüyünüzü sözlə təsvir edin. İzləyəcəyiniz videoda atanın yerində olsanız uşaqlara birlik olmasa hansı fəsadlar baş verəcəyini necə izah edərdiniz?

Digər 3 qrupa da oxşar suallar olan iş vərəqləri verirəm. Görmə məhdudiyyətli şagird əyləşən qrupa iş vərəqini daha iri şriftlərlə hazırlanmış qaydada təqdim edirəm. Eşitmə məhdudiyyətli şagirdə isə tapşırığa cavab hazırlayarkən videoya baxdıqda alt yazını da oxumağı tapşırıram. İnkluziv siniflərdə video materiallardan istifadə edərkən mütləq şagirdin əlilliyindən asılı olaraq alt yazının olması, materialların rəngarəngliyi, sadə izah nəzərdə tutulmalıdır. Bu zaman digər şagirdləri diqqətdən kənar saxlamaq olmaz, bərabərhüquqluluq qorunmalıdır. Tapşırıqlar paylandıqdan sonra videoçarx izlənilir.

Videonu izləyək:

1. https://www.youtube.com/watch?v=F_HzbDdpzN4

MƏLUMAT MÜBADİLƏSİ: Hər qrupdan bir nümayəndə cavablar yazılmış iş vərəqlərini təqdim edirlər. Hər bir qrupun fikirləri dinlənilir. Bu zaman da inkluziv şagirdləri təqdimata cəlb etmək lazımdır.

MƏLUMAT MÜZAKİRƏSİ: Qrupların fikirlərinə digər qruplar fikir bildirir. Müəllim də söylənilən fikirlərə münasibət bildirir və müzakirəni təşkil edir. Uşaqlara müraciət edir:

- Uşaqlar, kollektiv dedikdə nə başa düşdük?
- Kollektivlə işin əhəmiyyəti nədən ibarətdir?

ÜMUMİLƏŞDİRMƏ VƏ NƏTİCƏ: Uşaqlar, gəlin öyrəndiklərimizi ümumiləşdirək. Diqqət edək lövhəyə, videomaterial üzərində mövzuya aid əsas hissələri qeyd edər və nəticə çıxardaq.

2. https://www.youtube.com/watch?v=dE9Pvkf2FdM

YARADICI TƏTBİQETMƏ: Hər bir qrup "Tək əldən səs çıxmaz" atalar sözünə aid hekayə qursun.

Refleksiya: 3-2-1 üsulundan istifadə edərək bugünkü dərs haqqında təəssüratları şagirdlərdən soruşuruq. Kollektiv mövzusuna aid 3 - yeni öyrəndiyiniz məlumatı qeyd edin. 2 - hansı məlumat diqqətinizi çəkdi? 1 - hansı məlumata dair hələ də suallarınız var? Uşaqlar, biz bu gün birlikdə, yəni, kollektiv çalışaraq dərsimizi tam başa düşdük. Ona görə hər birimizə alqış düşür. Gəlin bir-birimizi birlikdə alqışlayaraq, qiymətləndirək.

**Problemin aktuallığı.** Ümumtəhsil məktəblərində Həyat bilgisi fənninin tədrisinin inklüziv siniflərdə düzgün təşkili aktual məsələlərdəndir. Son zamanlar inklüziv siniflərlə işləyərkən müəllimlər müxtəlif çətinliklərlə rastlaşırlar. Buna görə düzgün metod və üsullardan istifadə əhəmiyyətlidir və dərsin keyfiyyətinə müsbət təsir edir.

**Problemin elmi yeniliyi.** Həyat bilgisi fənnini inklüziv siniflərdə təşkil edərkən hər kəs üçün əlçatan müvafiq resurslar seçilməlidir. Fənnin tədrisində mövzulara uyğun resurslar şagirdlərə dəstək olaraq dərsin mənimsəmə keyfiyyətini artırır. Buna misal olaraq lüğətlər, kalkulyatorlar, yazı vasitələri, maketlər və müxtəlif formada iş dəftərləri, rəngli kağızlar kimi seçimlər qoyulan sahələr ola bilər. Müxtəlif rəngarəng resurslar, İKT vasitələri və rahat stol, stullar olan sakit zona yaradıla bilər. Cari dərs mövzusunun əsasını və ya nəticəsini əks etdirəcək bir məkan yaradıla bilər ki, bu da şagirdlərə keyfiyyətli dərs mühiti yaradılmasını dəstəkləyir. Məsələn, rəqəmsal resurs və materiallardan istifadə edin. Rəqəmsal resurslar ənənəvi çap olunmuş materialların vermədiyi aktivliyi təmin edir. Rəqəmsal mətn şagirdlər üçün vacib olan xüsusiyyətlərə malikdir: [4]

-mətnin səsləndirilməsi alətindən istifadə edərək ucadan oxuma imkanı;

-məzmunun təsvirində çeviklik (rəng, kontrast), mətn şriftini böyütmək imkanı;

-lüğətlər, mətnin rənglər və ya qeyd etməklə vurğulanması, mətnin içində müvafiq qeydlər aparılması üçün dəstəkləyici hazır vasitələr;

-söndürülüb-yandırıla bilən titrlər;

-video üçün audio təsvirlər (izahatlar);

-şəkil təsvirləri.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən orta ümumtəhsil məktəblərinin müəllimləri, tələbə və magistrantlar istifadə edə bilərlər. Təlim prosesini vurğulayın. Təlim üçün vaxtaşırı formativ rəylər mühüm əhəmiyyət kəsb edir. Təlim za-

manı yalnız son nəticə deyil, təlim prosesinin özü də xüsusi əhəmiyyətə malikdir. Təlim prosesinin müxtəlif mərhələlərində prosesin özünə diqqəti yönəltmək prosesin əhəmiyyətini anlamaqda şagirdlərə kömək edir. Yəni təlimdə yalnız nəticə əldə etməyə can atmaq, nəticəyönlü olmaq vacib deyil, həm də təlim prosesində fəal iştirak etmək də mühümdür [5].

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasının ümumtəhsil məktəbləri üçün Həyat bilgisi fənni üzrə təhsil programı (kurikulum). – Bakı, -2013
2. "İnklüziv sinifdə təlimin təşkili" mövzusunda ixtisasartırma proqramının Oxu materialı. Avropa İttifaqı, Azərbaycan Təhsil Nazirliyi, UNİC
3. EF, Regional İnkişaf İctimai Birliyi. -2019.
4. İnklüziv siniflərdə təlimin təşkili. TİPİİ. *Oxu materialı.* -Bakı – 2018
5. Səfərova, E.F. Biologiyanın tədrisində həyati bacarıqların aşılanması ilə şagird şəxsiyyətinin formalaşdırılması. Dərs vəsaiti. / E.F. Səfərova. -Bakı-2018.

**E-mail:** seferovaelnure@mail.ru
**E-mail:** durna.huseynli.00@list.ru

**Rəyçilər:** *ped.ü.fəls.dok., dos.* **H.M. Hacıyeva,**
*ped.ü.fəls.dok., dos.* **G.N. Hacıyeva**
**Redaksiyaya daxil olub**: 19.01.2013.

*UOT 57:37.016*

***Ülviyyə Məhəmmədəli qızı Verdiyeva***
*Mingəçevir Dövlət Universitetinin müəllimi*
https://orcid.org/0000-0003-2617-7456

# İBTİDAİ SİNİFLƏRİN HƏYAT BİLGİSİ DƏRSLƏRİNDƏ ŞAGİRDLƏRİN YARADICI QABİLİYYƏTLƏRİNİN FORMALAŞDIRILMASI PROBLEMİNİN ELMİ, PEDAQOJİ ƏSASLARI

***Ульвия Маммедали гызы Вердиева***
*преподаватель Мингячевирского Государственного Университета*

# НАУЧНО-ПЕДАГОГИЧЕСКИЕ ОСНОВЫ ПРОБЛЕМЫ ФОРМИРОВАНИЯ ТВОРЧЕСКИХ СПОСОБНОСТЕЙ УЧАЩИХСЯ НАЧАЛЬНЫХ КЛАССОВ НА УРОКАХ «ПОЗНАНИЯ МИРА»

***Ulviya Mammadali Verdiyeva***
*lecturer at Mingachevir State University*

# SCIENTIFIC AND PEDAGOGICAL FOUNDATIONS OF THE PROBLEM OF FORMING THE CREATIVE ABILITIES OF PRIMARY SCHOOL STUDENTS IN THE LESSONS OF "KNOWLEDGE of the WORLD"

**Xülasə.** Azərbaycanda həyata keçirilən təhsil islahatlarına dair direktiv sənədlərdə, o cümlədən "Azərbaycanda Təhsilin İnkişafı üzrə Dövlət Strategiyası"nda səriştəyə əsaslanan şəxsiyyətyönlü təhsilin məzmununun yaradılması orta ümumtəhsil məktəblərində çalışan sinif müəllimləri qarşısında mühüm vəzifələr qoyur. Bu vəzifələrin müvəffəqiyyətli həlli üçün ibtidai sinif müəllimləri həyat bilgisi dərslərində şagirdlərin şəxsiyyətyönlülük səviyyəsini yüksəltmək üçün öz yaradıcı imkanlarından səmərəli şəkildə istifadə etməlidirlər. Bunun üçün onlar öz kompetensiya imkanlarından məqsədyönlü, planlı, mütəşəkkil istifadə etməklə şagirdlərin hərtərəfli inkişafını, o cümlədən, yaradıcılıq qabiliyyətlərini təmin etmiş olarlar. Məhz ona görə də, ölkəmizdə həyata keçirilən kurikulum təlimi siyasəti üzrə təşkil olunan tədris prosesində kompetensiyalara əsaslanan təhsilin məzmununun yaradılması mühüm aktuallıq kəsb edir. Bu mənada həyat bilgisi dərslərində ibtidai sinif müəllimlərinin kompetensiya imkanlarından istifadə etməklə yeni iş modelinin yaradılması ilə bağlı tədqiqatların aparılması mühüm aktuallıq kəsb edir.

***Açar sözlər**: Həyat bilgisi, şagird, yaradıcı qabiliyyət, innovasiya, texnologiya*

**Резюме.** В директивных документах по проводимым в Азербайджане образовательным реформам, в том числе в «Государственной стратегии развития образования в Азербайджане», создание содержания личностно-ориентированного образования на основе компетентности ставит важные задачи перед классными руководителями, работающими в среднем общем образовании. Для успешного решения этих задач учителя начальных классов должны эффективно использовать свои творческие способности для повышения уровня личностной направленности учащихся на уроках Познания мира. Таким образом они обеспечат всестороннее развитие обучающихся, в том числе и их творческих способностей, путем целенаправленного, планомерного и организованного использования компетентностных возможностей. Именно поэтому в образовательном процессе, организованном в соответствии с реализуемой в нашей стране политикой курикулума, большое значение имеет создание содержания образования на основе компетенций. В этом смысле важно провести исследование по созданию новой рабочей модели с использованием компетентностных возможностей учителей начальных классов на уроках Познания мира.

***Ключевые слова:** Познание мира, ученик, творческие способности, инновации, технологии*

**Summary.** The creation of the content of personality-oriented education based on competence in the directives on educational reforms in Azerbaijan, including the State Strategy for the Development of Education in Azerbaijan, sets important tasks for secondary school teachers. For the successful solution of these tasks, primary school teachers must effectively use their creative potential to increase the level of personality of students in life lessons. To do this, they can ensure the comprehensive development of students, including their creative abilities, using their competencies in a purposeful, planned, organized manner. That is why the creation of the content of education based on competencies in the educational process organized in accordance with the curriculum training policy implemented in our country is important. In this sense, it is important to conduct research on the creation of a new work model using the competencies of primary school teachers in life skills classes.

***Key words:*** *Life knowledge, student, creativity, innovation, technology*

Həyat bilgisi dərslərində ibtidai sinif şagirdlərinin yaradıcı qabiliyyətlərinin formalaşdırılması işinin məqsədyönlü planlı, mütəşəkkil olaraq təşkil etmək üçün bu işin pedaqoji əsaslarını müəyyənləşdirilməsi vacib hesab olunur. Məhz ona görə, ilk növbədə, Həyat bilgisi dərslərində ibtidai sinif müəllimlərinin kompetensiyalara əsaslanaraq şagirdlərin yaradıcı qabiliyyətlərinin aşkara çıxarılması, inkişaf etdirilərək formalaşdırılması işinin pedaqoji əsaslarının müəyyənləşdirilməsi lazım gəlir. İbtidai siniflərdə şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılması işini günün aktual tələbləri səviyyəsində təşkil etmək üçün müəyyənləşdirilən pedaqoji əsaslar deyəndə nə nəzərdə tutulur? Birincisi, bu işi normal təşkil etmək üçün müvafiq pedaqoji prinsiplərə istinad etmək lazım gəlir. İkincisi, müvafiq təlim metodlarını tətbiq etmək vacib sayılır. Üçüncüsü, ən müasir pedaqoji innovasiyalardan, texnologiyalardan səmərəli istifadə etmək pedaqoji əsaslar kimi nəzərdə tutulur. Öncə ibtidai siniflərdə Həyat bilgisinin tədrisi zamanı müəllimlərin kompetensiyalara əsaslanması ümumpedaqoji prinsiplərə istinad olunmasını tələb edir. Bu zaman, ilkin olaraq, ibtidai sinif müəllimlərinin təlimin müasir həyatla əlaqələndirilməsi prinsipinə istinad etmələri məqsədəuyğun sayılır.

Təlimin həyatla əlaqələndirilməsi kortəbii şəkildə, nəyinsə xatirinə həyata keçirilməməlidir. Əlaqələndirmə keçilən mövzunun xarakterinə uyğun gəlməli, onu tamamlamalıdır [2, s. 34]. Bu baxımdan Həyat bilgisi dərslərində hər hansı mövzunun tədrisinə kreativ şəkildə yanaşan ibtidai sinif müəllimləri şagirdlərin ən zəruri yaradıcı qabiliyyətlərinin formalaşdırılması üçün təlimin təhsilləndirici, tərbiyələndirici üçün təlimin təhsilləndirici, tərbiyələndirici və inkişafetdirici prinsipinə istinad etmələri də zəruri sayılır.

Bu prinsip əsasında təlimin təhsilləndirici, tərbiyəedici və inkişafetdirici funksiyaları dayanır. Bunların hər biri qarşılıqlı əlaqədə götürülür. Təlim təhsili həyata keçirmək prosesidir, təhsil isə təlim üçün həm əsas, həm də nəticə hesab edilir. Təhsilləndirici prinsip zamanı şagirdlər proqram üzrə nəzərdə tutulmuş bilik, bacarıq və vərdişləri mənimsəyirlərsə, tərbiyəedici funksiya zamanı şagirdlərlə əxlaqi, mənəvi, estetik, əmək, ekoloji, iqtisadi tərbiyə üzrə iş aparılır, onlara müsbət keyfiyyətlər aşılanır, onlarda müvafiq adət və vərdişlər yaradılır. İnkişafetdirici prinsip deyəndə şagirdlərin psixi və fiziki qüvvələrinin inkişafı nəzərdə tutulur.

Fiziki qüvvələrə yerimək, qaçmaq, üzmək, tullanmaq və s. keyfiyyətlər daxildir. Psixi qüvvələrə isə duyğular, qavrayış, təsəvvür, təfəkkür, diqqət və s. aid edilir. Bunların hər biri şagirdlərə müəyyən tərbiyəvi təsir göstərə bilir. Ona görə də müəllim həmişə təlimin tərbiyəvi təsirindən səmərəli istifadə etməli, bu işdə əsas istiqaməti düzgün müəyyənləşdirməlidir. Bu prinsipin tətbiqi zamanı müəllim-şagird münasibətlərində xeyirxahlıq, insanpərvərlik, sadəlik, qayğıkeşlik nümayiş etdirilməli, hörmət və tələbkarlığın birləşdirilməsi özünü göstərməlidir.

Ümumiyyətlə, təlim prosesində bu prinsipin istər təhsilləndirici, istər tərbiyəedici, istərsə də inkişafetdirici əhəmiyyəti olduqca genişdir.

Müəllim tədris prosesində bunların hər birindən səmərəli istifadə etməli, şagirdlərin inkişafına nail olmalıdır [3, s.101].

Deməli, Həyat bilgisi dərslərində ibtidai sinif müəllimləri öz kompetensiya imkanlarından istifadə etməklə şagirdlərin yaradıcı qabiliyyətlərini təlimin təhsilləndirici, tərbiyələndirici, inkişafetdirici prinsipinə istinad etməklə daha qane edici şəkildə formalaşdıra bilərlər. Tutaq ki, ibtidai sinif müəllimi Həyat bilgisinin tədrisi

prosesində təbiət hadisələri ilə bağlı məlumat verərkən müəllimlər şagirdlərin ekoloji bacarıqlarının formalaşdırılmasına xidmət edən ən müasir informasiyalardan istifadə edir, bu informasiyalar şagirdlərin təbiətə sevgisini artırır, təbiət hadisələrinə münasibətini yaxşılaşdırır.

Belə iş metodu şagirdlərin suyun saflığının qorunması, göllərin, çayların ekoloji təmizliyinə görə mübarizə imkanlarını genişləndirir, onların həyati bacarıqlarının aşkara çıxarılıb inkişaf etdirilməsinə xidmət göstərmiş olur. Deməli, bu prosesdə şagirdlər yeni informasiyalar almaqla təhsillənir, həmin informasiyaların fonunda həyati bacarıqlar qazanmaqla inkişaf edir və əxlaqi normalara, keyfiyyətlərə yiyələnməklə tərbiyələnirlər. Adı çəkilən prinsipə istinad etməklə müəllim öz kompetensiya imkanları hesabına şagirdlərə həm həyati bacarıqlar qazandırır, həm onların şəxsiyyətyönlülük səviyyəsini inkişaf etdirir, həm də onları tərbiyələndirir. Şagirdlər həyati bacarıqlar qazandıqları anda estetik bədii zövqə də yiyələnmiş olurlar.

Ümumtəhsil məktəblərinin ibtidai siniflərində həyata keçirilən eksperimental işin nəticələrinə əsaslanan praktik fəaliyyət proqramı hazırlanmış və ibtidai sinif müəllimlərinə çatdırılmışdır. Hansı ki, həmin materiallarda həyat bilgisi dərslərində ibtidai sinif müəllimlərinin kompetensiya imkanlarından istifadə etməklə şagirdlərin yaradıcılıq qabiliyyətləri ilə bağlı praktik fəaliyyət nümunələri bu sahədə çalışan ibtidai sinif müəllimlərinə və digər mütəxəssislərə istiqamət vermək baxımından mühüm əhəmiyyət kəsb edir.

*İbtidai siniflərin Həyat bilgisi dərslərində şagirdlərin yaradıcı qabiliyyətlərini formalaşdıran zaman təlimin elmilik prinsipinə istinad etməyin faydaları.* İbtidai siniflərin Həyat bilgisi dərslərində şagirdlərin yaradıcı qabiliyyətlərini formalaşdıran zaman təlimin elmilik prinsipinə də istinad etmək faydalı hesab olunur.

Müdriklər demişkən, "Elmsiz təlim, təlimsiz elm ola bilməz". Təlimdə elmilik prinsipi o deməkdir ki, şagirdlərə verilən məlumatlar, müəllimin pedaqoji işdə atdığı hər bir addım, dərsin hər hansı bir mərhələsində şagirdlərə aşılanacaq bilik, bacarıq və vərdişlər elmi cəhətdən əsaslandırılır. Bu prinsipin köməyi ilə müxtəlif elmlər sahəsindəki yeniliklər təlimin məzmununa gətirilir. Elmilik prinsipinə bir sıra başlıca tələblər verilir:

1. Şagirdlərin elmi biliklərə yiyələnmələri üçün öyrəndikləri predmet və hadisələrin düzgün, obyektiv şəkildə qavramalarını təmin etmək lazımdır;

2. Şagirdlər predmetlərin mühüm əlamətlərini və xassələrini, predmet və hadisələr arasındakı əlaqələri və münasibətləri dərindən dərk etməlidirlər;

3. Tədrisin elmiliyi həm də terminlərin dəqiq tətbiqinə əsaslanır. Elmdə yalnız qəbul edilmiş terminlərdən istifadə etməli və köhnə terminləri isə müqayisə edilməlidir;

4. Öyrənilən predmet və hadisələri düzgün mənimsəmək üçün şagirdlər onların müasir elmi mahiyyətini, daxili qanunauyğunluqlarını dərk etməlidirlər.

Öyrənilən şagirdlərin inkişaf mənzərəsi onların təsəvvürlərində canlandırılmalıdır. Elmilik prinsipi tədris materiallarının öyrədilməsi ardıcıllığında nəzərə alınmalıdır. İstər dərslikdə, istərsə də müəllimin şərhində şagirdə verilən biliklər ardıcıl, əlaqəli, şagirdlərin başa düşəcəkləri səviyyədə təqdim edilməlidir [1, s. 160].

Bu, o deməkdir ki, həyat bilgisi dərslərində hər hansı mövzunun tədrisi zamanı mövzuda cərəyan edən hadisələrin, predmetlərin, hətta kiçik detalların elmi mahiyyəti aydınlaşdırılmalıdır. Məsələn, IV sinfin Həyat bilgisi dərsliyində verilən "Bayramlar" mövzusunun tədrisi prosesində ibtidai sinif müəllimləri həmin bayramların elmi, qneseoloji köklərini aydınlaşdırmalı və onların elmi-tərbiyəvi əhəmiyyətini şərh etməlidirlər. Məsələn, əgər "Bayramlar" mövzusunun tədrisində söhbət Novruz bayramından gedirsə, Novruz bayramının yaranma tarixi, milli mənəvi dəyərlərdən biri olması, su, yel, od, torpaq çərşənbələrinin rəmzi məna çalarları elmi cəhətdən əsaslandırılmalıdır. Əlbəttə, bu zaman öz kompetensiya imkanlarından istifadə edən müəllimlər verilən informasiyalara uyğun olaraq şagirdlərdə milli-mənəvi dəyərlərimizə hörmət etmək bacarıqlarının formalaşdırılmasına da nail ola bilərlər.

İbtidai siniflərdə Həyat bilgisinin tədrisi prosesində şagirdlərdə yaradıcı qabiliyyətləri aşkara çıxartmaq üçün təlimin hümanistləşdirilməsi prinsipinə istinad etmələri də vacib sayılır.

Humanistləşdirmə prinsipi müəllim və şagird fəaliyyətləri arasında qarşılıqlı əlaqəyə, dərin ehtirama, hörmətə, qayğıya əsaslanır. Şagird

şəxsiyyətinə hörmət, onunla əməkdaşlığa hazır olmaq, xoş münasibət və ünsiyyət yaratmaq humanistləşdirmə prinsipinin əsasını təşkil edir. Buna əməl edən müəllim həmişə uğur qazanır, şagirdlər onu sevir, fənlərinə böyük maraq göstərirlər. Əks halda müvəffəqiyyət qazanmaq mümkün deyil. Qorxuya, cəzaya əsaslanan təlim istər müəllim, istərsə də şagirdə heç nə vermir.

Humanist pedaqoq Melonxton hər gün məktəbə gələrkən üzünü uşaqlara tutub deyərmiş: "Sabahınız xeyir, gələcəyin müəllimləri, həkimləri, nazirləri. Sabahınız xeyir!" Bəzən ətrafdakılar buna gülərmiş. Deyərmişlər: "Nə üçün belə deyirsiniz?" O cavab verirdi: "Bəli, mən bunların hər birində gələcəyin o insanlarını görürəm".

Göründüyü kimi, təlim-tərbiyə müəssisəsində şagirdin şəxsiyyətinə, mənliyinə, ləyaqətinə hörmət edilməlidir. Müəllim öz şagirdini sevməlidir. Şərq xalqlarının bir məsəlində deyildiyi kimi: "Müəllimə hörmət etməklə müəllim ola bilərsən". Müəllim hər bir şagirdin cəmiyyətə yararlı, gərəkli adam olduğunu başa salmalı və onda inam yaratmalıdır. Belə münasibətlər humanist münasibətlərdir. Humanist münasibətlər imkan verir ki, müəllimlə şagird arasında söhbətlər açıq ürəklə aparılsın. Çünki sərbəst fikir mübadiləsi onların hər ikisinə çox şey verə bilər. Y.A. Komenski yazırdı ki, şagirdlərin hər şeyi darıxmadan yerinə yetirməsi üçün onlara atalıq qayğısı ilə yanaşmaq lazımdır. Onlar bilsinlər ki, müəllimlər onların mənəvi valideynləridir. Bu baxımdan Həyat bilgisi dərslərində müəllimin şagirdlərə humanist yanaşması onlarda bir sıra yaradıcı qabiliyyətlərin aşkara çıxarılmasına təkan vermiş olur. Həyat bilgisi dərslərində "Valideyn və böyüklərlə münasibətlər" rubrikası altında verilən mövzuların hər birinin tədrisində şagirdlərə humanist yanaşma elementləri aşılamaq mümkündür. Yəni belə mövzuların tədrisi zamanı müəllimlərin kompetensiya imkanlarından istifadə etmələri üçün hər cür şərait mövcuddur. Ona görə ibtidai sinif müəllimləri həmin imkanlardan istifadə etməklə şagirdlərin yaradıcı qabiliyyətlərinin aşkara çıxarılmasına, inkişaf etdirilərək formalaşdırılmasına nail ola bilərlər. [6, s. 173-178].

Bunun üçün həm də təlimin sistemlilik və ardıcıllıq prinsipinə də istinad etmək lazım gəlir. Bu prinsipin tətbiqi zamanı didaktik materialın tərtibi, biliklərin verilməsi sistem halında olmalıdır. Sistemlilik mövzunun məzmunundakı məntiqə əsaslanmalıdır. Mövzunun bitmiş hissələri, bölmələri bu sistemin başlıca ünsürləridir. Müşahidələr göstərir ki, təlimdə sistemliliyin və ardıcıllığın pozulması biliklərin mənimsənilməsini son dərəcə çətinləşdirir. Biliklərin sistemli şəkildə mənimsənilməsi şagirdlərin idrak qüvvələrinin və qabiliyyətlərinin ardıcıl inkişafını təmin edir. Şagirdlərin təfəkkürü məhz bunun sayəsində inkişaf edir. İbtidai siniflərdə adi və çox da böyük olmayan şeir parçalarının öyrənilməsi şagirdlərin yaddaşının möhkəmlənməsinə təsir göstərir, müəllim məhz bunun sayəsində öyrənilən materialın həcmini tədricən artırmaq, orta və yuxarı siniflərdə bu sahədə onları çətin tapşırıqlara hazırlamaq imkanı əldə edir [6, s. 19-21]. Ona görə də kompetensiyalara əsaslanan ibtidai sinif müəllimləri şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılması işini müvafiq sistem üzrə, məqsədyönlü ardıcıllıqla həyata keçirmələri haqqında danışılan problemin müvəffəqiyyətlə həll olunmasına düzgün istiqamət vermiş olur. Müəyyən sistem üzrə müvafiq ardıcıllıqla aparılan işlər şagirdlərə bədii yaradıcılıqla bağlı tapşırıqların şüurlu surətdə və fəal şəkildə mənimsəmələrinə həmin tapşırıqların heç kəsin köməyi olmadan müstəqil olaraq yerinə yetirmələrinə prinsipial olaraq yanaşmaq lazım gəlir. Məhz ona görə prinsipin adı təlimdə şüurluluq, fəallıq və müstəqillik prinsipi kimi qəbul edilir. Şüurluluq, fəallıq və müstəqillik prinsipinə istinad etməklə şagirdləri yaradıcı fəallığa istiqamətləndirmək daha asan olur.

Həyat bilgisinin tədrisi prosesində ibtidai sinif müəllimləri şagirdlərin yaradıcı qabiliyyətlərini əyanilik prinsipinə istinad etməklə daha səmərəli şəkildə formalaşdıra bilərlər. Böyük çex pedaqoqu Y.A. Komenskinin "qızıl qayda" adlandırdığı əyanilik prinsipinə istinad etməklə şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılması üçün bir sıra tələblərin gözlənilməsi də vacib sayılır.

Həyat bilgisi dərslərində ibtidai sinif müəllimləri şagirdlərin yaradıcı qabiliyyətlərini formalaşdırmaq üçün təlim prinsiplərinə məqsədyönlü şəkildə istinad etməklə yanaşı təlim metodlarının tətbiqinə də üstünlük verməlidirlər. Ona görə ki, Həyat bilgisi dərslərində onlar şagirdlərdə ən zəruri bacarıqları aşkara çıxar-

maq üçün təlim metodlarından da istifadə etməyi bacarmalıdırlar. Bunun üçün bir sıra aparıcı təlim metodları mövcuddur. Hansı ki, həmin metodlar içərisində reprodiktiv metodlar, informasiya reseptiv metodlar, problemli təlim metodları ilə yanaşı, problemli şərh metodu, qismən axtarıcılıq metodu, tədqiqatçılıq metodu, nəql metodu, izah metodu, məktəb mühazirələri metodu, müsahibə metodu, kitab üzərində iş metodu, müşahidə metodu, demonstrasiya metodu, illüstrasiya metodu, ekskursiya metodu, çalışma metodu, laborator işlər metodu, yaradıcı işlər metodu, təlimin texniki vasitələrilə iş metodu, audiometodlar, videometodlar, audiovideo metodlar, proqramlaşdırılmış təlim metodu, qruplarla iş metodu, cütlərlə iş metodu, dərsliklərlə iş metodu, əqli hücum metodu, bibö metodu, söz assosiasiyaları metodu, şaxələndirmə metodu, debat metodu, rollu oyunlar metodu adı altında orta ümumtəhsil məktəblərimizdə tətbiq olunan metodları göstərmək olar. Bu metodların hər birini tətbiq etməklə şagirdlərin müvafiq yaradıcı qabiliyyətlərinin aşkara çıxarılmasına nail olmaq mümkündür. Məhz ona görə ibtidai sinif müəllimləri bir sıra aparıcı təlim metodlarını tətbiq etməklə şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılmasına nail ola bilərlər. Nümunə üçün biz həmin aparıcı metodlardan birinin tətbiqi imkanları barədə mühakimələr yürütməklə ibtidai sinif müəllimlərinə bu barədə metodik istiqamət verməyi məqsədəuyğun hesab edirik.

Kitab üzərində iş metodu kompetensiyalara əsaslanan təhsilin məzmununun yaradılması işində tətbiqinə zəruri ehtiyac olan ən səmərəli metodlardan hesab olunur. Bu metodun məqsədi şagirdə əsas bilik mənbəyi olan kitabı oxumaq vərdişlərini aşılamaqdan ibarətdir. Pedaqoji ədəbiyyatdan məlum olduğu kimi kitab üzərində iş metodunu bir neçə mərhələdə həyata keçirdikdə daha səmərəli xarakter daşıyır. Şagird:

a) mətni oxuyur mövzu üzrə fakt və hadisələri mənimsəyir;

b) ikinci dəfə mətni oxuyur, onu yadda saxlamağa çalışır;

v) oxuduğu mətni öz-özünə danışır;

q) öyrəndiyi nəzəri biliyi praktikaya tətbiqi haqqında düşünür;

d) yoldaşları ilə öyrəndiklərini müzakirə edir [1, s. 254].

Bütün hallarda şagirdlərin yaradıcı qabiliyyətlərinin inkişafı üçün şərait yaranmış olur. Müəllim öz kompetensiya imkanlarından səmərəli şəkildə istifadə etməklə həmin yaradıcı qabiliyyətlərin formalaşdırılmasına nail ola bilər. Məqsədyönlü, planlı, mütəşəkkil olaraq həyata keçirilən müşahidə, müsahibə, kitab üzərində iş metodlarından sonra müəllimin şərhi bu işin məntiqi davamı kimi dəyərləndirilə bilər.

Beləliklə, bu nəticəyə gəlirik ki, ibtidai sinifdə Həyat bilgisi dərslərində şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılması işinə ilk müşahidələrdən başlamaq lazımdır. Ona görə ilk tətbiq edilən metod müşahidə metodu hesab olunur. Həyat bilgisi dərslərində didaktik proseslərə yaradıcı yanaşan müəllim şagirdlərdə müşahidə etdiyi yaradıcı qabiliyyətlərin tənzimlənməsinə və inkişaf etdirilməsinə cəhd göstərməlidir. Müşahidə başa çatdıqdan sonra müəllim şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılmasına kreativ yanaşmalıdır. Bu zaman müəllim kiçik müsahibələr apara bilər. Həmin müsahibələri isə müəllim sual-cavab formasında da həyata keçirə bilər. Sual-cavab həm dərsin əvvəlində, keçmiş biliklərlə, həm də dərsin sonunda yeni öyrənilmiş materialla əlaqədar keçirilə bilər. Hər iki halda biliyin təkrarlanması ön mövqeyə çıxsa da, bu zaman şagirdlərin biliyi necə mənimsədikləri, anlayışları, faktları, onlar arasındakı səbəb-nəticə əlaqələrini hansı dərəcədə düzgün dərk etdikləri aydınlaşır. Həyat bilgisi dərslərində hər hansı mövzunun tədrisi prosesində şagirdlərin yaradıcı qabiliyyətlərini aşkara çıxarmaq istəyən müəllim sual-cavab şəraitində öz kompetensiya imkanlarından səmərəli istifadə etməlidir. Bu zaman onlar verdikləri suallardan aldıqları cavabları saf-çürük edir, həmin cavablar arasındakı səbəb-nəticə əlaqələrinin məzmununu öyrənərək aydınlaşdırırlar.

*Şagirdlərin yaradıcı qabiliyyətlərin formalaşdırılmasında müəllimin şərhi* ən səmərəli metodlardan biri kimi xüsusi əhəmiyyətə malikdir. Pedaqoji ədəbiyyatda müəllimin şərhi metodunun üç mərhələsi ayırd edilir: 1) Yeni biliyin mənimsənilməsinə şagirdlərin hazırlığı. Bu mərhələdə yeni biliyin mənimsənilməsi üçün zəruri olan biliklər xatırlanır, keçmiş biliklərlə yeni bilik arasında əlaqə yaradılır; 2) Yeni biliyin verilməsi. Bu mərhələdə tədris proqramında nəzərdə tutulmuş biliyin şagirdlərə verilməsi zamanı

müəllim müəyyən şərtlərə əməl etməlidir. Ilk növbədə, müəllimin nitqi aydın olmalı, hadisələrin obrazlı şərhinə diqqət yetirilməli, faktlar dəqiq izah olunmalıdır. Şərhin maraqlı olması üçün bu mərhələdə müəllim: a) müxtəlif kitablardan parçalar oxuya bilər; b) sual-cavabdan istifadə edərək, şagirdləri fəallaşdıra bilər; v) əyani vasitələrdən istifadə edə bilər və s.; 3) verilmiş biliyin ümumiləşdirilməsi. Bu mərhələdə müəllim fikrini ümumiləşdirir, nəticə çıxarır və şagirdlərlə sual-cavab keçirir. [1, s. 258]. Bütün bunları müəllim öz kompetensiya imkanlarından istifadə etməklə reallaşdırır. Məhz belə olduğu halda şagirdlərin yaradıcı qabiliyyətlərinin həm aşkara çıxarılması, həm inkişaf etdirilməsi, həm də formalaşdırılması üzrə həyata keçirilən mərhələli işin nəticəsi səmərəli olur.

Həyat bilgisi dərslərində şagirdlərin həyati bacarıqlarının formalaşdırılmasına istiqamət verən ən səmərəli metodlardan biri də illüstrasiya və demonstrasiya metodudur. Bu metodun köməyi ilə şagirdlərin yaradıcı qabiliyyətlərinin aşkara çıxarılmasına xidmət edən, bu sahədə daha çox təsiredici imkanlara malik olan illüstrasiyaların, əyani vəsaitlərin rolu daha böyükdür. Bu xüsusda müəllifləri professorlar A.N. Abbasov, H.Ə. Əlizadə olan "Pedaqogika" adlı dərs vəsaitində göstərilir ki, yeni biliyin əldə edilməsində əyani vasitələrin rolu əvəzsizdir. Təcrübəli müəllimlər yeni biliyin izahı zamanı əyani vasitələrdən səmərəli şəkildə faydalanırlar. Məktəb təcrübəsində əyani vəsaitdən istifadə iki istiqamətdə həyata keçirilir. 1) statistikada olan hadisələrin (şəkil, qrafik, tablo, sxem və s.) nümayişi; 2) dinamikada olan hadisələrin (kino-lentlərin və s.) nümayişi. Birinci illüstrasiya, ikinci isə demonstrasiya metodu adlanır [1, s. 261]. Göstərilən bütün hallarda şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılması üçün geniş imkanlar açılır. Ona görə də pedaqoji imkanlar kimi nəzərdə tutulan metodların tətbiqinə məqsədyönlü, planlı, mütəşəkkil olaraq yanaşmaq lazım gəlir.

Həyat bilgisi dərslərində şagirdlərə həyati bacarıqların aşılanması işində pedaqoji texnologiyaların və innovasiyaların gücündən də istifadə etmək faydalı hesab olur. Pedaqoji texnologiyalar vasitəsilə müəllimin fəaliyyətinin qnostik, layihələşdirici, konstruktiv, təşkilatçılıq, kommunikativ (ünsiyyət) komponentlərinin rolu böyükdür. Pedaqoji texnologiyalarla yanaşı, pedaqoji innovasiyaların gücündən də istifadə etməklə şagirdlərə daha faydalı həyati bacarıqlar aşılamaq mümkündür.

Pedaqoji innovasiyalar ənənəvi olaraq iki növə ayrılır:

1. *Nəzəri innovasiyalar*. Buraya təlim-tərbiyə prosesində istifadə olunması nəzərdə tutulan qanunauyğunluqların, prinsiplərin, tələblərin, üsulların, yolların, priyomların, elmi fərziyyələrin nəzəri əsaslarının müəyyənləşdirilməsi daxildir. Hansı ki, bu nəzəri əsaslar aparılan elmi tədqiqatlar, araşdırmalar, eksperimental işlər nəticəsində nəzəriyyə şəklində sistemləşdirilir.

2. *Praktik (təcrübi) innovasiyalar*. Buraya didaktikanın ayrı-ayrı sahələrində, təlim-tərbiyə prosesində və məktəbin idarəolunmasında tətbiq olunan yeni innovasiya, kommunikasiya texnologiyalarından, yeni metodikalardan, yeni qaydalardan, proqram və layihələrdən praktik əsaslar üzrə istifadəsi daxildir [4, s.179].

Göstərilən pedaqoji əsasların bütün kompleksi əgər birinci halda ibtidai sinif müəllimlərinin kompetensiyalara əsaslanmaları ilə bağlı imkanlarını genişləndirirsə, ikinci halda həmin imkanlardan istifadə etməklə şagirdlərin yaradıcı qabiliyyətlərinin formalaşdırılmasına istiqamət vermiş olar.

**Problemin aktuallığı.** Dərsin dövlətin və fərdin tələblərinə cavab verməsi bütün dövrlərdə aktual pedaqoji problemlərdən biridir.

**Problemin elmi yeniliyi.** Məqalədə ibtidai sinif şagirdləri ilə işləyən müəllimlərin dərs prosesində tətbiq etdikləri metodlar araşdırılmış və tətbiq etdikləri maraqlı metodları təhlil olunmuşdur.

**Problemin praktik əhəmiyyəti.** Məqalə ibtidai sinif müəllimləri üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Abbasov, A.N. Pedaqogika / A.N. Abbasov, H.Ə. Əlizadə. – Bakı, -2000.
2. Hüseynov, Ə.M. Təbiətşünaslıq. III sinif üçün dərslik. / Ə.M. Hüseynov, -Bakı: Əlfərül, -2005.
3. Rüstəmov, F.A. Azərbaycan pedaqogikaşünaslığı. Dərslik. / F.A. Rüstəmov. Bakı, "Elm və təhsil" nəşriyyatı, 2016.
4. Sadıqov, F.B. Tərbiyəşünaslıq. / F.B. Sadıqov, O.Q. Həsənli. - Bakı: "Elm və təhsil" nəşriyyatı, -2016.

5. SOCAR - 2010. Təbiətlə harmoniyada (albom). Bakı: Nurlar, -2011.
6. Humanizm tərbiyəsi və onun sosial-psixoloji xüsusiyyətləri. ARTİ-nin Elmi əsərləri, 2018, № 3
7. Abbasov, A.N. Təhsilin modernləşdirilməsinin aktual problemləri. / A.N. Abbasov, Sadıqov F.B. -Bakı: Mütərcim, -2013, -412 s.
8. Ağayev, Ə.A. Təlim prosesi: Ənənə və müasirlik. / Ə.A. Ağayev -Bakı: Adiloğlu,- 2004, -113 s.
9. Azərbaycan respublikasının təhsil sahəsində islahat proqramı / H.H. Əhmədov. Azərbaycan təhsilinin inkişaf strategiyası. -Bakı: Elm, -2010, -800 s.
10. "Təhsil haqqında" Azərbaycan Respublikasının qanunu. -Bakı: Qanun, -2009, -109 s.
11. Bayramova, L. Kurikulum və Pedaqogika. (İzahlı və praktik tövsiyələrlə) / L. Bayramova -Bakı: I nəşr. -2019.

**E-mail:** pedaqoq1984@mail.ru
**Rəyçilər:** *ped.elm.dok., prof.* **F.B. Sadıqov**
*ped.ü.fəls.dok., dos.* **S.Ə. Məmmədov**
**Redaksiyaya daxil olub:** 20.01.2023.

***KİMYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ХИМИИ***
***METHODS OF TEACHING CHEMISTRY***

*UOT 372.854*

***Yasin İsa oğlu Cəfərov***
*kimya elmləri doktoru, dosent*
*Bakı Dövlət Universiteti*

***Nərgiz Firudin qızı Əhmədova***
*kimya üzrə fəlsəfə doktoru*
*Bakı Dövlət Universiteti*

***Aysel Çingiz qızı Zeynalova***
*Bakı Dövlət Universiteti*

# ŞAGİRDLƏRİN İDRAK MARAĞININ İNKİŞAFI ÜÇÜN "KİMYA İNSAN HƏYATINDA" ELEKTİV KURSUNUN TƏŞKİLİ VƏ KEÇİRİLMƏSİNİN ƏHƏMİYYƏTİ

***Ясин Иса оглы Джафаров***
*доктор химических наук, доцент*
*Бакинский Государственный Университет*

***Наргиз Фирудин гызы Ахмедова***
*доктор философии по химии*
*Бакинский Государственный Университет*

***Айсель Чингиз гызы Зейналова***
*Бакинский Государственный Университет*

# ЗНАЧЕНИЕ ОРГАНИЗАЦИИ И ПРОВЕДЕНИЯ ЭЛЕКТИВНОГО КУРСА «ХИМИЯ В ЖИЗНИ ЧЕЛОВЕКА» ДЛЯ РАЗВИТИЯ ПОЗНАВАТЕЛЬНОГО ИНТЕРЕСА ШКОЛЬНИКОВ

***Yasin Isa Jafarov***
*doktor of chemical sciences, associate professor*

*Baku State University*

***Nargiz Firudin Akhmedova***
*doctor of philosophy in chemistry*
*Baku State University*

***Aisel Chingiz Zeinalova***
*Baku State University*

# THE VALUE OF ORGANIZING AND CONDUCTING THE ELECTIVE COURSE "CHEMISTRY IN LIFE" FOR THE DEVELOPMENT OF COGNITIVE INTEREST OF SCHOOLCHILDREN

**Xülasə.** Məqalə orta məktəb şagirdlərinin kimya fənninə idrak marağının inkişafı üçün dəyərli olan "Kimya insan həyatında" elektiv kursunun təşkili və keçirilməsi mərhələlərinə həsr olunmuşdur. Hal-hazırda orta məktəbdə ixtisas təhsilinin tətbiqi elektiv kurslar kimi tədris fəaliyyətinin formasına maraq oyadır. İxtisas hazırlığının bir hissəsi kimi kimya üzrə elektiv kurslar məktəb kimya təhsilinin tərkib hissəsi olaraq şagirdlərin ətrafında olan və onları əhatə edən yayılmış maddələr, onların insan həyatındakı rolu və gündəlik həyatda bu maddələrdən düzgün istifadə qaydaları ilə tanış edir.

"Kimya insan həyatında" elektiv kurs şagirdlərdə kimya fənninə qarşı marağın yaranması və artmasına, yaradıcı təfəkkürün inkişafına, kimyəvi eksperimentlərin aparılmasına, məktəblilərin düzgün ixtisas seçimini müəyyənləşdirməsi və kimyəvi baxımdan tanış olan maddələr haqqında məlumat toplamağına köməklik edir. Bu kurs şagirdlərin əldə etdikləri biliklərin gündəlik həyatda istifadələrində, kimya ilə bağlı peşəyə yiyələnmələrində böyük tərbiyəvi təsirə malikdir.

***Açar sözlər:*** *elektiv kurslar, şagirdlərin idrak marağı, kimya insan həyatında, təfəkkürün inkişafı*

**Резюме.** Статья посвящена организации и проведению элективного курса «Химия в жизни человека» в общеобразовательной школе, который является ценным и необходимым для развития познавательного интереса школьников к химии. В настоящее время развитие профильного образования в средней школе вызывает интерес к такой форме образовательной деятельности, как элективные курсы. Элективные курсы по химии в составе основного школьного химического образования знакомят учащихся с окружающими их веществами, их ролью в жизни человека, а также с тем, как эти вещества используются в повседневной жизни.

Участие школьников в элективном курсе «Химия в жизни человека» вызывает рост интереса к химии, развивает их творческое мышление и навыки проведения химических экспериментов, помогает учащимся выбрать правильную специализация и собрать нужную увлекательную информацию об окружающих знакомых материалах. Этот курс оказывает большое воспитательное воздействие на учащихся при использовании знаний, полученных ими о повседневной жизни, и на приобретение профессий, связанных с химией.

***Ключевые слова:*** *элективные курсы, познавательный интерес к обучению, химия в жизни человека, развитие мышления*

**Summary.** This article is devoted to the organization and conduct of the elective course "Chemistry in life" in the secondary school, which is valuable and necessary for development of cognitive interest of schoolchildren in chemistry. At present time the development of the profile education at the secondary school arouses interest to such form of educational activity as elective courses. The elective courses on chemistry within the basic school chemical education acquaint pupils with the substances surrounding them, their role in human life, and how these substances are used in everyday life.

Schoolchildrens participation in the elective course "Chemistry in Human Life" arouses their interest in chemistry, develops their creative thinking and skills in conducting chemical experiments, helps students choose the right specialization and gather the necessary fascinating information about the familiar materials around them. This course has a great educational impact on students as they use the knowledge they gain about everyday life and to acquire chemistry-related careers.

***Key words:*** *elective courses, cognitive interest in learning, chemistry in human life, development of thinking*

Ümumi orta təhsilin müasirləşdirilməsi strategiyası təhsilin profilləşdirilməsini nəzərdə tutur. Ali məktəbdə ixtisas təhsilinin tətbiqi elektiv kurslar kimi tədris fəaliyyətinin formasına maraq oyatdı. İbtidai və orta məktəblərdə profiləqədər və profil hazırlığının bir hissəsi kimi kimya üzrə elektiv kurslar məktəb kimya təhsilinin tərkib hissəsidir. Bu baxımdan gələcək kimya müəllimlərində seçmə kursların məzmununun işlənib hazırlanması, onlar üçün proqramların və onun üçün metodiki vəsaitlərin yaradılması bacarıq və bacarıqlarının inkişaf etdirilməsi aktualdır.

Şagirdlərin idrak ehtiyaclarını ödəməyə imkan verən sinifdənkənar fəaliyyət təhsil prosesinin ayrılmaz hissəsidir [1-3]. Şagirdlərin sinifdənkənar fəaliyyəti məktəblilərin bütün fəaliyyət növlərini birləşdirir ki, burada da onların təhsili və sosiallaşması problemlərini həll etmək mümkündür və məqsədəuyğundur. Sinifdənkə-

nar fəaliyyət müəllim və şagirdin qarşılıqlı əlaqəsinin xüsusi formasıdır [4]. Şagird müəllimin rəhbərliyi altında yeni biliklər əldə edir və mənimsəyir, faktları araşdırır və nəticə çıxarır. Bu, müəllim və şagirdin əməkdaşlıq, birgə yaradıcılıq fəaliyyətidir. Düzgün təşkil edilmiş sinifdənkənar fəaliyyətlər hər bir şagirdin mənimsəmə qabiliyyətini artırır. Sinifdənkənar fəaliyyətlər bir sıra mühüm vəzifələri həll etməyə imkan verir:

1. Şagirdlərin dərs yükünü optimallaşdırmaq;
2. Şagirdlərin inkişafı üçün şərait yaratmaq;
3. Şagirdlərin yaş və fərdi xüsusiyyətlərini nəzərə almaq.

Qarşıya qoyulan məqsəd və vəzifələrdə şagirdlərin müstəqil fəaliyyəti, özünü təsdiq etmək istəyi, yeni biliklərə yiyələnmələri həmişə nəzərə alınır.

Kimya təhsilinin əsas vəzifələrindən biri şagirdin intellektini, onun məntiqi, nəzəri və digər təfəkkür formalarını inkişaf etdirməkdir. Təfəkkürün inkişafı şagirdlərdə kimyanın tədrisinə maraq yaradır. Kimyanın tədrisinə maraq yaradan vasitələrə isə fəal təlim metodları, laboratoriya işləri, elektiv kurslar, ekskursiyalar aid ola bilər [5-7]. Bu təlim metodlarının yerinə yetirilməsi kimyanın əsas anlayışlarının şagirdlər tərəfindən şüurlu şəkildə mənimsənilməsinə kömək edir, praktik bacarıqların əldə edilməsinə yönəldir. Şagirdlər kimya laboratoriyasında daxili nizam-intizamı, təhlükəsizlik qaydalarını öyrənir, kimyəvi reaktivlərlə, kimyəvi qablarla, cihazlarla işləmə vərdişlərini təkmilləşdirirlər.

“Kimya insan həyatında” elektiv kursu şagirdlərin maddələrin quruluşu haqqında əldə etdikləri biliklərinin dərinləşməsinə və kimyanın bir elm kimi inkişafına yönəlib. Ən çox yayılmış maddələri, onların insan həyatındakı rolunu və gündəlik həyatda bu maddələrdən düzgün istifadəni bilmək, gigiyenik maddələri seçməyi bacarmaq lazımdır.

Kimya zavodlarında və fabriklərdə əldə edilən maddələr, materiallardan hazırlanmış əşyalar və məmulatlar bizi əhatə edir. Bundan başqa, gündəlik həyatda hər bir insan bilmədən kimyəvi reaksiyalar aparır. Məsələn, sabunla yumaq, yuyucu vasitələrdən istifadə etmək və s. Bir dilim limonu bir stəkan isti çaya saldıqda rəngi solur. Burada çay lakmusa bənzər turşu göstəricisi kimi çıxış edir.

Kibrit yandırmaqla, qum və sementi su ilə qarışdırmaqla, əhəngi su ilə söndürməklə, kərpic yandırmaqla real, bəzən də kifayət qədər mürəkkəb kimyəvi reaksiyalar həyata keçiririk. Kibrit istehsalında qırmızı fosfordan istifadə edirlər. Belə ki, onun narın əzilmiş şüşə və yapışqanla qarışığını kibrit qutusunun kənarına çəkirlər. Tərkibi $KClO_3$ (Bertolle duzu) və kükürddən ibarət olan kibrit başlığı qutunun kənarına sürtdükdə alovlanma baş verir. Müasir kibritlərin bir neçə növü vardır. Məqsədinə görə kibritlər normal şəraitdə alovlanan, nəmə davamlı (rütubətli şəraitdə), küləyə davamlı (küləkdə işıqlandırılan) və digər növlərə ayrılır.

Qidaların hazırlanması da kimyəvi bir prosesdir. Yalnız qeyd etmək lazımdır ki, hər hansı bir canlı orqanizmdə çoxlu miqdarda kimyəvi reaksiyalar baş verir. Qidaların həzm edilməsi, insanların və heyvanların tənəffüs prosesləri kimyəvi reaksiyalara əsaslanır.

Şüşə istehsalında yalnız ümumi çirklənmə miqdarı 2-3%-dən çox olmayan ən təmiz kvars qum istifadə olunur. Şüşənin tərkibində $SiO_2$, $Na_2O$ və $CaO$ oksidləri var. Şüşədəki $Na_2O$ oksidi $K_2O$ oksidi ilə, $CaO$ oksidi isə $MgO$, $PbO$, $ZnO$, $BaO$ oksidləri ilə əvəz edilə bilər. Qələvi metalların oksidləri şüşənin suda həllolma qabiliyyətini artırır. Şüşəni suda həll olmayan hala gətirmək üçün ona əhəng, əhəngdaşı, təbaşir əlavə edilir. Bu maddələr eyni kimyəvi formula ($CaCO_3$) malikdir. Hər şüşədə bir qədər $Al_2O_3$ var. $B_2O_3$ şüşəni ani temperatur dəyişikliklərinə daha davamlı edir. Qurğuşun şüşənin sınma indeksini xeyli artırır.

Büllur şüşə - tərkibində müxtəlif miqdarda qurğuşun oksidi olan silikat şüşədir. Qurğuşunun miqdarı nə qədər çox olarsa, şüşənin keyfiyyəti bir o qədər çox olar. Büllur şüşə yüksək şəffaflıq, yaxşı parlaqlıq və yüksək sıxlıq ilə xarakterisə olunur. Kvars şüşə - tərkibində təmiz kvars qum ($SiO_2$) olan şüşədir. Kvars şüşənin ən mühüm xüsusiyyəti istənilən temperatur dəyişkənliyinə davamlı olmasıdır. Karandaşın qrafit hissəsinin istehsalı üçün az miqdarda hidrogenləşdirilmiş günəbaxan yağı əlavə edilməklə qrafit və gil qarışığı hazırlanır. Qrafit və gilin nisbətindən asılı olaraq müxtəlif yumşaqlıqda karandaş alınır. Rəngli karandaşların tərkibinə kaolin, stearin və kalsium stearat daxildir.

Kimya müəllimi şagirdləri sabun və yuyucu vasitələrin tarixi və istehsalı ilə tanış edərkən qeyd etməlidir ki, fransız kimyaçısı Şevrel stearin, palmitin və olein turşularını sabunlaşma reaksiyası zamanı yağların parçalanma məhsulu kimi kəşf etmişdir. Şevrel Şeele tərəfindən əldə edilən şirin maddəni qliserin adlandırdı. 40 il sonra Bertlo qliserinin təbiətini müəyyən etdi və yağların kimyəvi quruluşunu izah etdi. Müxtəlif yağların tərkibinə müxtəlif nisbətdə palmitin ($C_{15}H_{31}COOH$), stearin ($C_{15}H_{35}COOH$) və olein ($C_{17}H_{33}COOH$) turşuları daxildir.

Uzun müddətdir ki, sabun istehsalında iynəyarpaqlı ağacların qatranını emal etməklə əldə edilən kanifoldan istifadə edilmişdir. Kanifolun çox miqdarı sabunu yumşaq və yapışqan edir. Sabun yuyucu vasitə kimi istifadə edilməklə yanaşı, kosmetika istehsalında, cilalayıcı maddələrin, sulu boyaların hazırlanmasında da istifadə olunur.

Müəllim gigiyena vasitələri və kosmetik vasitələr haqqında danışarkən qeyd etməlidir ki, gigiyena yunanca “hygienos” sözündən götürülüb müalicə, sağlamlıq gətirmək, kosmetika yunan sözü olub, özlərini bəzəyən sənət deməkdir. Ən əhəmiyyətli gigiyena vasitələri, hər şeydən əvvəl, sabun və yuyucu vasitələrdir. Burada gündəlik həyatda ən çox istifadə olunan digər vasitələrə də diqqət yetiririk.

Kariyesin qarşısını almağın yollarından biri yeməkdən sonra dişləri fırçalamaq, ağızı yaxalamaqdır. Bu diş daşlarının əmələ gəlməsinin qarşısını alır. Dişlərin təmizlənməsi üçün ən qədim vasitələrdən birinin tütün külü olduğuna dair sübutlar vardır. Diş məcunları dişlərə qulluq üçün əsas vasitədir. Onlar tozlarla müqayisədə daha az aşınma qabiliyyətinə malikdir, istifadəsi rahatdır, daha çox səmərəliliyi ilə xarakterizə olunur. Diş məcunları gigiyenik və müalicə-profilaktika məcunlarına bölünür. Gigiyenik məcunlar yalnız təmizləyici və təravətləndirici təsirə malikdir. Müalicə profilaktika məcunları isə dişlərin və ağız boşluğunun müalicəsinə kömək edir. Diş məcunlarının əsas komponentlərinə aşındırıcılar, qatılaşdırıcılar aiddir. Müəyyən edilmişdir ki, diş məcunlarının komponentləri dişin mina təbəqəsinə təsir göstərə bilər. Buna görə də kalsium fosfatlar ($CaHPO_4$, $Ca_3(PO_4)_2$, $Ca_2P_2O_7$) aşınıdırıcı maddə kimi istifadə olunmağa başladı. Bundan başqa, diş məcunlarında aşındırıcı maddə kimi alüminium oksidi və hidroksidi, üzvi polimer maddələr, məsələn, natrium metil metakrilat istifadə olunur. Praktikada bir aşındırıcı maddə deyil, onların qarışığı istifadə olunur.

Dezodorantlar tərin xoşagəlməz qoruxusunu aradan qaldıran məhsullardır. Sağlam insanlarda tərin 98%-99%-i sudur. Tərlə birlikdə bədəndən metabolik məhsullar, sidik cövhəri, sidik turşusu, bəzi aminturşular, yağ turşuları, zülallar, steroid hormonlar xaric olur. Tərdəki mineral komponentlərə natrium, kalsium, maqnezium, mis, manqan, dəmir ionları, xlorid və yod anionları daxildir. Dezodorantların iki növü vardır. Bəziləri tər məhsullarının oksidləşməsinin qarşısını alaraq, tərlə ifraz olunan metabolik məhsulların parçalanmasına maneə törədir. İkinci növü isə tərləmə prosesinin qismən azalmasına səbəb olur. Buna antiperspirantlar deyilir. Alüminium, sink, qurğusun, xrom, dəmir, formaldehid duzları antiperspirantdır. Duzlar arasında alüminium birləşmələri ən çox antiperspirant kimi istifadə olunur. Hər iki növ dezodorantlara ətirlər əlavə edilir.

Sənayedə kosmetika vasitələri kimi dodaq boyaları, kremlər, şampunlar istehsal edilir. Kosmetika vasitələrinin əsas komponenti $Bi(NO_3)_3$-ün suda həll edilməsi nəticəsində əmələ gələn $BiO(NO_3)_2$-dir. Ən çox yayılmış kosmetik vasitələrdən biri dırnaq boyası nitrosellülozun üzvi həlledicilərdə həll olan məhluludur. Həlledici kimi aseton, müxtəlif spirtlər, etil efiri və onların qarışıqları istifadə olunur.

Gündəlik həyatda hidrogen-peroksidin məhlulları (3%, 6%, 10%) dezinfeksiyaedici kimi istifadə olunur. Hidrogen-peroksidin dezinfeksiyaedici kimi istifadə olunmasına səbəb tərkibindəki atomar oksigenin güclü oksidləşdirici xassəyə malik olmasıdır. Bundan başqa hidrogen-peroksiddən yumşaq ağardıcı vasitə kimi də istifadə olunur.

Keçmişdə yağlı şamlar donuz yağından hazırlanırdı. Sonra kimyəvi təmizlənir və mum kimi ağardılırdı. Yağlı şamlar yanan zaman çox tüstülənirdi. Əvvəllər parafin şamlar olduqca bahalı idi. Çünki parafin bitki maddələrinin qatranını distillə etməklə alınırdı. Daha sonralar isə İngiltərədə torfdan çıxarılmağa başladı. Müasir dövrdə şamlar parafin və serezinin qarışığından hazırlanır.

İnsanların sağlamlığının keşiyində dayanan, müasir təbabətdə işlənən minlərlə dərman maddələri, müalicə vasitələri də kimyanın məhsuludur. Kimyanın köməyi ilə minlərlə dərman preparatları hazırlanıb ki, bu preparatlar vasitəsi ilə müxtəlif xəstəliklərlə mübarizə aparmaq, onları müalicə etmək mümkündür. Məsələn, qızdırma xəstəliyinə qarşı kinə ağacının qabığından çıxarılan cövhərdən istifadə edilirdi. İndi isə sintetik üsulla alınan dərman preparatları bu xəstəliklə daha effektiv mübarizə aparmağa imkan verir.

Kimya bizim daxilimizdir. Çünki insan orqanizmi kimyəvi elementlərdən və maddələrdən ibarətdir. İnsan orqanizmində minlərlə reaksiyalar gedir. Bu reaksiyalar nəticəsinə əmələ gələn maddələr insanların yaşaması və fəaliyyət göstərməsində mühüm rol oynayır.

Beləliklə, "Kimya insan həyatında" elektiv kurslarında şagirdlərin cisim və maddələr haqqında əldə etdikləri məlumatlar, kimyaya aid anlayışlar onların elmi marağının inkişafına, biliklərin şüurlu şəkildə mənimsənilməsinə kömək edir, kimya fənninin tədris keyfiyyətini yüksəldir və kimyanın praktikyönlülük səviyyəsinin artmasına imkan verir.

**Problemin aktuallığı.** "Kimya insan həyatında" elektiv kursu şagirdlərdə kimya elminə idrak marağının formalaşması üçün nəzərdə tutulmuşdur.

**Problemin elmi yeniliyi.** Şagirdlərdə kimyaya idrak marağının inkişafına təkan verən metodoloji yanaşmalar və yeni texnologiyalar ali və orta məktəb müəllimləri, tələbə və şagirdlər tərəfindən tədris prosesinin asanlaşdırılması, pedaqoji peşəkarlığın inkişaf etdirilməsi üçün istifadə edilə bilər.

**Problemin praktik əhəmiyyəti.** "Kimya insan həyatında" elektiv kursu şagirdlərin kimyaya idrak marağının formalaşması və inkişafı üçün seçmə kurslardan istifadənin effktivliyini əsaslandırır.

**Ədəbiyyat:**


1. Abbasov Ə. 12 illik təhsilin bəzi pedaqoji problemləri. // Kurikulum, -2016, № 4, - s. 5-10
2. Məmmədova A.Z., Hənifəyeva A.Ə.. Kimya dərslərində şagirdlərin idrak fəaliyyətinin aktivləşdirilməsi vasitələri və imkanları. // Kimya məktəbdə, -2017, № 4, -s. 11-17
3. Ахметов М.А., Зорова Е.Ю. Обучение химии как процесс развития познавательных стратегий учащихся // Наука и школа, -2015, № 7, -с. 84-87
4. Заграничная Н.А., Миренкова Е.В. Диагностика метапредметных результатов при обучении химии в основной школе. 8-9 класс. / Изд-во Русское слово, -2020, -240 с.
5. Кусакина О.В., Плотникова М.С., Жарикова Е.А., Рыбкина Т. Методика разработки элективных курсов по химии для профильного обучения. //Успехи в химии и химической Технологии,-2008, Т. XXII, № 2, -с. 95-98
6. Малин А.Г., Боровских Т.А., Чернобельская Г.М. Внеурочная активность как ресурс раннего обучения химии // Наука и школа, -2017, № 5, -с.119-124
7. Пильникова, Н.Н. Система элективных курсов по химии в средней школе: Книга для учителя. - СПб.: «Реноме», -2014,- 216 с
8. Шабанова, И. А. Элективные курсы по химии. Ч. 1: учебно-методическое пособие / Томский государственный педагогический университет,- 2010, -60 с.


**E-mail:** *n_akhmed@mail.ru*

**Rəyçilər:** *ped.elm. dok.* **A.H. Əliyev,**
*ped.ü.fəls.dook., dos.* **K. Haqverdiyev**
**Redaksiyaya daxil olub:** 20.10.2022.

*UOT 372.854*

***Nigar Yasin qızı Babayeva,***
*kimya üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin baş müəllimi*
*ORCİD İD:0000-0001-8954-7210*

***Xədicə Məhəmməd qızı Qayıbova***
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# KİMYƏVİ RABİTƏ MÖVZUSUNUN TƏDRİSİNDƏ MÜASİR TƏLİM TEXNOLOGİYALARINDAN İSTİFADƏ

***Нигяр Ясин гызы Бабаева,***
*доктор философии по химии*
*старший преподаватель Азербайджанского*
*Государственного Педагогического Университета*

***Хадиджа Мухаммед гызы Гайыбова***
*Азербайджанский Государственный Педагогический Университет*

# ИСПОЛЬЗОВАНИЕ СОВРЕМЕННЫХ ОБУЧАЮЩИХ ТЕХНОЛОГИЙ ПРИ ПРЕПОДАВАНИИ ТЕМЫ ХИМИЧЕСКАЯ СВЯЗЬ

***Nigar Yasin Babayeva,***
*doctor of philosophy in chemistry*
*senior lecturer at Azerbaijan State Pedagogical University*

***Khadija Mehemmed Qayibova***
*Azerbaijan State Pedagogical University's*

# THE USE OF MODERN LEARNING TECHNOLOGIES IN TEACHING THE SUBJECT OF CHEMICAL BONDING

**Xülasə.** Məqalədə Kimyəvi rabitənin tədrisi zamanı şagird hazırlığının keyfiyyətinin təhsilin məzmunu, dərsin texnologiyası, onun təşkilati-praktik istiqamətindən, pedaqoji texnologiyalardan istifadə zərurətindən asılı olmasından, şəxsiyyətinin inkişafının onun informasiya cəmiyyəti şəraitində müstəqil məhsuldar fəaliyyətə hazırlanmasından, konstruktiv, alqoritmik təfəkkürün inkişafından, reproduktiv fəaliyyətin payını azaltmaqla yaradıcı təfəkkürün inkişafının təmin edilməsi, informasiya mədəniyyətinin formalaşdırılmasından, kimyəvi rabitələrin öyrədilməsi zamanı animasiyanın, kompüterdən istifadə etməklə kimyəvi modelləşdirmənin geniş tətbiqi öyrənməni daha əyani, başa düşülən və yaddaqalan olmasından, rəqəmsal qabiliyyətlərin inkişafından danışılır.

***Açar sözlər:*** *kimyəvi rabitə, səriştələr, rəqəmsal texnologiya, internet resursları, öyrənmə motivasiyası*

**Резюме.** В статье отмечается, что качество подготовки учащихся при преподавании Химической связи зависит от содержания обучения, технологии урока, его организационно-практической направленности, необходимости использования педагогических технологий, развития личности, подготовки для самостоятельной продуктивной деятельности в условиях информационного общества, развития конструктивного, алгоритмического мышления, снижения доли репродуктивной деятельности, обеспечения развития творческого мышления, формирования информационной культуры, а

также широкого применения анимации при обучении химии. Обсуждаются вопросы коммуникации, широкого применения химического моделирования с помощью компьютера, делающее обучение более наглядным, понятным и запоминающимся, а также развитие цифровых способностей.

***Ключевые слова:*** *химическая связь, компетенции, цифровые технологии, интернет ресурсы, мотивация к обучения*

**Summary:** In the article discussed the quality of student preparation during the teaching of chemical band depends on the content of education, the technology of the lesson, its organizational-practical direction, the need to use pedagogical technologies, the development of personality, the preparation for independent productive activity in the conditions of the information society, the development of constructive, algorithmic thinking, reducing the share of reproductive activity. ensuring the development of creative thinking, the formation of information culture, the wide application of animation during the teaching of chemical communications, the wide application of chemical modeling using a computer, making learning more visible, understandable and memorable, and the development of digital abilities.

***Key words:*** *chemical communication, skills, digital technology, internet resources, learning motivation*

Müasir dünyanın düzəni sürətli dəyişikliklərlə müşayiət olunur. Bütün sahələrdə olduğu kimi, təhsil sferası da bu dəyişikliklərin önündə gedir və hazırda müasir təhsilin məqsəd və vəzifələri də bu yeni məzmun və mahiyyət kəsb edir və fənlərin tədrisinin istiqaməti biliklərin mənimsənilməsindən daha çox səriştələrin formalaşmasına keçid alaraq şagird mərkəzli öyrənməyə yönəlir. Şagirdlərin öyrənmə fəaliyyətinin yalnız dərs prosesi ilə məhdudlaşmadığına baxmayaraq, yəni dərsdənkənar tədbirlər, dərnəklər, fakültativ məşğələlərlə davam etdirilməyindən asılı olmayaraq, dərs sinif sistemində tədris öyrənmə prosesinin əsas komponeneti olaraq qalır. Şagird hazırlığının keyfiyyəti təhsilin məzmunu, dərsin texnologiyası, onun təşkilati-praktik istiqaməti, ab-havası ilə müəyyən edilir, ona görə də tədris prosesində yeni pedaqoji texnologiyalardan istifadə zərurətə çevrilir. O cümlədən kimyanın tədrisində də müasir və səmərəli texnologiyaların tədris prosesinə tətbiqi fənnin dəyərini artıraraq mənimsənilməni asanlaşdırır, tərs sinif modeli şagirdlərin şəxsi inkişafını təmin edir, tədrisin motivasiyasını həyata keçirərək təlim prosesinin keyfiyyətinin və səmərəliliyinin yüksəldilməsinə şərait yaradır. Kimya fənni kurikulumunun şəxsiyyətyönlülük, nəticəyönlülük, tələbyönlülük, inteqrativlik prinsipləri əsasında hazırlanması, məzmunun nəticələr şəklində verilməsi, yeni qiymətləndirmə sistemindən tədrisdə istifadə edilməsi təhsildə olan yeni yanaşmalardandır [1].

Kimyanın tədrisində qruplarla, cütlərlə, bütün siniflə və fərdi iş formalarından, şaxələndirmə, problemli şərh, Venn diaqramı, BİBÖ, müzakirə və s. kimi metodlardan istifadə edilməsi təlimdə səmərəli nəticələr əldə olunmasına imkan yaradır [5].

Kimyadan kimyəvi rabitələrin öyrədilməsi prosesi kompüterdən istifadəni bir neçə əsas sahə ilə əsaslandırır: mikrodünyanın obyekt və hadisələrinin əyani təsviri; kimya məhsullarının istehsalının öyrənilməsi; kimyəvi təcrübə və kimyəvi reaksiyaların modelləşdirilməsi; test nəzarət sistemi kimyəvi rabitələrin öyrədilməsi zamanı animasiyanın, kompüterdən istifadə etməklə kimyəvi modelləşdirmənin geniş tətbiqi öyrənməni daha əyani, başa düşülən və yaddaqalan edir. Yalnız test sistemindən istifadə etməklə şagirdin biliyini yoxlamamalı, eyni zamanda kimyəvi rabitələrin öyrədilməsində məhz kompüterdən istifadə etməklə materialın mənimsənilmə dərəcəsinə nəzarət etmək mümkündür. Məsələn, məlum mövzunun tədrisi zamanı virtual laboratoriya, kimya rəqəmsal proqramlarının istifadəsi uşaqların bilik və bacarıqlarını əhəmiyyətli dərəcədə genişləndirir və kimyəvi rabitələrin mahiyyətini əyani başa düşməyi asanlaşdırır. Kimya dərsində kompüter dizaynının əsas üstünlüyü onun partlayıcı və yanğın təhlükəli prosesləri, zəhərli maddələrlə bağlı reaksiyaları, radioaktiv preparatları, bir sözlə, şagirdin sağlamlığı üçün bilavasitə təhlükə yaradan hər şeyi nəzərə alaraq istifadə edilməsidir. İKT-dən istifadə zamanı:

*Hazır elektron məhsulların istifadəsi;

*Multimedia təqdimatlarından istifadə;

*İnternet resurslarından istifadə;

*ACTIV Board proqram təminatından istifadə (interaktiv lövhələr üçün nəzərdə tutulmuş proqram təminatı-activeinspire, chemlab, unrealchemistry, labdisc);

*Layihə metodu ilə İKT-dən birgə istifadə edilməlidir.

Belə ki, şagirdlər rəqəmsal texnologiyalardan istifadə zamanı təkcə kimyəvi rabitələrin tədrisi mərhələsində deyil, həm də hazırlıq, dərsin strukturunun formalaşdırılması mərhələsində də dərsin fəal iştirakçılarına çevrilirlər. Multimedia telekommunikasiya xidməti istifadəçiyə istənilən tip informasiyanı göndərmək və qəbul etmək imkanı verir [7].

Kimyəvi rabitələr mövzusunun tədrisində yalnız ənənəvi tədris metodlarından istifadə etməklə problemi həll etmək mümkün deyil, məktəbdə aşağıdakı imkanları təmin edə biləcək şərait yaratmaq lazımdır və artıq bu imkanlar yaradılmaqdadır:

1. Hər bir şagirdin fəal idrak prosesinə cəlb edilməsi: kimyəvi rabitənin mahiyyətini açmaq, şagirdləri mövzuya yönləndirmək üçün, milkürəciklər, plastilin və çöplərdən əyani istifadə edərək, rəqəmsal səriştələri olanları isə tingercardda su, xörək duzu, hidrogen, oksigen, karbon qazı, metan molekulu modellərini modelləşdirməyi tapşırmaq yerinə düşər.

2. Problemləri çoxşaxəli həll etmək üçün birlikdə işləmək: əməkdaşlıq etmək, korporativ mədəniyyətə malik olmaq. Belə ki, bu modelləri qurmaq üçün müəllim də psixomotor və rəqəmsal səriştələrə malik olmalıdır.

Kimyəvi rabitələr mövzusunun tədrisində dərs prosesinin İKT- dən istifadə etməklə təşkili çox faydalıdır və bu günün zərurətidir ki, istənilən mövzu üzrə kimya müəllimi dərsini müasir texnologiyalar səviyyəsində qursun. Müasir texnologiyalardan istifadə olunmaqla qurulan dərs əyani, rəngarəng, informativ, interaktiv dərs olur. Müəllim və şagirdin vaxtına qənaət edir, şagirdin daha sürətli işləməsinə şərait yaradır, müəllim şagirdlə diferensial və fərdi şəkildə işləməyə imkan verir. Bu həm də o dərəcədə asan yoldur ki, müəllimə təlim nəticələrini tez izləməyə və qiymətləndirməyə imkan verir.

Kimyəvi rabitələr mövzusunun tədrisində müəllim didaktik materialları (tapşırıq variantları, cədvəllər, diaqramlar, cizgilər, çertyojlar və s.) hazırlamaq üçün müvafiq prosessor və redaktorlardan istifadə edərək mətn, rəqəmsal, qrafik və səs məlumatlarını emal edə bilər. Nümunə:



**Şəkil 1**: Metan molekulunun 3D quruluşu

Sual: Metan molekulunda kimyəvi rabitələrin əmələ gəlməsində neçə hibrid orbitalı iştirak edir? İzah: Metan ən ibtidai alkan molekuludur. Nəzərə alsaq ki, alkanlarda karbon atomları $sp^3$ hibridləşmə halındadır. Bir karbon atomunda bu halda dörd hibrid orbitalı iştirak edir. Metan molekulunun da tərkibi bir karbon atomundan ibarətdir. Deməli, metan molekulunda kimyəvi rabitə bir karbon atomunun dörd hibrid orbitalının və hidrogen atomunun s - orbitalları ilə örtülməsi hesabına əmələ gəlir. Cavab: 4 hibrid orbitalı iştirak edir.

Kimya müəllimi, ilk təcrübə olaraq, “Kimyəvi rabitə”lər mövzusunu Power Point təqdimat redaktorundan istifadə etməklə bu tədris materialı üzrə slaydlar yaratmaq və dərsdə təqdimatı nümayiş etdirmək istiqamətində qura bilər.

Məlum mövzunu kimya fənni üzrə mövcud hazır proqram məhsullarından istifadə etməklə qurmaq da motivasiya yarada bilər. Digər bir vasitə sinifdə elektron dərsliklərlə işin təşkilidir. Linkə daxil olmaqla, dərslik üzərində araşdırma apara bilərlər.[10]

https://www.trims.edu.az/site/resource.php?id=912

Və ya dərslikdəki QR kodları oxumaqla uyğun tapşırıqları işləməklə həm idraki, həm rəqəmsal bacarıqlar formalaşdırmaq imkanı olur.

https://www.trims.edu.az/site/resource.php?id=1534




**Şəkil 2**: 10-cu sinif dərsliyində QR kodla rəqəmsal işləmə imkanını əks etdirən tapşırıq

Kimyəvi rabitələr mövzusunun tədrisi zamanı dərsə və sinifdənkənar işlərə hazırlıq prosesində internetdə lazımi məlumatları axtarmaq, dərsdə bilavasitə internetdə lazımi məlumatları tapmaq üçün şagirdlərlə işi təşkil etmək, hazır proqramlardan istifadə edərək testlər hazırlamaq, müxtəlif oyunlar keçirtmək tədris prosesini maraqlı edən amillərdəndir.

https://learningapps.org/display?v=p4aunk6ek21




**Şəkil 3:** Learningapps.com tətbiqində hazırlanmış yarış tipli tapşırıq

Tapşırığın linkini və ya QR kodunu şagirdlərə göndərməklə də rəqəmsal bacarıq formalaşdırıb, inkişaf etdirmək olar. İnternet resurslardan məqsədyönlü istifadə şagirdlərin çətin mövzulara maraqlarının artmasına səbəb olacaqdır. [8] https://learningapps.org/watch?v=p4aunk6ek21

**Şəkil 4**: Atların yarışı tapşırığının QR kodu

Prinsipcə yanaşsaq, şagirdlər üçün bu gün İKT-dən istifadə edərək müxtəlif dərslər hazırlamaq heç də çətin deyil, şagirdlərdə rəqəmsal qabiliyyətlər güclüdür. Onlar üçün nə müxtəlif redaktor və prosessorlarla işləmək, nə internet resurslarından istifadə, nə də kompüter testi yeni və qaranlıq sahə deyil. Şagirdlər bütün bunlarla informatika dərslərində tanış olur, burada həm müəyyən İKT-nin imkanları, həm də konkret praktiki bacarıqlar haqqında təsəvvür əldə edirlər.

Kimyəvi rabitələr mövzusunun tədrisi zamanı hazır elektron məhsulların istifadəsi müəllim və şagirdin fəaliyyətini intensivləşdirməyə imkan verir, mövzunun mənimsənilməsini asanlaşdırır, tədrisinin keyfiyyətini yüksəltməyə imkan verir. Bir video animasiyanı misal çəkə bilərik [9].

https://www.youtube.com/watch?v=r8LVecBlAgs

Bu cür fəaliyyət görünmə prinsipini gözə çarpan şəkildə həyata keçirərək kimyəvi obyektlərin əsas cəhətlərini əks etdirir. Kimyəvi rabitələr mövzusunun tədrisi zamanı Multimedia təqdimatlarından istifadə tədris materialını alqoritmik şəkildə hərtərəfli strukturlaşdırılmış məlumatla doldurulmuş parlaq istinad təsvirləri sistemi kimi təqdim etməyə imkan verir. Bu zaman müxtəlif qavrayış kanalları iştirak edir ki, bu da məlumatı təkcə faktoqrafik deyil, həm də şagirdlərin uzunmüddətli yaddaşında assosiativ formada yerləşdirməyə imkan verir. Haqqında danışılan mövzunun öyrədilməsi üçün 15 səhifəlik slayd hazırlamaq mümkündür. Kimyəvi rabitələrin öyrənilməsi zamanı şagirdlər internet resurslarından istifadə edərək şəbəkədən təhsil baxımından əhəmiyyətli məlumatları əldə edir, məlumatı məqsədyönlü şəkildə tapmaq və verilmiş meyarlara uyğun sistemləşdirmək, informasiyanı fraqmentlərdə deyil, bütövlükdə görmək, informasiya mesajında əsas olanı vurğulamaq kimi bacarıqlara yiyələnirlər.

İnteraktiv lövhədən və ACTIV board proqram təminatından (proqram təminatı interaktiv lövhə üçün nəzərdə tutulmuşdur) istifadənin üstünlükləri müəllimlərə sinfin mərkəzindən yeni materialı izah etməyə imkan verir, pedaqoqlara istənilən proqram və veb resurs üzərində rəsm çəkməyə və yazmağa imkan verməklə improvizasiya və çevikliyi təşviq edir, çox vaxt və səy sərf etmədən dərs zamanı edilən hər hansı qeydlər də daxil olmaqla, lövhədəki şəkilləri saxlamağa və çap etməyə imkan verir, müəllimləri öyrənməyə yeni yanaşmalar axtarmağa ruhlandırır, peşəkar inkişafı stimullaşdırır, dərsləri maraqlı edir və motivasiyanı inkişaf etdirir, komanda işində iştirak etmək, şəxsi və sosial bacarıqları inkişaf etdirmək üçün daha çox imkanlar təmin edir, şagirdlər materialın daha aydın, daha effektiv və dinamik təqdim edilməsi nəticəsində daha mürəkkəb materialı başa düşməyə başlayır, müxtəlif öyrənmə üslublarından istifadə etməyə imkan yaranır, Kimya dərslərində İnteraktiv lövhədən istifadə vaxta qənaət etməyə, dərsi səmərəli təşkil etməyə, asanlıqla təhsil kolleksiyası yaratmağa imkan verir [6].

Müəllimlər xüsusi ehtiyaclara uyğunlaşaraq hər cür resurslara müraciət edə bilirlər. Şagirdlər həmçinin daha yaradıcı işləməyə başlayır və özlərinə güvənirlər.

**Problemin aktuallığı.** Yeni təlim texnologiyalarının tətbiqi yeni yanaşmalar tələb edir. Ona görə də tədris prosesində müasir təlim texnologiyalarından istifadə şagirdləri bilikləri əsaslı şəkildə əldə etmələrinə, şagirdlərdə məntiqi, tənqidi təfəkkürün inkişafına səbəb olur.

**Problemin elmi yeniliyi.** Kimyəvi rabitə mövzusunun tədrisində müasir təlim texnologiyalarından istifadə şagirdləri öyrənməyə, yeni yanaşmalar axtarmağa ruhlandırır, peşəkar inkişafı stimullaşdırır, dərsləri maraqlı edir, motivasiyanı və dərsin məhsuldarlığını artırır, şəxsi bacarıqları inkişaf etdirmək üçün daha çox imkan yaradır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə doktorantlar və gənc müəllimlər tədqiqatçılar üçün faydalı olacaqdır.

**Ədəbiyyat:**

1. Abbasov M.M., Əliyev A.H., Fərəcov M.S., Əliyev V.S. Ümumtəhsil məktəbləri üçün kimya fənni üzrə təhsil proqramı (kurikulumu) (VII-XI siniflər üçün)// Kimya məktəbdə,2014, № 2-3
2. Abbasov, M.M. Kimya. Ümumtəhsil məktəblərinin 7-ci sinfi üçün dərslik. / M.M. Abbasov., V.M. Abbasov, V.S. Əliyev -Bakı**:** Aspoliqraf**,** -2019. -96 s.
3. Abbasov, M.M. Kimya. Ümumtəhsil məktəblərinin 8-ci sinfi üçün dərslik. / M.M. Abbasov, V.M. Abbasov, A.M. Məhərrəmov [və b.]. -Bakı**:** Aspoliqraf**,** -2019. -200 s.
4. Həmidov, S. Kimya. Ümumtəhsil məktəblərinin 10-cu sinfi üçün dərslik. / S. Həmidov, F. Hüseynov, E. Abdullayev -Bakı: Şərq-Qərb , -2022, -200 s.
5. Məmmədova A.Z., Mehdiyeva G.Ə., Şamilova A.F., Hənifəyeva A.Ə. Kimyanın tədrisində innovasiya texnologiyalarından istifadə // Kimya məktəbdə, 2017, № 1, -s. 57-68.
6. Космодемьянская С.С. Методика обучения химии. / С.С. Космодемьянская,. С.И. Гильманшина. -Казань, -2011. -135 с.
7. https://az.wikipedia.org/wiki/ Multimedia
8. https://learningapps.org/
9. https://www.youtube.com/watch?v=r8LVecBlAgs
10. https://www.trims.edu.az/noduploads/book/quot-kimya-quot-fanni-uzra-8-ci-sinif-ucun-darslik-1566190917-478.pdf
11. https://www.trims.edu.az/noduploads/book/quot-kimya-quot-fanni-uzra-10-cu-sinif-ucun-darslik-1663931090-707.pdf

**E-mail:** babayevanigar1979@gmail.com
xediceqayibova@gmail.com
**Rəyçilər:** *kimya.ü.fəls.dok., dos.* **R.M. Ağayeva**
*kimya.ü.fəls.dok.* **G. V. Şadlinskaya**
**Redaksiyaya daxil olub:** 15. 02.2023.

## *XARİCİ DİLLƏRİN TƏDRİSİ METODİKASI*
## *МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИНОСТРАННЫХ ЯЗЫКОВ*
## *FOREIGN LANGUAGE TEACHING METHODS*

*UOT 372.881.113.31*

***Fatma Zakir qızı Ağayeva***
*fəlsəfə doktoru proqramı üzrə dissertant*
*Bakı Dövlət Universiteti*
https://orcid.org/0000-0001-9033-3121

# LİNQVİSTİK İDEOLOGİYANIN AZƏRBAYCAN VƏ FRANSIZ DİLLƏRİNDƏ MÜRACİƏT ETİKETLƏRİNƏ TƏSİRİ

***Фатма Закир гызы Агаева***
*диссертант по программе доктора философии*
*Бакинский Государственный Университет*

# ВЛИЯНИЕ ЛИНГВИСТИЧЕСКОЙ ИДЕОЛОГИИ НА ФОРМУЛЫ ОБРАЩЕНИЯ ВО ФРАНЦУЗСКОМ И АЗЕРБАЙДЖАНСКОМ ЯЗЫКАХ

***Fatma Zakir Aghayeva***
*doctorial student in the program of doctor of philosophy*
*Baku State University*

# INFLUENCE OF LINGUISTIC IDEOLOGY ON CALLING EXPRESSIONS IN AZERBAIJAN AND FRENCH LANGUAGES

**Xülasə.** Məqalədə Azərbaycan və fransız dillərində bəzi müraciət etiketlərinin tarixi inkişaf dinamikasına diqqət yetirilmişdir. Müraciət etiketlərinin dilçilik ideologiyasına təsiri nəzərdən keçirilmişdir. Eyni zamanda, dövrün siyasi-ictimai vəziyyətinin dildə, xüsusilə müraciət etiketlərində əksi nümunələrlə göstərilmişdir.
***Açar sözlər:*** *dilçilik ideologiyası, nitq etiketləri, müraciət etiketləri*

**Резюме**. Статья посвящена исторической динамике развития некоторых формул обращения в азербайджанском и французском языках. Рассмотрено влияние формул обращения на языковую идеологию. В то же время на примерах показано отражение политической и социальной ситуации того периода в языке, особенно в формулах обращениях.
***Ключевые слова***. *лингвистическая идеология, речевые этикеты, формулы обращения*

**Summary**. The article focuses on the historical development dynamics of some address formulas in the Azerbaijani and French languages. The impact of address formulas on linguistic ideology is considered. At the same time, the reflection of the political and social situation of the period in the language, especially in the address formulas, is shown with examples.
***Key words:*** *linguistic ideology, speech etiquette, address formulas*

İdeologiya termini XVIII əsrdə yaransa da, linqvistik ideologiya ifadəsi sosiolinqvistikanın və digər əlaqəli elmlərin təkamülü sayəsində yaxın keçmişdə meydana çıxmışdır. Linqvistik ideologiya sosiolinqvistika, antropologiya və müxtəlif mədəniyyətlərarası tədqiqatlarda dilin cəmiyyətdəki yeri ilə bağlı bir sıra inanc və hissləri xarakterizə etmək üçün istifadə olunan bir anlayışdır. Dilçilik ideologiyası (siyasi, iqtisadi, mədəni və s. digər ideologiya formaları kimi) ideologiyanın bir forması olub, tətbiq sahəsi dilin idarə edilməsidir. İdeologiya ölkədə,

onun bir hissəsində, şəhərdə və ya başqa bir siyasi-inzibati qurumda dillərin idarə edilməsinin əsaslandığı ideyalar sistemi ilə eyniləşdirilir. Dilçilik ideologiyasının yaranmasının əsas səbəblərindən biri çoxdilli cəmiyyətlərdə sosial sinif, dini səbəblərdən dolayı mövcud dilləri daha yaxşı idarə etmək ehtiyacıdır. Linqvistik ideologiya sözügedən dildə danışanların dillərinə və yaşadıqları ictimai-mədəni sistemə qarşı münasibətlərini, həmçinin həmin sosial situasiyada onların mövcudluğunun təsir və inkişaf xüsusiyyətlərini aşkara çıxararkən insanların təcrübələri, əhval-ruhiyyələri, həmçinin maddi və siyasi maraqları nəticəsində meydana gələn həmin dil(lər)lə bağlı fərziyyələrini göstərir. Dilçilik ideologiyasının əsas məqsədi cəmiyyətin üzvləri arasında daha yaxşı ünsiyyəti təmin etməkdir.

Nitq etiketlərinin ünsiyyət prosesində istifadəsi cəmiyyətin gözə görünməyən dilçilik ideologiyasını əks etdirən mürəkkəb bir hadisədir. Nitq etiketləri qarşı tərəfə nəzakət və hörmət işarəsi olaraq hər zaman ünsiyyət prosesinin vacib bir elementi hesab olunur. Bununla belə, sözügedən nitq vahidlərinin istifadəsi situasiyadan, kontekstdən və tərəflər arasındakı münasibətdən asılı olaraq dəyişə bilər.

Nitq etiketlərinin dilçilik ideologiyası ümumilikdə cəmiyyətdən təsirləndiyi kimi, bir mədəniyyətdən digərinə nisbətdə də əsaslı surətdə dəyişiklik göstərə bilir. Bəzi mədəniyyətlərdə nitq etiketlərinin istifadəsi qarşı tərəfə hörmət və nəzakət əlaməti hesab olunsa da, digər mədəniyyətlərdə o lazımsız və rəsmi hesab oluna bilər.

Bundan başqa, nitq etiketlərinin istifadəsi tərəflər arasındakı münasibətlərdən, eləcə də sözügedən situasiyada tələb olunan rəsmiyyət səviyyəsindən asılı olaraq dəyişə bilər.

Qeyd etmək lazımdır ki, nitq etiketləri, eyni zamanda sosial stereotipləri və sistemli ayrı-seçkiliyi də əks etdirə bilər. Buna nümunə olaraq bəzi mədəniyyətlərdə nitq etiketlərinin istifadəsinin cinsiyyətdən asılı olaraq fərqlənməsini göstərmək olar. Məsələn, fransız dilindəki qadınlara "madame" və "mademoiselle" kimi iki müraciət forması olsa da, kişilərə yalnız "monsieur" şəklində müraciət olunur. Fransız dilindəki "mademoiselle [madmuazel]" sözü mənşəcə latın dilindəki *domnicella, domina* sözlərindən yaranmış, mənası *ev sahibəsi, arvad* deməkdir. Özlüyündə bu söz evlilik və müəyyən bir titulun tanınmasını ehtiva edir. Bu səbəbdən də *domina ancilla* və ya *serva* (xidmətçi) kimi titullardan daha üstün hesab olunur və *bir sahənin idarəçisi* kimi qiymətləndirilir. Orta əsrlərdə "demoiselle [dömuazel]" sözü yeni məna qazanır. "Müqəddəs Eulali haqqında misralar"[1] adlı poemada və "Rolanın mahnıları"[2] nda zadəgan gənc qızı ifadə etmək üçün istifadə olunur. Beləliklə, "demoiselle" ierarxik strukturda irəli gedərək "açarlarını saxladığı evdən fərqli bir titula sahib qadın"a çevrilir. XIII əsrin birinci yarısında bu söz "evli zadəgan qadın" mənasını ifadə etməyə başlayır. Bununla belə, sözün üzərindəki qeyri-müəyyənlik davam edir. XV əsrin sonlarında "kiməsə məxsus olan qadın" mənasından çıxaraq "statuslu qadın" mənası ifadə etməyə başlamış, XVII əsrin ortalarından etibarən "bəzi üstünlükləri olan subay qadın", nəhayət, "subay şahzadə" və hətta "kübar kişinin arvadı" mənalarını ifadə etmişdir. Yalnız XVIII əsrin sonlarına doğru "mademoiselle" sözü özünün nüfuzlu statusunu itirərək qızları ifadə etmək üçün gündəlik müraciət forması kimi işlənməyə başlayır.

XIX əsrin əvvəllərində Napoleonun hakimiyyət dövründə "mademoiselle" sözü ailə vəziyyəti ilə əlaqələndirilməyə başladı. Zəif hüquqi statusuna baxmayaraq, "madmuazel" məişətdə öz statusunu qoruyub saxlayırdı. XIX əsrin sonlarında statusunu itirmiş, daha sonra 1907-ci ildə arqotik məna ifadə etməyə başladı. Bununla belə, madmuazel teatrda, yazıçıların qələmində öz mövcudiyyətini qoruyub saxlaya bilmiş, hətta teatrda aktrisanı ifadə etmək üçün də istifadə olunurdu. Məişətdə isə "müəyyən üstünlüyə sahib gənc qadın" mənası ifadə etməyə davam edirdi. Bütün çatışmazlıqlarına baxmayaraq, qadın hüquqlarını qismən də olsa qoruyan *Napoleon məcəlləsinin ləğvi*[3] ilə "madmuazel" sözünü cinsi ayrı-seçkilik kimi qiymətləndirən bir çox təşkilatlar onun istifadəsinin qadağan olunmasını tələb etməyə başlayırlar. Etirazların digər tərəfində isə qadının ailə vəziyyəti ilə sosial statusunun müəyyən olunma ehtimalı dayanırdı. 2012-ci ildə Fransa Baş Nazirinin göstərişi ilə hüquqi olaraq "madame" və "mademoiselle" sözlərinin rəsmi sənədlərdə istifadədən çıxa-

---

[1] *880-ci ildə latın dilindən fərqli bir dildə – roman dilində – yazılmış ilk*
[2] *1000-ci il, XI əsrə aid Turol adlı müəllifə aid olduğu güman edilən epik poema və mənzum şeirdir.*
[3] *1938-ci ildə başlamış, 1975-ci ildə başa çatmışdır.*

rılması tələbi təmin olunsa da, onlar danışıqda etiket qaydası kimi mövcudluğunu qoruyub saxlamaqdadır (5). Hətta tanımadığı qadına müraciət edərkən onun evli olmama ehtimalını nəzərə alaraq "mademoiselle" kimi müraciət olunması xüsusi incəlik hesab olunur.

Göründüyü kimi, hüquqi tədbirlərin dilçilikdə öz əksini tapması olduqca mürəkkəb məsələdir. Mövcud tarixi hadisələrin gedişatının dilin istifadə diapazonuna təsiri olduğu kimi, dilin strukturunun da müəyyən söz və ifadələrin işlənmə arealına təsiri mövcuddur. Buraya həm də dövlətin yeritdiyi ideoloji təbliğat da təsir edir.

Digər bir nümunə olaraq müasir Azərbaycan dilində qadınlara edilən müraciət forması kimi "xanım" sözünü göstərmək olar. Rəvayətə görə bu müraciət forması Böyük Monqol İmperiyasının dövrünə təsadüf edir. Məhz Çingiz xanın hakimiyyəti dövründə "xanım" müraciət forması yaranaraq məişətdə işlənməyə başlayıb. Azərbaycanda isə qədim zamanlardan xanımlara yaşa görə xüsusi müraciət formaları mövcud olmuşdur: 15 yaşına qədər olan qızlara "banu", 15-35 yaşlı qız və qadınlara "bəyim", 35-55 yaşlılara "xanım", 55-75 yaşlılara "xatun", yaşı 75-dən yuxarı olanlara isə "xanım-xatun" kimi müraciət edilmişdir. Günümüzdə bu müraciət formalarından yalnız *xanım* sözü istifadə olunur. Digərləri isə sıradan çıxmış, bəziləri dilimizdə xüsusi adlarda qorunub saxlanmaqdadır.

Azərbaycan dilində kişilərə müraciətdə "cənab, bəy", hətta sosial və peşəkar statusundan asılı olaraq "müəllim" kimi sözlərdən istifadə olunur. Prof. H. İsaxanlının bu mövzu ilə bağlı apardığı araşdırmada qeyd olunur ki, Azərbaycanın daxil olduğu mədəni-coğrafi ərazidə kişilərə müraciət forması kimi tarixən "şeyx, xacə-xoca, qazi, mövla/muala (molla), əmir, əfəndi, ağa" kimi bir sıra titullardan istifadə olunmuşdur. Müəllif sadalanan müraciət formalarının əsasən ərəb və fars dillərindən gəldiyini, əksəriyyətinin zamanında hər hansı vəzifəni ehtiva etdiyini, günümüzdə isə arxaikləşərək sıradan çıxdığını qeyd edir. Professor Orxon-Yenisey yazılarından başlayaraq, Dədə Qorqud da daxil olmaqla türk dünyasında hörmət və vəzifə ifadə edən sözlər arasında ən çox işlədilən formaların "xan" və "bəy" kəlmələri olduğunu bildirir və türk dünyasına, eləcə də Azərbaycan reallığına uyğun olan müraciət formasının "bəy" olduğunu vurğulamışdır. "Bəy" sözünün etimologiyasına nəzər saldıqda isə görərik ki, BƏY – əski türk cəmiyyətində xalq və dövlət qarşısında yüksək xidmətlər göstərən şəxslərə dövlətin birinci adamı tərəfindən verilən zadəgan tituludur. Orxon kitabələrində də *bəylər* anlayışı, camaatdan fərqli olaraq, imtiyaz sahibi bir təbəqəni – əsil soylular sinfinə aidliyi ifadə edir. Əski türk yazılarında *beq* şəklində olan və semantik şaxələnmə keçirən "bəy" sözünün ilkin anlamı, araşdırıcılara görə, "əcdad" demək imiş. Yəni qədim türk cəmiyyətində tanrılılıq kultunu lap başlanğıcda ağ geyinən və boyların başçıları olan *bəylər* icra etmişdir. Göytürklər zamanında isə türklər içərisində bəy bir titul kimi mövcud olmuşdur (Bars bəg, Ur bəg, Bəg Çor)

Bəy titulu irsi olub atadan oğula keçmişdir və "Kitabi-Dədə Qorqud" dastanında bunun izləri qorunub saxlanmışdır. Bəyliklə bağlı "Kitabi-Dədə Qorqud" boylarında işlədilən ən mühüm anlayışlardan biri bəy – ərəndir ("bəg-ərən"). Bəy anlayışının ən gözəl ifadəsi də budur.

Bəyliyin İlahi vergi hesab edildiyi həmin cəmiyyətdə bəy xalqın özünün seçdiyi və özünə başçı elədiyi bir şəxsdir. Bəylik yaradılışla gəlir. Bu, elə bir cəmiyyətdir ki, xaqan da bir bəydir, ata da bir bəydir. Bəy sözü boyların dilində müraciət məqamında da işlədilir. Göründüyü kimi, bəy titulunun türklərdə mənsəb və vəzifə ilə hər hansı bağlılığı olmamışdır.

Oğuz cəmiyyətində bəylik elə bir anlayışdır ki, "kafər"in alıb verməyi ilə olmur. Oğuz elində bəylər alp-igid olmaları və doğruluğu sevmələri ilə tanınanlar arasından seçilirdi. İgidlik, qorxmazlıq bəyliyin başlıca şərtlərindən idi. Eyni etnik-mədəni sistemin faktı olan "Koroğlu" dastanında da "bəy" müraciət forması kimi özünü göstərir.

*Bəy sözünün mənası çar Rusiyasının XIX əsrin ortalarında Azərbaycanda kəndli islahatları keçirilməsi ilə dəyişmişdir. Hazırlıq prosesində yaradılmış "Bəy komissiyaları"nın işi Cənubi Qafqaz quberniyalarında ali müsəlman silkinin tərkibini müəyyən etmək idi. XIX əsrin 80-ci illərinə qədər fəaliyyət göstərmiş bəy komissiyaları ümumilikdə 1.188 nəsil əsli-nəcabətli "bəy nəsli" kimi tanıdı, təxminən bir o qədər, yəni 1.048 nəslə bəy titulu verilməkdən imtina etmişdi* (1, s. 24). Zamanla Qafqazın müsəlman

əhalisi arasında zadəgan təbəqəsinə mənsub olan, zəngin, irəli gələn şəxslərə bəy titulu verilməyə başlamışdır. Həmin dövrdə "bəy" kimi qeydə alınan şəxslərin mülkiyyətinə torpaq sahələri verilərək onlar bir növ mülkədarlara çevrilmiş, bəylik titulu verilən şəxslər sözün ifadə etdiyi əsl mənanın əksinə olaraq ədalətsizliklərə göz yummuş, hətta özləri ədalətsizlik etmişdirlər. Elə həmin dövrlərdən də "bəy" sözünə qarşı müəyyən bir mənfi stereotip yaranmışdır. XX əsrin əvvəllərində Sovet hakimiyyəti xan və bəylərə verilmiş mülkləri müsadirə edərək kəndlilərə paylamış, onların təqibinə başlamışdır. Beləcə "bəy" titulu Sovet hakimiyyəti dövründə sıradan çıxmış və günümüzdə kişilərə müraciət forması kimi qədim türk dillərindəki mənası ilə birlikdə geri dönməkdədir və mütəxəssislər tərəfindən ən münasib müraciət etiketi olaraq qəbul edilməkdədir.

"Müəllim" xitabından bütün kişilərə müraciət forması kimi istifadə isə günümüzdə müəllimin cəmiyyətdəki statusundan asılı olaraq arxa sıraya keçməkdədir. Eyni zamanda, tədris prosesində "müəllim" müraciət formasının istifadəsi də Azərbaycan və fransız dillərində mədəniyyətlərdən, tədrisə və öyrənənə olan münasibətdən asılı olaraq fərqlənir. Belə ki, müasir tədris metodlarına əsasən müəllimin vəzifəsi öyrətmək deyil, yol göstərməkdir və tədris prosesində müəllim özü də tədris həyata keçirdiyi qrupun bir üzvü roluna girir. Dolayısıyla Avropa mədəniyyətlərində hətta müəllimlər belə onlara müraciət forması olaraq "müəllim" sözündən istifadəni olduqca rəsmi hesab edir, "müəllim"i titul olaraq deyil, peşə olaraq qiymətləndirirlər. Azərbaycan və şərq mədəniyyətinin daha çox yayıldığı ölkələrdə isə qədim zamanlardan müəllimə qarşı münasibət, dövrümüzdə isə müəllim və öyrənən arasındakı məsafənin hələ saxlanıldığını nəzərə alsaq, "müəllim" sözünün hörmət əlaməti olaraq müxtəlif şəxslərə işlədilməsi qismən anlaşılandır.

Göstərilən nümunələrə və araşdırılan tarixi faktlara əsaslanaraq deyə bilərik ki, tarixi hadisələrin gedişi, cəmiyyətdəki inkişaf, siyasi məqsədlər dilə, eləcə də nitq etiketlərinə təsir etdiyi kimi dildə gedən dəyişikliklər də cəmiyyətin həyatına qarşılıqlı təsir etməkdədir. Qloballaşma dövründə nitq etiketlərində baş verən dəyişikliklər də buna nümunə ola bilər. Eyni zamanda müxtəlif sahələrdə müxtəlif nitq və müraciət etiketlərinin işlənməsi də həmin etiketləri istifadə edən şəxslərin ideologiyasını özündə ehtiva edir.

Nəticə olaraq qeyd etmək lazımdır ki, nitq etiketləri cəmiyyətin gizli dilçilik ideologiyasını özündə əks etdirir. Bununla belə düzgün nitq etiketlərini seçmək üçün mədəni müxtəlifliyi, tərəflər arasındakı münasibətləri və rəsmilik dərəcəsini nəzərə almaq lazımdır. Bundan əlavə, bu etiketlərin istifadəsinə təsir edə biləcək cəmiyyətdəki stereotiplər və sistemli ayrı-seçkiliklər də diqqət mərkəzində saxlanılmalıdır.

**Problemin aktuallığı.** Məqalədə nitq etiketlərinin işlənməsində mədəniyyətlərarası və cəmiyyətlərarası fərqlər və oxşarlıqlar öz əksini tapmışdır.

**Problemin elmi yeniliyi.** Müraciət etiketlərinin cəmiyyətin ideologiyasına təsiri araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** Məqalə müasir dövrdə müraciət etiketlərinin istifadəsinin ideoloji faktorlarla əlaqəsini aşkara çıxarır.

**Ədəbiyyat**:

1. Mahmudlu, Y. Azərbaycan tarixi: 9-cu sinif üçün dərslik / Y. Mahmudlu, Q. Əliyev, M. Abdullayev, [və b.] -Bakı, Şərq-Qərb, -2021, -192 s.
2. Cəlilov, F. Azərbaycan dilinin morfologiyası. / F. Cəlilov. -Bakı: Maarif, -1988, -260 s.
3. Əfzələddin Əsgər, Məmmədli Qıpçaq, Türk savaş sənəti. -Bakı: Yazıçı, -1996. -176 s.
4. Travaux neuchâtelois de linguistique, (2011), səhifə 27-45
5. https://www.lefigaro.fr/langue-francaise/expressions-francaises/2017/02/21/37003-20170221ARTFIG00145-mademoiselle-a-toujours-le-blues.php#:~:text=%C3%80%20l'origine%2C%20le%20mot,la%20reconnaissance%20d'un%20titre.

**E-mail:** fatma_memmedova@yahoo.com

**Rəyçilər:** *filol.ü.fəls.dok.,dos.* **C.X. Muradov,**
*filol.elm.dok., prof.* **G.R. Sadıxova**
**Redaksiyaya daxil olub:** 09.02.2023.

# *MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ*
# *ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ*
# *HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT*

*UOT 371*

***Gülyanaq Mahir qızı Nəbiyeva***
*fəlsəfə doktoru proqramı üzrə doktorant*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

## XIX ƏSRİN II YARISINDA AZƏRBAYCAN MƏTBUATINDA HUMANİZMİN İNKİŞAFI

***Гюльянаг Махир гызы Набиева***
*докторант по программе доктора философии*
*Азербайджанский Государственный Педагогический Университет*

## РАЗВИТИЕ ГУМАНИЗМА В АЗЕРБАЙДЖАНСКОЙ НАЦИОНАЛЬНОЙ ПЕЧАТИ ВО ВТОРОЙ ПОЛОВИНЕ XIX ВЕКА

***Gulyanag Mahir Nabiyeva***
*doctorial student in the program of doctor of philosophy*
*Azerbaijan State Pedagogical University*

## THE DEVELOPMENT OF HUMANISM IN THE AZERBAIJANI NATIONAL PRESS IN THE SECOND HALF OF THE XIX CENTURY

**Xülasə.** XIX əsrin II yarısı Azərbaycan xalqının milli-mədəni və pedaqoji həyatında əlamətdar və parlaq bir dövrdür. Xalqımızın tarixi taleyində milli mətbuatın yaranması və ilkin inkişaf mərhələsi də bu dövrün payına düşür. Bu dövrdə milli mətbuatda təbliğ edilən ideyalar cərgəsində yeni məzmunlu humanizm ideyaları da var idi. H. Zərdabi və S. Ünsizadə başda olmaqla mütərəqqi məfkurəli maarifçilərimiz humanizm ideyalarını coşqun şəkildə təbliğ edirdilər. Onlar geniş kütləyə anlatmağa çalışırdılar ki, cəmiyyətdə əsaslı şəkildə humanizmə nail olmadan demokratik cəmiyyət yaratmaq mümkün deyil. Həmçinin humanist cəmiyyət yaratmadan inkişafa nail olmaq olmaz. Məqalədə biz deyilən bu məsələlərin geniş elmi şərhini verməyə çalışmışıq.

***Açar sözlər:*** *humanizm ideyaları, Azərbaycanda humanizm, milli mətbuat, pedaqoji fikir, XIX əsrin II yarısı, mədəni-pedaqoji mühit*

**Резюме.** Вторая половина XIX века – знаменательный и яркий период в национально-культурной и педагогической жизни азербайджанского народа. В исторической судьбе нашего народа к этому периоду относится и этап создания и начального развития национальной печати. В этот период в русле идей, пропагандируемых в отечественной прессе, появились идеи гуманизма с новым содержанием. Наши передовые идеологические просветители во главе с Х. Зардаби и С. Унсизаде с энтузиазмом пропагандировали идеи гуманизма. Они пытались объяснить широкой публике, что невозможно создать демократическое общество без фундаментального достижения гуманизма в обществе. Кроме того, развитие невозможно без создания гуманного общества. В статье мы постарались дать широкое научное изъяснение этих вопросов.

***Ключевые слова:*** *идеи гуманизма, гуманизм в Азербайджане, национальная пресса, педагогическая мысль, вторая половина XIX века, культурно-педагогическая среда*

**Summary.** The second half of the 19th century is a significant and brilliant period in the national-cultural and pedagogical life of the Azerbaijani people. In the historical destiny of our people, the creation and initial development stage of the national press also belongs to this period. During this period, there were ideas of humanism with a new content in the line of ideas promoted in the national press. Our progressive ideological educators, led by H. Zardabi and S. Unsizade, enthusiastically propagated the ideas of humanism. They tried to explain to the general public that it is impossible to create a democratic society without fundamentally achieving humanism in the society. Also, development cannot be achieved without creating a humane society.In the article, we have tried to provide a broad scientific interpretation of these issues.

***Key words:*** *ideas of humanism, Humanism in Azerbaijan, national press, pedagogical thought, second half of the 19th century, cultural and pedagogical environment*

Azərbaycan milli mətbuatının ilk qaranquşu olan "Əkinçi" (1875-1877) qəzetinin əməkdaşları ilk maarifçilərimizdən və M.F. Axundovdan başlayan yeni məzmunlu, zamanın "təqəzasına" (tələbinə – H. Zərdabi) uyğun humanizm ideyalarını ləyaqətlə davam etdirirdilər. Əlbəttə, bu işıqlı yolda qəzetin naşiri və redaktoru Həsən bəy Zərdabinin (1842-1907) o zamankı milli ictimai-mədəni mühitdə yeganə mötəbər fikir tribunası olan bu mətbuat orqanına verdiyi demokratik istiqamətin, ruhun danılmaz rolu var idi. Diqqətəlayiq cəhətdir ki, qəzet əməkdaşlarının insanpərvərlik baxışları insana və onun şəxsiyyətinə münasibətdən başlayırdı. H. Zərdabinin məsləkdaşı və "Əkinçi"nin fəal müxbirlərindən Əhsənül-Qəvaid qəzetin 29 fevral 1876-cı il tarixli nömrəsində dərc olunan məqaləsində həm özünün, həm də məsləkdaşlarının insana münasibətini ifadə edərək yazırdı ki, dövlətlərin, toplumların bir-birlərinə münasibətlərində iki məqam vardır: birincisi müharibə, cəng və qovğadır; ikincisi isə sülh, qardaşlıq, doğruluq və mehribançılıqdır. Adamlar daim məişət, güzəran və yaşayış üçün bir-birinə möhtac olduqlarından sülh və qardaşlıq içərisində yaşamaları daha vacib və münasibdir. Əhsənül-Qəvaid qeyd edir ki, sülh, qardaşlıq və məhəbbət həm toplumdakı fərdlər arasında, həm də millətlər, xalqlar arasında olmalıdır. Beləliklə, müəllif məhəbbət və insansevərliyə yalnız konkret toplum çərçivəsində deyil, qlobal miqyasda baxır. Onun fikrincə, gərək bütün insanlar bir-birləri ilə "ziyadə qardaşlıq mərasimin müraat edib məhəbbət, insaf və doğruluq ilə bir-birilə rəftar etsinlər, hansı ki, aciz və miskindir gərək əl-ələ vermək ilə dolanalar" (5, s.131).

"Əkinçi"nin səhifələrində qərb ictimai, mədəni, siyasi, pedaqoji mühiti və adət-ənənələri ilə şərq gerçəkliyinin həmin atributlarını müqayisə edən yazılara tez-tez rast gəlirik. Həmin yazılarda müəlliflər qərbin son əsrlərdə göstərilən sahələrdə şərqi üstələdiyini və qabaqcıl mövqeyə keçdiyini əsaslandırır, həm də bunun səbəblərini kütləyə başa salmağa çalışırdılar. Qərbdə son əsrlərdə insanlığın, insani münasibətlərin və ictimai humanizmin şərqdən çox-çox irəli getdiyini də nəzərə çatdırırdılar. Bunun mühüm səbəblərindən birini elmdə, maarifdə görürdülərsə, digər səbəblərini də insanın fikir, hüquq, söz, şəxsiyyət və s. azadlıqlarında, habelə düzgün tərbiyə sistemində axtarırdılar. H. Zərdabi qəzetin 9 iyun 1877-ci il tarixli nömrəsində "Daxiliyyə" rubrikasında verdiyi məqalədə bir daha bu məsələyə toxunurdu. Problemin sosial mahiyyətinə varan müəllif bir milli yanğı və təəssüflə bildirirdi ki, uzun əsrlərdir ki, Avropadan fərqli olaraq şərqdə əksəriyyət azadlıqdan məhrumdur. Cəmiyyətin ictimai piramidası və sistemi elə qurulmuşdur ki, "rəiyyət padşaha, övrət kişiyə, uşaq ataya, nökər ağaya, şagird ustada və qeyrə" qul olmuşdur (5, s. 384). Müəllif izah edirdi ki, belə bir vəziyyət cəmiyyətdəki insani sevgini, qarşılıqlı hörməti, sosial səmimiyyəti, ehtiramı qorxu və məcburi itaətlə əvəz etmiş, şəxslərdəki insansevərlik duyğularını öldürmüşdür.

"Əkinçi" əməkdaşları da Avropa humanistləri və M.F. Axundov kimi şərqdə ictimai nizamın, ədalətin, insanpərvərlik hissinin pozulmasında, fanatizmin, cəhalətin və tənəzzülün baş verməsində ruhaniləri əsas müqəssirlərdən hesab edirlər. Bildirirlər ki, islamın ilk əsrlərində sağlam bir dini mühit, ağıllı din rəhbərləri olduğundan islam aləmində bir çiçəklənmə, tərəqqi baş verdi. Lakin daha sonralar ruhanilər özləri tədricən həqiqi şəriət yolundan çıxdılar. Ədalətsiz və nadan hökmdarlarla cahil, mənfəətpərəst ruhanilər "xalqın ipini əllərinə aldılar", cəmiyyətdəki ədaləti də, insanlığı da, səmimiyyəti də, qardaşlığı və bərabərliyi də xalqın ixtiyarın-

dan qopardılar. Qəzetin 13 may 1876-cı il tarixli nömrəsindəki "Daxiliyyə" rubrikasını dediyimiz problemə həsr edən H. Zərdabi şərqdə uzun əsrlər boyunca humanist cəmiyyətin olmamasını deyilən səbəblərlə, habelə elmsizlik və maarifsizliklə əlaqələndirir.

Humanist cəmiyyət yaratmaq axtarışları Azərbaycan ziyalılarını mənsub olduqları xalq arasında dini və milli zəmində baş verən ixtilafların, nifaqın dini-ictimai səbəblərini axtarmağa və onu aradan qaldırmağa da sövq edirdi. Bu səbəblər sırasında bütün islam coğrafiyasında mövcud olan sünni-şiə ixtilafı, qan ədavəti və s. kimi bəlalar onları daha çox narahat edirdi. Onlar əsrlərlə şərq xalqlarının fəlakətinə səbəb olan bu cür mənfi adət-ənənələri aradan qaldırmaq üçün ciddi cəhdlər göstərir, kütlə içərisində maarifləndirmə işləri aparırdılar. "Əkinçi" qəzetinin səhifələrində həm məhərrəmlik təziyəsində baş yarmaq, "şaxsey-vaxsey" əhvalatı, həm də sünni-şiə ixtilafı və onun zərəri ilə bağlı yazılara sıx-sıx rast gəlmək olurdu. Məhəmmədəli İsna əşəriyi-Səlyani imzası ilə dərc olunan bir məktubda (3 mart, 1877) göstərilirdi ki, min ildən çoxdur ki, islam aləmi sünni və şiə olmaqla iki düşmən cəbhəyə bölünmüşdür. Onlar arasındakı bu "illət", "ədavət və inad" müsəlmanlara böyük ziyanlar vurmuş, onların arasına nifaq toxumu səpmiş, onları ittihad və birlikdən məhrum etmişdir. Onların arasındakı səmimiyyəti, ülfəti, məhəbbəti yoxa çıxarmışdır. Bu ideya sonrakı dövrdə də daim milli maarifpərvərlərimizi narahat edirdi. Nəriman Nərimanov da "Nadir şah" faciəsində bu ağrılı məsələyə toxunur və göstərirdi ki, Nadir şah kimi qüdrətli hökmdar da bu dini ədavətin faciəvi mahiyyətini yaxşı anlayır, onu aradan qaldırmağa, müsəlmanlar arasında dini birlik və məhəbbət yaratmağa calışırdı. Təəssüf ki, onun bu səyi bir baş tutmadı. Çünki "ədavət naxoşluğuna" tutulmuş geniş kütlə bu islahatçı şahı anlamadı.

Avropa maarifçilərindən bəhrələnən H. Zərdabi də başqa sahələrdə olduğu kimi, cəmiyyətdə insanlararası münasibətlərin humanist prinsiplər əsasında qurulmasında ağılın və zəkanın roluna böyük önəm verirdi. "Əkinçi"nin 1877-ci il 21 iyul tarixli nömrəsindəki "Elm xəbərləri" məqaləsi bütövlükdə bu məsələyə həsr edilmişdir. Müəllif şərhlərini belə bir izahat üzərində qurur ki, ağılın göstərişinə qulaq asanlar insanlıq, onu dinləməyənlər isə "malikdünyalıq" yolunu tutur. Birincilər həqiqətləri anladıqları səbəbindən hər kəsə qayğı və hörmətlə yanaşır, ikincilər isə nəfsani istəkləri üçün yaşadıqlarından ancaq nəfsin, maddi həvəslərin diktəsi ilə hərəkət edirlər. Belə olduqda insanlıq da, insan da unudulur, insana olan sevgi sərvətə, şöhrətə olan sevgi ilə əvəz edilir. Onda adəm övladı "Firon kimi Allahlıq iddiasına düşüb" ixtiyarsızları, zəifləri, özündən gücsüzləri əzir, onları istismar edir. Təəssüf ki, bu hal "Məşriqzəmində" (Şərqdə) daha geniş yayılmışdır. Müəllif nəzərə çatdırır ki, "bizim Məşriq-zəminin Avropa əhlindən geri qalmağına bir ümdə səbəb budur". Göründüyü kimi, H. Zərdabi və məsləkdaşları humanist cəmiyyət probleminə geniş və obyektiv müstəvidə, həm də müasir düşüncə ilə yanaşmağı bacarırlar.

Qərb ideoloqları kimi milli maarifpərvərlərimiz də humanist cəmiyyət yaratmaqda elmi, maarifi, təhsili və pozitiv tərbiyəni mühüm amillərdən hesab edirlər. Mövcud sosial cəhalətin, vəhşiliyin, oğurluğun, quldurluğun, qarətin, nifaqın, ədavətin və s. mənfi vərdiş və adətlərin məhz elmsizlikdən, maarifsizlikdən qaynaqlandığını israr edirdilər. "Əkinçi"nin varisi olan "Ziya" qəzeti öz səhifələrində Azərbaycanın müxtəlif bölgələrində baş verən vəhşiliklərə, qarət və quldurluq əməllərinə vaxtaşırı yer verir, bu cür əməllərin cəmiyyət daxilindəki insani hisslərə, səmimiyyətə, etimada ciddi zərbə vurduğunu, ictimai mühitdə xof, qorxu və nifrət duyğuları yaratdığını nəzərə çatdırırdı. Qəzet "Məmləkət əhvalatı" rubrikasında verdiyi bir yazıda (27 mart, 1980) Naxçıvanın Şərur bölgəsində baş verən kütləvi quldurluq, qarət, zorakılıq, oğurluq və özbaşınalıqdan danışır. Qəzetin bir başqa nömrəsində isə (27 dekabr, 1879) bu cür qəbahətli əməllərə görə həbs olunan məhbuslardan söhbət açılır. "Mirza Şətrənc" imzalı müəllif ürək yanğısı və təlaşla bildirir ki, Şuşa həbsxanasındakı 325 məhbusdan yalnız 2-si erməni, qalanı isə müsəlman olduğu halda, Şuşa məktəbində təhsil alan 345 şagirddən yalnız 3 nəfəri müsəlman, qalanı ermənidir. Bu, müsəlman toplumundakı cinayətkarlığın göstəricisidir. Cinayətkarların çox olduğu bir toplumda insanpərvərlik mühiti yaratmaq müşkül bir məsələdir. Belə bir mühitin yaradılması üçün, ilk növbədə, cinayəti və onu doğuran səbəbləri ara-

dan qaldırmaq gərəkdir. "Ziya"nın naşiri, dövrün mütərəqqi baxışlı din xadimlərindən və ziyalılarından olan Səid Ünsizadə öz həmfikirlərinin baxışlarını ifadə edərək bu cür əməllərin normal tərbiyə görməməkdən, yaxşı tərbiyə mühitinin olmamasından irəli gəldiyini söyləyir, belə naqis əməl sahiblərini nəzərdə tutaraq yazırdı: "Boylə adəmlərin əksəri o kəslərdir ki, əyyami-tüfuliyyətdən(uşaqlıq əyyamından-G.N.) təlim və tərbiyə altinə düşməyublər, ta ki mərifət ilə arəstə olub (bəzənib-G.N.) mənahi tərəfinə meyl iləmiyələr (günaha meyl etməyələr-G.N.), hərçənd surətləri insandır və likən həqiqətdə heyvanat cümləsindədirlər"(9 ,28-29).

İslam aləmində, o cümlədən Azərbaycanda əsrlər boyunca ata-babalardan miras qalmış bir sıra zərərli adətlər mövcud idi. Hansı ki, bu adətlər cəmiyyət daxilindəki humanist bağları doğrayır, nifaqa, ziddiyyətə, ictimai bəlalara və faciələrə səbəb olur, hətta bəzən geniş miqyaslı fəlakətlərə yol açırdı. M.F. Axundov Manukci Sahibə məktubunda ata-babalarımızdan bizə bir sıra zərərli adətlərin, vərdişlərin qaldığından acı-acı şikayətlənirdi. Sənətkar davam edərək təəssüf hissi ilə bildirirdi ki, ata-babalarımız "nifaq işini əvvəl başdan özlərinə peşə etmişlər". Bunun nəticəsində bizdə "həmrəyliyin və ittifaqın" nizamı pozulmuş, adamlar bir-birləri ilə insancasına davranmaqdan uzaq düşmüşlər, biridigərinin dostu, həmdəmi olmaqdan əl çəkib nifaq və düşmənçilik yolunu tutmuşlar (1, 246).

Cəmiyyətdə nifaqa, düşmənçiliyə səbəb olan belə adətlərdən biri də qan ədavəti idi. Həqiqətən də, yüz illərlə davam edən bu mənfur adət şərq aləmində bəzən kiçik bir qığılcımdan törəyib böyük bir ərazini bürüyən, hər şeyi yandırıb kül edən alova bənzəyirdi. İctimai mühitdə böyük fəlakətlərə yol açırdı. XIX əsrin ortalarından etibarən mütərəqqi fikirli ziyalılarımız bu tipli adətlərə qarşı mübarizə aparmağa başladılar. M.F. Axundovun məktublarında, "Əkinçi", "Ziya" və "Kəşkül" qəzetlərinin səhifələrində belə adətləri kəskin şəkildə tənqid edən, onun fəsad və ziyanını kütləyə anlatmağa yönəlmiş dəyərli mülahizələrlə rastlaşırıq. Nəcəf bəy Vəzirovun "Müsibəti-Fəxrəddin" faciəsində isə bu problem daha dərin, daha əsaslı şəkildə qoyulur, onun qanlı nəticələri adi, anlaşılan həyati hadisələrin fonunda oxucuya və tamaşaçıya çatdırılırdı. Ümumiyyətlə, faciənin süjeti qan ədavəti üzərində qurulmuşdur. Əsərin baş qəhrəmanı Rüstəm bəy Avropada təhsil alıb gəlmiş Fəxrəddini öldürmək hissi ilə alışıb yanır və bunun üçün hərəkətə keçir. Çünki onun atası ilə qan düşmənçiliyi vardır. Bu işdə gənc Fəxrəddinin heç bir günahı olmasa da, Rüstəm bəy qəlbinin kinini, küdurətini, qəzəbini soyutmaqdan ötrü qisas yolunu tutur. Nəticədə həm xalqına xidmət etmək mənasında böyük arzu və ideallarla yaşayan Fəxrəddinin, həm də öz oğlu Mahmudun ölümünə, qızı Səadət xanımın isə bədbəxtliyinə səbəb olur. Dramaturq əsərdə qan ədavətinin cəmiyyət miqyasında humanist münasibətlər sisteminə necə sağalmaz zərbə vurduğunu şərq mühitində tez-tez baş verən real hadisələrin fonunda məharətlə açıb göstərir. Eyni zamanda, belə adətlərdən əl çəkməyin zərurətini geniş ictimaiyyətə, ən başlıcası isə mənsub olduğu xalqın övladlarına anlatmaq məqsədi izləyir. Ataların səhvlərinin övladları necə fəlakətə düçar etdiyini, onlardakı insanpərvərlik duyğularını, insanlara, millətə xidmət etmək həvəsini hansı şəkildə məhv etdiyini bədii-tərbiyəvi yönümdə izah edir.

Beləliklə, Azərbaycanda əsrlər boyunca humanizm ideyaları pərvəriş tapıb inkişaf etsə də, XIX əsrin ortalarından etibarən onun məzmun və mahiyyətində əsaslı keyfiyyət dəyişməsi baş verdi. Hər şeydən əvvəl, bu ideyaların təbliğində, təlqinində ənənəvi moizəçilikdən, nəsihətçilikdən şərhçiliyə, izahata, elmi və ictimai-siyasi inandırma yoluna keçildi. Milli mütəfəkkirlərimiz başa düşdülər ki, moizə ilə, öyüd-nəsihətçiliklə humanizmin sosial-siyasi, hüquqi-mədəni dəyərini kütləyə başa salmaq mümkün deyil. Bu yolda məqsədə yalnız inandırıcı həyati şərhlər, izahatlar, sübutlar, müqayisələr yolu ilə çatmaq olar. Ona görə də İ. Qutqaşınlı, A. Bakıxanov, M.F. Axundov, H. Zərdabi, "Əkinçi", "Ziya" və "Kəşkül" qəzetlərinin əməkdaşları, M. Şahtaxtlı, S.M. Qənizadə və s. kimi böyük fikir sahiblərimiz, ömrü və fəaliyyəti XIX yüzilliklə bağlı olan öncül ziyalılarımız mütərəqqi, humanist cəmiyyət yaratmaq istiqamətində xalqı məhz bu yolla tərbiyə etməyi üstün tutdular. XIX əsrin ortalarından başlayıb Birinci rus inqilabına qədər davam edən dövr isə Azərbaycan ictimai-mədəni və pedaqoji fikrində yeni məzmunlu humanist ideyaların intişarında ilk mərhələ, daha doğrusu, təşəkkül və formalaşma mərhələsidir.

**Problemin elmi yeniliyi.** XIX əsrin II yarısı, XX əsrin əvvəlləri Azərbaycanda pedaqoji fikir tarixinin, tərbiyə nəzəriyyəsinin, maarifçilik baxışlarının inkişafında ayrıca bir mərhələdir. Bu mərhələ özünəməxsus əlamətləri, xüsusiyyətləri, parametr və cizgiləri, ictimai-pedaqoji mahiyyəti ilə başqa mərhələlərdən ciddi surətdə fərqlənir. Bu mərhələdəki insanpərvərlik baxışları da fərqli bir məzmuna, özünəməxsus inkişaf yoluna, xüsusi dəyərə malik olmuşdur.

**Problemin praktik əhəmiyyəti.** Haqqında danışdığımız dövrün araşdırılması Azərbaycanda məktəb və pedaqoji fikir tarixinə aid dərsliyin və dərs vəsaitinin, habelə Azərbaycan pedaqoji fikir antologiyası və müntəxabatının hazırlanmasında istifadə etmək mümkündür.

**Ədəbiyyat:**

1. Axundov M.F. Əsərləri. 3 cilddə. III c., / M.F. Axundov -Bakı: Elm, -1988. - 388 s.
2. Bakıxanov A. Bədii əsərləri. / A. Bakıxanov. -Bakı: Azərnəşr, -1973, - 391 s.
3. Əhmədov H. Azərbaycan məktəb və pedaqoji fikir tarixi. / H. Əhmədov -Bakı: Elm və təhsil, -2014. -432 s.
4. Əhmədzadə A.Ş. Azərbaycanda humanizm meyllərinin yaranması və inkişafı / Əhmədzadə - Bakı: Elm və təhsil, -2014. -395 s.
5. "Əkinçi" qəz. (1875-1877). Tam mətni. Təkrarnəşr (Kiril əlifbası ilə tərtib edəni: Həsənzadə T.) -Bakı: Azərnəşr, -1979, -464 s.
6. Əliyeva Ş., İlyasov M., və b. Humanist pedaqogikanın aktual məsələləri (Metodiki vəsait). / Ş. Əliyeva, M. İlyasov, və b. -Bakı: ADPU-nun nəşriyyatı, -2018.- 141 s.
7. Əliyev R. Humanizm tərbiyəsinin sosial-psixoloji əsasları. // Azərbaycan məktəbi, -2017, № 5, -s. 49-58
8. İsayev İ. Pedaqoji irsimizdən: M.V. Vidadidən H.K. Sanılıyadək. / İ. İsayev. -Bakı: Elm və təhsil, -2014. - 406 s
9. "Ziya" qəzeti. Tam mətni. I kitab. Təkrarnəşr. (latın əlifbası ilə nəşrə hazırlayan: Əliyev M.). -Bakı: Qanun, -2013. -344 s
10. Zərdabi H. Seçilmiş əsərləri. / H. Zərdabi -Bakı: Azərnəşr, -1960, -475s

**E-mail:** gulnebiyevaismail@gmail.com

**Rəyçilər:** *ped.ü.elm.dok., prof.* **F.A. Rüstəmov**
*filol.ü.fəls. dok.* **A.H. Nəzərova**
**Redaksiyaya daxil olub:** 13.02.2023

*UOT 37.0*

***Könül Vaqif qızı Mikayılova***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun böyük elmi işçisi*
*ORCID 0000-0003-2817-5593*

***Tavat Hüseyn qızı Muradlı***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun şöbə müdiri*
*Azərbaycan Respublikasının Təhsil İnstitutu*
ORCİD 0000-0003-4995-1176

***Gülnarə Vilayət qızı Şahmuradova***
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi işçisi*
*ORCİD 0000-0003-1997-0317*

# ÇAR RUSİYASI DÖVRÜNDƏ ALİ TƏHSİL ALAN ŞUŞA ZİYALILARININ ELMİ TƏRƏQQİNİN İNKİŞAFINDA ROLU

***Кёнуль Вагиф гызы Микаилова***
*старший научный сотрудник Института Образования Азербайджанского Республики*

***Тават Гусейн гызы Мурадлы***
*заведующий отдела Института Образования Азербайджанского Республики*

***Гульнара Вилаят гызы Шахмурадова***
*научный сотрудник Института Образования Азербайджанского Республики*

# РОЛЬ ИНТЕЛЛЕКТУАЛОВ ШУШЫ, ПОЛУЧИВШИХ ВЫСШЕЕ ОБРАЗОВАНИЕ В ПЕРИОД ЦАРСКОЙ РОССИИ В РАЗВИТИИ НАУЧНОГО ПРОГРЕССА

***Konul Vagif Mikayilova***
*senior researcher at the Institute of Education of the Republic of Azerbaijan*

***Tavat Huseyn Muradly***
*head of the department of the Institute of Education of the Republic of Azerbaijan*

***Gulnara Vilayat Shakhmuradova***
*researcher at the Institute of Education of the Republic of Azerbaijan*

# THE ROLE OF SHUSHA INTELLECTUALS WHO RECEIVED HIGHER EDUCATION IN THE PERIOD OF TSARIST RUSSIA IN THE DEVELOPMENT OF SCIENTIFIC PROGRESS

**Xülasə.** Şuşa Azərbaycanın Dağlıq Qarabağ bölgəsinin mədəniyyət paytaxtıdır. Məqalədə Şuşa vətəndaşlarının təhsilə olan meyl və maraqları öz əksini tapıb. Çar Rusiyası dövründə Zaqafqaziya Müəllimlər Seminariyasında təhsil alan Səfərəli Vəlibəyov, Muxtar Muradov, Abdulla Məlikaslanov, Süleyman (Sani) Axundov, Üzeyir Hacıbəyov, Zülfüqar Hacıbəyov və digər ziyalıların adları vurğulanmışdır. Bu tələbələr təhsil aldıqları müddətdə bütün çətinliklərin öhdəsindən gələrək təhsillərini başa vurub və sonradan Azərbaycan təhsilinin və mədəniyyətinin inkişafına öz töhfələrini vermişdilər. Yeniyetmə uşaqların təhsillənməsində, dərslik və dərs vəsaitlərinin hazırlanmasında, elmi-mədəni irsimizin inkişafında müəyyən xidmətlər göstərmişdilər. Eyni zamanda, imperiyanın müxtəlif ali təhsil müəssisələrində təhsillərini davam etdirən bir cox zi-

yalılarımıza dair məlumatlar da məqalədə yer almışdır. Onların seçdikləri ali təhsil müəssisələri və təhsil aldıqları ixtisaslar qeyd olunmuşdur. Azərbaycanlı gənclər rus dilini bilmədən, böyük çətinliklərlə üzləşərək təhsil almaqla xalqına, vətəninə layiqli şəxsiyyətlərə çevrilmişlər. Məqalədə, həmçinin repressiya qurbanı olmuş qarabağlı ziyalıların adları açıqlanmışdır. Azərbaycan tarixinə qanlı izlər salmış repressiya yüzlərlə günahsız insanların, onların ailələrinin faciəvi ölümünə səbəb olmuşdur. Məhz azərbaycanlı ziyalıların kütləvi şəkildə təmizlənməsinə xidmət edən repressiya siyasi baxımdan xalqin maariflənməsinə, inkişafına da əks təsir göstərirdi.

***Açar sözlər:*** *təhsil maraqları, həyati təhlükə, repressiya*

**Резюме.** Шуша – культурная столица Нагорно-Карабахского региона Азербайджана.

В статье отражены тенденции и интересы шушинцев в сфере образования. Упоминались также академики, обучавшиеся в Закавказской учительской семинарии во времена царской России, такие как Сафарали Велибеков, Мухтар Мурадов, Абдулла Меликасланов, Сулейман (Сани) Ахундов, Узеир Гаджибеков, Зульфугар Гаджибеков и другие.

Во время учебы эти великие личности преодолели все трудности, с которыми столкнулись, и продолжили свое образование, внося свой вклад в развитие образования в Азербайджане. Эти люди внесли свой вклад в воспитание детей-подростков, подготовку учебников и учебных пособий, развитие нашего научного и культурного наследия. В то же время в статье содержится информация о многих наших интеллигентах, продолживших свое образование в высших учебных заведениях империи.

В статье дана подробная информация о многих наших интеллигентах, продолжающих образование в высших учебных заведениях Империи, об избранных ими высших учебных заведениях и профессиях. Азербайджанская молодежь, не владеющая русским языком, получила образование и стала достойной личностью своего народа и Родины. В конце статьи были упомянуты имена деятелей интеллигенции, ставших жертвами репрессий в истории Азербайджана.

Именно массовые репрессии азербайджанской интеллигенции оказали обратное влияние на просвещение и развитие народа с политической точки зрения.

***Ключевые слова:*** *образовательные интересы, угроза жизни, репрессии*

**Summary.** Shusha is the cultural capital of the Nagorno-Karabakh region of Azerbaijan.

The article reflects the tendencies and interests of Shusha residents in education. Academicians who studied at the Transcaucasian Teacher's seminary during Tsarist Russia like Safarali Valibeyov, Mukhtar Muradov, Abdulla Melikaslanov, Suleyman (Sani) Akhundov, Uzeyir Hajibeyov, Zulfugar Hajibeyov and others were also pointed out.

During their studies, these great personalities overcame all difficulties that they faced and continued their education in terms of contributing to the development of education in Azerbaijan. These people contributed to the education of teenage children, the preparation of textbooks and teaching aids, and the development of our scientific and cultural heritage. At the same time, the article contains information about many of our intellectuals who continued their education in the higher education of the empire.

The article provides detailed information about many of our intellectuals who continue their education in the higher schools of the Empire, their chosen higher educational institutions and professions. The Azerbaijani youth, who don't speak Russian, got an education and became worthy personalities of their people and Homeland. At the end of the article, the names of the intellectuals who became victims of repression in the history of Azerbaijan were mentioned.

It was the mass repression of the Azerbaijani intelligentsia that had the opposite effect on the Enlightenment and the development of the people from the political point of view.

***Key words:*** *educational interests, life-threatening, repression*

Kürəkçay müqaviləsi əsasında Qarabağı işğal edən Çar Rusiyası müxtəlif bölgələrdə, o cümlədən Şuşada bir çox təhsil müəssisələrinin fəaliyyətinə qismən də olsa icazə verirdi. Lakin bu müəssisələrdə kadr çatışmazlığı problemi mövcud idi. Çünki Azərbaycanda kadr hazırlığı ilə məşğul olan ali təhsil müəssisələri mövcud deyildi. Ona görə də azərbaycanlı gənclər ali təhsil almaq üçün müxtəlif ölkələrə üz tuturdular. 1875-ci ildə ibtidai siniflərdə müəllim kadrlarının hazırlanması məqsədilə Gürcüstanın Qori şəhərində ilk ali təhsil ocağı hesab olunan Zaqafqaziya Müəllimlər Seminariyası açılır. Se-

minariya Qori şəhərində yerləşdiyi üçün çox vaxt ona Qori Müəllimlər Seminariyası deyilirdi.

Bu seminariyada 16-19 yaşlı yeniyetmələr təhsil ala bilərdilər. Təhsil 3 ili əhatə edirdi. Zaqafqaziya Müəllimlər Seminariyasının "Əsasnamə"sinə görə 20 nəfər erməni və gürcü padşahlıq xərcləri hesabına burda təhsil ala bilərdi. Müsəlmanlar isə müəllim məktəbi açılana kimi öz vəsaitləri hesabına bu seminariyada və onun nəzdindəki məktəblərdə təhsil ala bilərdilər. Çox təəssüflə qeyd edək, nədənsə məhz azərbaycanlıların təhsil almaları ödənişli idi. Bununla yanaşı, azərbaycanlılara qarşı bu seminariyada müxtəlif sərt qaydalar da qoyulurdu. Məsələn, Azərbaycan dilində hətta dərsdənkənar vaxtlarda danışan tələbələr seminariyadan qovulurdu və s.

Lakin Çar Rusiyası dövründə bir çox azərbaycanlılar bu məktəbdə təhsil almaqla yanaşı, hətta bu məktəbin özündə müəllim kimi də fəaliyyət göstəriblər (Mirzə Fətəli Axundov, Mirzə Hüseyn Qayıbzadə, Mirzə Şəfi Vazeh və b.). Onlar dərs deməklə yanaşı seminariyada Azərbaycan şöbəsinin açılmasına, Azərbaycan dilində dərsliklərin nəşr edilməsinə də nail olublar. Seminariyanın Azərbaycan şöbəsinə ilk dəfə 32 nəfər qəbul edilir. Şöbənin direktoru Aleksey Osipoviç Çernyayevski Azərbaycanlılara xüsusi diqqət və qayğı göstərir. Qəbul olan tələbələrdən 19 nəfəri şöbənin əsas sinfində, 13 nəfəri isə hazırlıq sinfində təhsil alır və müvəffəqiyyətlə seminariyanı bitirirlər. Bundan sonra bir çox qarabağlı gənclər imperiyanın müxtəlif bölgələrində ali təhsil almağa, eləcə də xarici ölkələrdə təhsil almağa müvəffəq olurlar.

Təhsil hər zaman qarabağlılar üçün mənəvi qida mənbəyi olub. Qarabağın görkəmli xanları bir çox mədrəsələrin açılmasında, uşaqların təhsil almasında hər zaman əhaliyə maddi və mənəvi cəhətdən dəstək olmuşdular. Öz şəxsi vəsaitləri hesabına gənclərin başqa ölkələrdə təhsil almalarını təmin etmişlər.

Təəssüflə qeyd edək ki, elm və təhsilin inkişafında xidmət göstərən ziyalılarımızın əksəriyyəti repressiya qurbanına çevriliblər.

***Zaqafqaziya Müəllimlər Seminariyasında təhsil alan ziyalıların elmi-pedaqoji və ictimai fəaliyyəti.*** Zaqafqaziya Müəllimlər Seminariyasında 240 nəfərdən çox azərbaycanlı təhsil almışdır [3]. Təkcə Şuşa bölgəsindən 20-dən çox gənc bu seminariyada müəllimlik peşəsinə yiyələnmislər. Azərbaycan təhsilinin inkişafına öz töhfələrini vermiş bu şəxsiyyətlərin bu gün də pedaqoji irsi araşdırılır və öyrənilir. Bunlardan biri ***Zəkəriyyə bəy Mirzə Mehdiqulu Aslanov*** Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra Gülablı və Ağdam Zemstvo məktəbində müəllim işləmişdir. 1906-1907-ci illərdə Qafqaz Müəllimlər Qurultayının iştirakçısı olmuşdur. Həvəskar aktyor kimi fəaliyyət göstərmiş ("Dağılan tifaq", "Nadanlıq", "Nadir şah", "Müsibəti Fəxrəddin" və s.) və xeyriyyəçiliklə ("Dəbistan" jurnalına maddi yardım və s.) məşğul olmuşdur. 1938-ci ildə repressiya qurbanı olub.

***İsmayıl bəy Məşədi Məhəmməd oğlu Şərifbəyov*** da Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra bir sıra məktəblərdə müəllimlik etmiş, eyni zamanda, Şuşa teatrının yaranmasında və inkişafında fəal iştirak etmişdir.

***Səfərəli bəy Şıxhəsən bəy oğlu Vəlibəyov*** Qori Müəllimlər Seminariyasını bitirən ilk üç azərbaycanlıdan biridir. 1881-ci ildə seminariyanı bitirən S. Vəlibəyov burada rəhbər vəzifəsində saxlanılır. C. Məmmədquluzadə, N. Nərimanov, S.S. Axundov və başqaları ibtidai təhsillərini Vəlibəyovdan alıblar. A.O. Çernyayevski ilə birlikdə "Vətən dili" dərsliyinin ikinci hissəsinin, eləcə də "Üsuli-cədidə-lisani-farsi" adlı dərsliyin və "Xəzineyi-əxbar" adlı iki cildli kitabın müəllifidir.

***Əbdüləli bəy Qasım bəy oğlu Vəlibəyov*** Şuşa qəzasının Çəmənli kəndində anadan olub. 1896-cı ildə Qori Müəllimlər Seminariyasını bitirib və Yelizavetpol quberniyasının Gülablı kənd məktəbinə, sonra H.Z. Tağıyev tərəfindən açılan Əhmədlidəki ibtidai məktəbə direktor təyin olunur.

***Muxtar bəy Kərbəlayı Şirin bəy oğlu Muradov*** Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra orda tərbiyəçi kimi işə başlamış, sonra müəllim kimi fəaliyyətini davam etdirmişdir. Həvəskar aktyor kimi bir çox tamaşalarda oynamış, "Difai" təşkilatının üzvü olmuşdur.

***Əliş bəy Sadıq oğlu Tahirov*** 1883-cü ildə Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra müəllim köməkçisi, 1884-cü ildə isə Qarğabazar kənd məktəbinə direktor (baxıcı) təyin olunmuşdur. Onun "Tatar dilini öyrənənlər üçün" kitabı 1887-ci ildə rus dilində nəşr edilib.

***Firidun bəy Əhmədağa oğlu Köçərli*** Aleksey Çernyayevskinin Qori Müəllimlər Se-

minariyasına seçdiyi tələbələrdən biri olub. 1879-1885-ci illərdə seminariyanı bitirir və İrəvan gimnaziyasında dərs deyir. 1910-cu ildə Qori Seminariyasına müvəqqəti təlimatçı təyin olunur. 1918-1920-ci illərdə onun təşəbbüsü və səyləri nəticəsində fəaliyyət göstərən Qazax Müəllimlər Seminariyasının müdiri işləyir. Görkəmli ədəbiyyatşünas alim, tanınmış maarifpərvər, ictimai xadim, publisist-yazıçı, tənqidçi və tərcüməçi F. Köçərli 300-dən çox dərsliyin yenidən işlənməsində və zənginləşdirilməsində iştirak etmişdir. 1920-ci ildə XI Ordunun xüsusi şöbəsi tərəfindən Gəncədə güllələnir.

***Abdulla bəy Kərim oğlu Məlikaslanov*** Qori Müəllimlər Seminariyasını bitirmiş, Qarğabazar kənd məktəbində, Qubadlı kənd məktəbində, Qaryagin (indiki Füzuli) məktəblərində müəllim işləmişdir.

***Süleyman (Sani) Axundov*** 1885-1894-cü illərdə Qori Müəllimlər Seminariyasında təhsil aldıqdan sonra III dərəcəli rus-tatar məktəbinə müəllim təyin edilmişdir. Pedaqoji fəaliyyətilə yanaşı, yazıçı və jurnalist kimi də tanınmışdır. 1906-cı ildə Bakıda çağırılmış Azərbaycan müəllimlərinin I qurultayının iştirakçısı olmuşdur. 1920–1921-ci illərdə Qarabağ vilayətinin maarif şöbəsinin müdiri, 1922–1930-cu illərdə Bakıda məktəb müdiri vəzifələrində çalışmışdır. "İkinci il" adlı dərs kitabının, siyasi-ictimai komediyaların və pyeslərin müəllifidir.

***Bədəl bəy Bəşir oğlu Bədəlbəyov*** ilk təhsilini molla yanında alıb, Qori Müəllimlər Seminariyasını bitirmişdir. Şuşada müəllim kimi fəaliyyət göstərmiş, XX əsrin əvvəllərindən isə 35 il rus-müsəlman məktəbinin müdiri vəzifəsində çalışmışdır (Əfrasiyab və Şəmsi Bədəlbəylinin atasıdır).

***Fərhad Məşədi Rəhim oğlu Ağazadə*** əlifba islahatçısı, mətbuat tarixçisi, publisist kimi fəaliyyət göstərmişdir. 1898-1900-cu illərdə Qori Müəllimlər Seminariyasını bitirərək Xaldan, Gorus, Gəncə, Bakı şəhərində müəllim işləmişdir. 1912-ci ildə "Ədəbiyyat məcmuəsi" adlı kitab tərtib edib. Azərbaycan Xalq Cümhuriyyətinin rəsmi orqanı olan “Azərbaycan” qəzetinin fəal mühəccirlərindən, yazarlarından olmuşdur. "Ərəb əlifbası türk dilinə niyə yaramır?", "Yeni türk əlifbalarının unifikasiyası üzrə materiallar", "Azərbaycanda yeni türk əlifbasının inkişafı və həyata keçirilməsi tarixi", "Yeni türk əlifbasının tarixi" kimi əsərləri xüsusi əhəmiyyətə malikdir.

***Zülfüqar bəy Əbdülhüseyn oğlu Hacıbəyov*** 1899-1904-cü illərdə Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra Yelizavetpoldakı (Gəncədəki) sənət məktəbində müəllimlik etmişdir. Azərbaycan bəstəkarı, Əməkdar İncəsənət Xadimi, Azərbaycan Dövlət Musiqili Komediya Teatrının yaradıcılarından biridir. ”50 yaşında cavan” operettası Azərbaycan səhnəsində komediya janrının ilk nümunəsi sayılır.

***Azad bəy Abbas oğlu Əmirov*** 1899-1904-cü illərdə Qori Müəllimlər Seminariyasını bitirmiş, sonra Odessa universitetinin hüquq və tibb fakültələrinə daxil olmuşdur. 1926-cı ildə ADU-da dərs demişdir. Azad bəy həkim, pedaqoq, Azərbaycanın ilk fizioloqudur.

***Abbas bəy Ağalar oğlu İsmayılbəyov*** 1899-1904-cü illərdə Qori Müəllimlər Seminariyasını bitirmişdir. Qərvənd kənd məktəbində müəllimlik etdikdən sonra 20 il Ağdamda 1 nömrəli məktəbin direktoru vəzifəsində çalışmışdır. Repressiya qurbanlarından biri kimi 1927-ci ildə sürgünə göndərilib, 1934-cü ildə qayıdaraq sevimli peşəsi ilə məşğul olub.

***Ağalar bəy Məmməd oğlu Hacıbəyov*** Qori Müəllimlər Seminariyasını bitirmiş, sonra Zəngəzur qəzasının Şəki kəndində müəllim işləmişdir. Ölüm tarixinə dair məlumat yoxdur.

***Mirzə Vəli bəy Məşədi Əziz oğlu İsmayılov*** 1907-ci ildə Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra Ağdam ikisinifli məktəbinə müəllim təyin olunmuşdur. Bir müddət Bakıda da müəllim kimi fəaliyyət göstərdikdən sonra Qarabağa qayıdıb.

***İbrahim bəy Məşədi Hacı oğlu Səfərov*** 1902-1906-cı illərdə Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra Bakı 1-ci Real məktəbinə müəllim təyin olunmuşdur və uzun müddət burada fəaliyyət göstərmişdir.

***Üzeyir bəy Əbdülhüseyn oğlu Hacıbəyov*** 1899-1904-cü illərdə Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra Cəbrayıl qəzasının Ağoğlan (Hadrut) kəndinə müəllim təyin edilib. Sonra Bakıda Bibiheybət və “Səadət” məktəbində dərs deyib. Azərbaycan türkcəsində “Hesab məsələləri”, “Mətbuatda istifadə olunan siyasi, hüquqi, iqtisadi sözlərin türki-rusi və rusi-türki lüğəti”ni hazırlamış, rus yazıçısı Nikolay Qoqolun “Şinel” povestini Azərbaycan dilinə tərcümə

etmişdir. 1911-ci ildə Moskva Filarmoniyasında musiqi təhsili almağa çalışsa da maddi ehtiyac üzündən təhsilini yarımçıq qoymuşdur. Azərbaycanın professional bəstəkarı, musiqişünas-alimi, publisisti, dramaturqu, pedaqoq və ictimai xadimi, peşəkar musiqi sənətinin və milli operanın banisidir.

***Həsən bəy Əhməd bəy oğlu Fətəlibəyov*** Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra Tatar-Azərbaycan suvari alayının ehtiyat bölməsinə könüllü olaraq qəbul edilmişdir. 1918-ci ildə uryadnik rütbəsi, eləcə də oboz (hərbi araba karvanı) komandiri vəzifələrində çalışmışdır. 1919-cu ildə ailə vəziyyətinə görə hərbi xidmətdən tərxis edilsə də 1920-ci ildə Azərbaycan Demokratik Respublikasının Əks-kəşfiyyat idarəsinin rəis müavini vəzifəsində çalışmışdır.

***Məhəmməd bəy Məlikyeqanov*** Qori Müəllimlər Seminariyasını bitirmişdir. Tuğ kənd orta məktəbinin direktoru işləmişdir. Qarabağda tanınmış Məlikyeqanovlar nəslindəndir.

***Xosrov bəy Heydərbəy oğlu Şirinbəyov*** Qori Müəllimlər Seminariyasını bitirdikdən sonra, Gəncədəki praporşiklər məktəbini də birinci dərəcə ilə bitirib. Bir müddət hərbi komendant vəzifəsində çalışıb. 1936-cı ildə Azərbaycan Sənaye İnstitutunu bitirən Xosrov bəy ömrünün sonuna kimi neftayırma mühəndisi işləyib.

İlk başda azərbaycanlıların bu seminariyada təhsil almasında çətinliklər olsa da, dini baxımdan ayrı-seçkilik qoyulmurdu. Lakin 1902-ci ildə Qori Seminariyasına direktor təyin olunan ermənipərəst Miropyev azərbaycanlılara qarşı amansız bir mövqe tutur və bir neçə azərbaycanlını haqsız olaraq seminariyadan qovdurur. Tənəffüsdə ana dilində danışmaq azərbaycanlı tələbələrə qadağan edilir, hətta Üzeyir bəy Hacıbəyliyə ana dilində danışdığına görə töhmət verilir. Bütün haqızlıqdan cana doyan Borçalı Mustafa "vəhşi asiyalı" sözünə görə erməni Ter-Arutyunovu öldürür. Bu hadisədən sonra Mirzə Fətəli Axundov, Mirzə Hüseyn Qayıbzadə Qafqaz canişini, böyük knyaz Mixail Nikolayeviç Romanova dəfələrlə məktub yazırlar və qeyd edirlər ki, məktəblərdə heç olmasa kargüzarlıq vəzifəsində bir azərbaycanlının işləməsi labüddür. Fransada, Almaniyada, Vyanada, Rusiyada təhsil alan azərbaycanlılar heç də geridə qalmış xalq deyillər. Azərbaycanlıların bu seminariyada təhsil almalarının çətinliyini əsaslandıraraq seminariyanın Azərbaycanda filialının açılmasını xahiş edirlər.

Nəhayət, Qafqaz canişini belə bir qərara imza atır: "Ölkənin azərbaycanlı əhalisi üçün Zaqafqaziya Müəllimlər Seminariyası yanında təcrübə məqsədilə 3 il müddətinə müstəqil Azərbaycan şöbəsi açılsın. Təcrübə yaxşı nəticə verərsə, 3 ildən sonra həmin şöbəni azərbaycanlılar üçün müstəqil seminariyaya çevirib Qoridən Azərbaycanın mərkəzinə köçürməli". Lakin nə rus çarlığı, nə də gürcü knyazlığı buna icazə vermir.

Yay məzuniyyətində məktəbin bağlı olmasından, rus çarının yıxılmasından və gürcü knyazlarının başları hökumət qurmağa qarışdığından fürsət tapan Firidun bəy seminariyanın Azərbaycan şöbəsinə məxsus bütün dəftərxana ləvazimatını, müxtəlif avadanlıqları vaqona doldúraraq öz xərci ilə gizlicə Ağdama gətirir. 1918-ci ildə Azərbaycan Cümhuriyyəti qurulan kimi Qori Müəllimlər Seminariyasının Azərbaycan bölməsi dövlətin maliyyə vəsaiti hesabına Qazax şəhərinə köçürülür. Seminariyaya Firidun bəy Köçərli rəhbərlik edir. 1920-ci ildə erməni terrorçuları tərəfindən Firidun bəy qətlə yetirilir. Bundan sonra seminariyaya Əli Hüseynov (Mehdi Hüseynin atası) rəhbərlik edir.

Seminariya Sovet hakimiyyəti qurulduqdan sonra 1940-cı illərə qədər Qazax Pedaqoji Texnikumu adı ilə fəaliyyət göstərir. Bu seminariyanın yetirmələri: Səməd Vurğun (şair, dramaturq, tərcüməçi, ədəbiyyatşünas tənqidçi), Mehdixan Vəkilov (tarixçi alim, yazıçı, pedaqoq, ictimai xadim), Osman Sarıvəlli (şair), Mehdi Hüseyn (nasir, dramaturq, ədəbiyyatşünas tənqidçi, ictimai xadim), Seyfulla Şamilov (nasir, publisist, tərcüməçi), İsmayıl Şıxlı (nasir, ədəbiyyatşünas, publisist, yazıçı, pedaqoq, ssenarist), Mirqasım Əfəndiyev (pedaqoq) və s.

***Çar Rusiyasına məxsus ali təhsil müəssisələrində təhsil alan Qarabağ ziyalıları.*** 1853-cü ildə Zaqafqaziya müsəlman məktəbinin şagirdləri üçün yeni imtiyazlar verən əsasnamə imzalandı. Müsəlman məktəblərini bitirmiş şagirdlər imperiyanın ali təhsil müəssisələrində təhsillərini davam etdirə bilərdilər. Əsasnamədə qafqazlı şagirdlərin təhsil alacağı müəssisələrin adları və tələbə sayı da qeyd olunmuşdur [1]: Çar Rusiyası dövründə təxmini 418 azərbaycanlı tələbə bu kimi ali təhsil müəssisələrində təhsil

almışdır. Bunlardan mühəndis ixtisası üzrə 13 nəfər, hüquqşünas ixtisası üzrə *4* nəfər, tibb ixtisası üzrə 11 nəfər*,* müəllimlik ixtisası üzrə *2* nəfər *qarabağlı t*əhsil almışdır.

Çar Rusiyasına məxsus ali təhsil müəssisələri ilə yanaşı bir sıra xarici ölkələrdə də təhsil almışlar**:**

1. *Əhməd bəy Mirzə Həsən bəy oğlu Ağayev (Ağaoğlu)* (Şuşa şəhəri) – Sankt-Peterburqda və Parisdə Sorbon Universiteti (1893).

2. *Bəhram bəy Məşədi Mirzə Cəfər(qulu) bəy oğlu Axundov* (Şuşa şəhəri) – Fransa Lill Auniversiteti (1901), Xarkov Universiteti (1904).

3. *Cavad bəy Həmid bəy oğlu Vəzirov* (Şuşa qəzası, Hindarx kəndi) – Almaniya, Leypsiq, ali k\t təhsili (1907).

4. *Ceyhun bəy Əd*ü*lhüseyn bəy oğlu Hacıbəyli* (Şuşa şəhəri) – Sankt-Peterburq, Varşava, Paris, Sorbon (1910)

5. *Behbud xan Azad xan oğlu Cavanşir* (Tərtər nahiyəsi) – Almaniya, Frayberq Dağ-Mədən Akademiyası (1912).

6. *Ələsgər bəy Rəhim bəy oğlu Bəylərbəyov* (Şuşa şəhəri) – Moskva Texniki Məktəbi, Varşava Politexnik İnstitutu (1912)

Çar Rusiyası təhsillə əlaqədar Qafqazda yaşayan erməni, gürcü xalqları ilə müqayisədə yenə də azərbaycanlılara daha sərt, daha qatı mövqedən yanaşmağa davam edirdi. Belə faktlar təhsil tarixi üzrə tədqiqatlar aparan görkəmli alimlərimiz Hüseyn Əhmədovun [1], Fərrux Rüstəmovun [7], Misir Mərdanovun [2.3.4] və Nərmin Tahirzadənin [8] araşdırmalarında da öz əksini tapmışdır.

***Repressiya qurbanı olan Qarabağ ziyalıları.*** Sovet hakimiyyəti dövründə tarixin qan yaddaşına yazılan repressiya illərində 2556 Azərbaycan ziyalısı da bu haqsızlığın qurbanı olmuşdur. AXC dövründə xaricə təhsil almağa göndərilən bir çox tələbələr kimi Qarabağın bir çox ziyalılarının da taleyi acınacaqlı olmuşdur.

*1. Cabbar bəy Vəlibəyov* – Ağdamın Birinci Baharlı kəndində yeni tipli məktəbin əsasını qoymuş pedaqoq, tanınmış ziyalı. 1937-ci ildə repressiya qurbanı olaraq, Sibirdə vəfat etmişdir;

*2. Qara bəy Əliverdilər* - ictimai-siyasi xadim, Azərbaycan Parlamentinin üzvü. Ölüm səbəbi məlum deyil;

3. *Cəmil bəy Haqverdiyev* - xeyriyyəçi, teatr həvəskarı. 1938-ci ildə repressiyaya uğramışdı.

4. *Fərhad bəy Ağalarov* - ADR ordusunun polkovniki. 1921-ci ildə sürgünə göndərilib.

5. *Əsgər bəy Bəylərbəyov* - mühəndis. Moskva Texniki İnstitutunun məzunu, 1937-ci ildə repressiya olunmuşdur.

6. *Həbib xan Şəkinski* - Azərbaycan Xalq Cümhuriyyəti dövründə Zəngəzur qəzasının rəisi.

7. *Mehrəli bəy Fərzəliyev* - AXC-nin keçmiş polis məmuru olduğuna görə təqiblərə məruz qalmış və 1942-ci ildə həbs olunmuşdur.

8. *Xudadat bəy Məlik-Aslanov* - AXC-nin birinci və ikinci hökumət kabinetlərində ilk yollar, poçt və teleqraf naziri. 1934-cü ilin avqustunda əsassız ittihamlarla həbs edilmiş, Sibirdəki xüsusi cəza müəssisələrindən birinə göndərilmişdi. 1935-ci ildə həbs düşərgələrinin birində vəfat etmişdi.

9. *Cəmil bəy İsmayıl bəy oğlu Vəzirov* - Xalq Poçt-Teleqraf və Rabitə Yolları komissarı (naziri) mühəndis, jurnalist, dövlət xadimi. 1938-ci il Oryol şəhərinə sürgün olunur, 1943-cü ildə sürgündə vəfat edir.

10. *Teymur bəy Məlikaslanov* - Azərbaycanlı mühəndis, kollec katibi. 1920-ci ildə Azərbaycan Sovet Sosialist Respublikasının İnqilabi Səhra Məhkəməsi ona ölüm hökmü kəsir və dərhal icra olunur.

11. *Nəriman bəy Nərimanbəyli* - Azərbaycan milli istiqlal hərəkatının fəal iştirakçılarından biri, Azərbaycan Xalq Cümhuriyyəti Parlamentinin üzvü, ictimai-siyasi və dövlət xadimi. 1937-ci ildə repressiyaya məruz qalmışdır.

12**.** *Bahadır Vəlibəyov* - Azərbaycan sovet partiya və dövlət xadimi, Azərbaycan SSR Baş Prokuroru, Stalin repressiyalarının qurbanı. 1940-cı ildə SSRİ Ali Məhkəməsi hərbi Kollegiyasının qapalı iclasında Vəlibəyov ən ağır cəzaya - ölüm hökmünə məhkum edilmiş və hökm dərhal icra edilmişdir.

13. *Yusif Vəzir Çəmənzəminli* - yazıçı. Nijni Novqorod vilayətinin Suxobezvodnaya stansiyasındakı həbs düşərgəsinə göndərilir. 1943-cü ildə aclıqdan və heç şübhəsiz, ürək tutmasından vəfat edir. 1956-cı ildə Yusif Vəzirə bəraət verildi [37, 66, 67].

Xalqımızın qan yaddaşını vərəqləmək doğurdan da insanda ürək yanğısı yaradır. Bu qədər amansızlıq, bu qədər haqsızlıq içində boğulmaq qismətimizə yazılıb. Lakin bütün bunlara baxmayaraq xalqım tolerantlıq və humanistlik kimi ali hisslərini itirməyib. Hər zaman mətin və ədalətli, düşmənə qarşı mərhəmətli olub.

Bu gün təhsil tariximizin yenidən öyrənilməsi və araşdırılmasına böyük ehtiyac vardır. Elmi axtarışlar nəticəsində bu gün də bizə məlum olmayan bir çox məlumatlar və elmi faktlar aşkarlanır. Şuşa ziyalılarının ali təhsil almaq üçün vətəndən uzaqlarda göstərdikləri fədakarlıqlar milli irsimizdə təhsilə və elmə olan marağın bariz nümunəsidir. Biz bu faktlara istinadən təhsil tariximizin dünənindən, bu günündən fəxrlə danışırıq.

**Problemin aktuallığı**. Təhsil tarixinin öyrənilməsi və araşdırılması hər zaman diqqət mərkəzində saxlanılmalıdır. Təhsilimizin dünəninin və bu gününün öyrənilməsi onun inkişafının təminatçısıdır.

**Problemin elmi yeniliyi.** Məqalədə bir çox elmi mənbələr araşdırılmış, təhlil edilmiş və dəqiq məlumatlar nəzəri baxımdan təqdim edilmişdir.

**Problemin praktik əhəmiyyəti.** Məqalə təhsil sahəsində çalışan mütəxəssislər, gənc elmi tədqiqatçılar və pedaqoji fəaliyyətdə olan müəllimlər üçün baza rolunu oynayacaq.

**Ədəbiyyat:**


1. Əhmədov, H.M. Azərbaycan məktəb və pedaqoji fikir tarixi. / H.M. Əhmədov. -Bakı: ADPU, -Elm və təhsil, -2014. -432 s.
2. Mərdanov, M.C. Azərbaycan təhsil tarixi. I cild. / M.C. Mərdanov -Bakı: Təhsil, -2011. -295 s.
3. Mərdanov, M.C. Azərbaycan təhsil tarixi. II cild. / M.C. Mərdanov -Bakı: Təhsil, -2011. -702 s.
4. Mərdanov, M.C. Azərbaycan təhsil tarixi. III cild. / M.C. Mərdanov -Bakı: Təhsil, -2011. -671 s.
5. Mərdanov, M. 1920-ci ilədək ali məktəblərdə oxumuş azərbaycanlılar (Ensiklopedik soraq kitabı). I cild. A hərfi. / M.C. Mərdanov., Ə. Tahirzadə -Bakı: Təhsil, -2018.-480 s.
6. Mərdanov, M. 1920-ci ilədək ali məktəblərdə oxumuş azərbaycanlılar (Ensiklopedik soraq kitabı). II cild. B-Ə hərfi. / M.C. Mərdanov., Ə. Tahirzadə -Bakı: Təhsil, -2019. -552 s.
7. Rüstəmov, F.A. Pedaqogika tarixi (Xarici ölkələrdə təhsil və pedaqoji fikir tarixi). / F.A Rüstəmov -Bakı: Nurlan, -2006. -726 s.
8. Tahirzadə, N.A. (2015). Azərbaycan təhsil tarixi oçerkləri və ilk ali təhsillilərimiz. / N.A Tahirzadə -Bakı: Nurlan, -2015. -480 s.


**E-mail:** konulmikayilova@rambler.ru
tavat.muradli2016@gmail.com
gulnara.shahmuradova@mail.ru
**Rəyçilər:** *ped.elm.dok., prof.*.**İ.H. Cəbrayılov**
*ped.elm.dok.* **Z.B. Muradova**
**Redaksiyaya daxil olub:** 23.01.2023.

# *İBTİDAİ TƏHSİLİN AKTUAL PROBLEMLRİ*
# *АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ НАЧАЛЬНОГО ОБРАЗОВАНИЯ*
# *ACTUAL PROBLEMS OF PRIMARY EDUCATION*

*UOT 372.3/.4*

***Şəhla Telman qızı Həsənova***
*fəlsəfə doktoru proqramı üzrə doktorant,*
*Azərbaycan Respublikasının Təhsil İnstitutu*
*https://orcid.org/0000-0002-8744-9614*

## İBTİDAİ SİNİFLƏRDƏ DİDAKTİK OYUNLARIN TƏTBİQİNİN ELMİ-PEDAQOJİ ƏSASLARI

***Шахла Тельман гызы Гасанова***
*докторант по программе доктора философии*
*Институт Образования Азербайджанской Республики*

## НАУЧНО-ПЕДАГОГИЧЕСКИЕ ОСНОВЫ ПРИМЕНЕНИЯ ДИДАКТИЧЕСКИХ ИГР В НАЧАЛЬНЫХ КЛАССАХ

***Shahla Telman Hasanova***
*doctorial student in the program of doctor of philosophy*
*Institute of Education of the Republic of Azerbaijan*

## SCIENTIFIC AND PEDAGOGICAL BASIS OF THE APPLICATION OF DIDACTIC GAMES IN PRIMARY CLASSES

**Xülasə.** Məqalədə müəllif ibtidai siniflərdə didaktik oyunlardan istifadənin əhəmiyyətini izah edir. Qeyd edilir ki, didaktik oyunlar kiçikyaşlı məktəblilərin idrak fəallığını sürətləndirir, onlarda təlimə böyük maraq yaradır, təlim prosesinin səmərəsini artırır. İbtidai siniflərdə müxtəlif didaktik oyunların tətbiqi şagirdləri daha da fəallaşdırır, onların intellektual səviyyəsini inkişaf etdirir, dərketmə qabiliyyətlərini yaxşılaşdırır.
***Açar sözlər:*** *didaktik oyun, təlim prosesi, kiçikyaşlı məktəbli, fəaliyyət, öyrənmə*

**Резюме.** В статье автор объясняет важность использования дидактических игр в начальных классах. Отмечено, что дидактические игры ускоряют познавательную деятельность младших школьников, вызывают большой интерес к обучению, повышают эффективность учебного процесса. Применение различных дидактических игр в начальных классах активизирует активность учащихся, развивает их интеллектуальный уровень, улучшает понимание.
***Ключевые слова:*** *дидактическая игра, учебный процесс, учащийся начальной школы, деятельность, обучение*

**Summary.** In the article, the author explains the importance of using didactic games in primary classes. It is noted that didactic games accelerate the cognitive activity of young schoolchildren, create great interest in learning, and increase the effectiveness of the learning process. The application of various didactic games in primary classes makes students more active, develops their intellectual level, and improves their understanding.
***Key words:*** *didactic game, learning process, elementary school student, activity, learning*

Dərs prosesində kiçikyaşlı məktəblilərin əqli yüklənməsi onların oxumaq həvəsinin azalmasına, çox tez yorulmasına, nəticədə isə dərsin effektivliyinin aşağı düşməsinə səbəb ola bilər.

Bu səbəbdən də müəllimlər təlim prosesində şagirdlərdə öyrənməyə yüksək maraq yaratmalı, onların fəallığını proses boyu qoruyub saxlamalıdırlar. Hər bir müəllim öyrənənlərin düşünməsini fəallaşdıran, onları həvəsləndirən yeni metodların axtarışında olmalıdır.

Məktəblinin şəxsi idrak fəallığı onun oxuması üçün mühüm amildir və tədris materialının mənimsənilməsinin sürətinə, dərinliyinə və möhkəmliyinə həlledici təsir göstərir [5, s.166].

Təlim prosesində şəxsi idrak fəallığı dedikdə şagirdin gerçəkliyi öyrənməyə can atması, məqsədə çatmaq üçün iradə göstərməsi nəzərdə tutulur. Kiçikyaşlı məktəblilərdə idrak fəallığı formalaşdırmaq, onların düşüncəsini inkişaf etdirmək üçün müxtəlif tədbirlər görülür. Həmin tədbirlərdən biri də təlimdə didaktik oyunlardan istifadədir.

Tədris prosesinin necə qurulması şagirdlərin dərsə marağının oyanmasına birbaşa təsir edir. İbtidai siniflərdə didaktik oyunların tətbiqi kiçikyaşlı məktəblilərdə idrak maraqlarının yaranmasına kömək edir. Didaktik oyunlar inkişaf, tərbiyə və təhsil funksiyalarını yerinə yetirən müasir təlim metodlarından biridir. Bu oyunların ibtidai siniflərdə tətbiqi elmi əhəmiyyət kəsb edir.

Tədqiqatlar göstərmişdir ki, şagirdlər biliyi yalnız təlim prosesində müəllimin köməyi və rəhbərliyi ilə deyil, eyni zamanda, müstəqil öyrəndikləri zaman əldə edirlər. Çünki sərbəst öyrənmə prosesində öyrənənin yaradıcı fəallığı daha da inkişaf edir. Bununla yanaşı öyrənənlərin biliyi dərketmə və mənimsəmə səviyyəsindəki fərdi fərqlər də öyrənmə prosesində mühüm rol oynayır.

Bəzən şagird hər hansı bir fənni zəif qavradıqda fənn müəllimi onun mənimsəmə qabiliyyətinin aşağı olduğunu düşünür. Lakin bunun əsas səbəbi şagirdin təlim sürətinin sinif üçün normal hesab edilən təlim sürətinə uyğunlaşa bilməməsidir. Təlim prosesində şagirdlərdə konstruktiv münasibətin formalaşdırılması onların fəallığını artırır, öyrənməni stimullaşdırır. Bu işdə əsas vasitə təlim prosesində müasir, maraqlı metodlardan istifadədir.

Şagirdin biliyi uğurla mənimsəməsi üçün onda dərsə maraq oyatmaq lazımdır. İbtidai sinif şagirdlərinin idrak fəallığının, təfəkkürünün inkişafında, onların fənnə marağının artırılmasında müxtəlif priyomların, əyləncəli tapşırıqların xüsusi əhəmiyyəti var. Maraq kiçikyaşlı məktəblilərin əqli əməyə olan istəyinin başlıca səbəbidir. Buna görə də müəllimlər şagirdlərdə dərsə maraq yaratmağın müxtəlif yollarını axtarıb tapmağa çalışmalı, şagirdləri təəccübləndirmək, heyrətləndirməklə yanaşı, onların diqqətini dərsə cəlb etməyi bacarmalıdırlar.

Dərs prosesində yaranan situasiyalarda alınan nəticə ilə gözlənilən nəticənin üst-üstə düşməməsi kiçikyaşlı məktəblilərdə təəccüb və heyrət hissinin yaranması ilə nəticələnir. Bu səbəbdən dərs zamanı elə situasiyalar yaratmaq lazımdır ki, şagirdlərin zehnində xoş hisslər formalaşsın. Bu hisslər öyrənənlərin maraqları, onların yeniliyə olan həvəsləri, bilmədikləri şeyləri öyrənmək istəkləri ilə əlaqədardır. Məhz şagirdlərin təəccüb, heyrət və maraq hisslərinin bir-birilə birləşməsi onlarda idrak fəallığının formalaşmasına kömək edir.

Tədqiqatlar göstərmişdir ki, didaktik oyun ibtidai sinif şagirdlərinin səmərəli işləməsi, əmək fəaliyyətinə cəlb olunması üçün əvəzsiz vasitələrdən biridir. Didaktik oyunları tətbiq edərkən kiçikyaşlı məktəblilərin yaş xüsusiyyətlərinə diqqət yetirmək lazımdır. Təlimin kiçikyaşlı məktəblilərin əsas fəaliyyət növü olmasına baxmayaraq ibtidai siniflərdə didaktik oyunların istifadəsinə geniş yer vermək lazımdır. Çünki şagirdlər tez yorula və həvəsdən düşə bilirlər.

Təlim prosesində oyun texnologiyasının yeri və rolu, oyun elementlərinin öyrənmə ilə üzvi şəkildə əlaqəsi müəllimin pedaqoji oyunların funksiyasını və təsnifatını dərk etməsindən çox asılıdır [3, s.182].

Didaktik oyunların düzgün və yerində istifadəsi kiçikyaşlı məktəblilərin hafizə və təfəkkür proseslərini yaxşılaşdırır, onların fiziki inkişafına kömək edir, sosial inkişafını dəstəkləyir, əxlaqi keyfiyyətlər formalaşdırır. Oyun prosesi şagirdin təsəvvür, duyğu və qavrayışını daha da zənginləşdirir.

Oyunda şagirdlərin bir-birləri ilə münasibəti onların davranışında təzahür edir. Onlar fəaliyyətlərini bir-birilə uyğunlaşdırmağa, oyunun qaydalarına tabe olmağa çalışırlar. Müəllim şagirdlərə yoldaşları ilə münasibətdə tələbkar, diqqətli və xoşniyyətli olmağı, bir-birlərinin fikirləri ilə hesablaşmağı öyrətməlidir. Şagirdlər bu işə yalnız oyun kimi baxmamalı, kollektiv qarşısında məsuliyyət daşıdıqlarını başa düşməlidirlər.

Oyunun gedişində müəyyən çətinliklər yarana bilər. Şagirdlər müxtəlif fərdi xüsusiyyətlərə malik olduqlarından onların bu çətinliklərə münasibəti də müxtəlif olur. Bəzi şagirdlərdə coşqunluq, nikbinlik, özünəinam, gümrahlıq hissləri, bəzilərində isə qüssə, uğursuzluq, inamsızlıq, köməksizlik hissləri yarana bilir. Müəllim şagirdlərdə yaranan mənfi hissləri aradan qaldırmağa çalışmalı, onlarda ruh yüksəkliyi formalaşdırmalıdır.

Oyunun təşkilində ən vacib məsələlərdən biri müəllimin bu prosesdə iştirakıdır. Bu zaman kiçikyaşlı məktəblilərin oyuna marağı artır, oyundan həzz alırlar, müəllim isə onlara daha da yaxın olur. Müəllimlərin oyun zamanı şagirdlərə verdiyi biliklər onlarda maraq və əxlaq hissini inkişaf etdirir. Oyun kiçikyaşlı məktəblilərin əhval-ruhiyyəsini yaxşılaşdırır, onlarda qələbə əzmi yaradır. Müəllim sonda oyunun nəticəsini, nöqsanları bütün sinif şagirdlərinin iştirakı ilə analiz edir, aydınlaşdırır, səhvləri başa salır.

Didaktik oyunlar bir sıra vəzifələrə xidmət etməli, dərsi rəngarəng etməlidir. Bu zaman oyunlar təlimin mühüm tərkib hissəsinə çevrilə bilər. Tədqiqatlar təsdiqləyir ki, didaktik oyunlar ibtidai sinif şagirdlərinin mənimsəmə qabiliyyətini yaxşılaşdıraraq onları daha da aktivləşdirir, şagirdlərin idrakını inkişaf etdirir. Bu səbəbdən tədrisin didaktik oyunlarla təşkili vacib məsələlərdəndir. Kiçikyaşlı məktəblilərin nitqinin, qavrayışının və təfəkkürünün inkişafında, dərs materialını yaxşı mənimsəmələrində də didaktik oyunlar əhəmiyyətli rol oynayır. Öyrədici oyunlar öyrənənləri düşündürür və onları düşündüklərini söyləməyə məcbur edir. Məktəblilər danışaraq işləyən zaman onların təfəkkürü və nitqi paralel inkişaf edir.

Didaktik oyunlar bir sıra məqsədlərə xidmət edir, təlimin səmərəli keçməsinə, mövzunun yaxşı mənimsənilməsinə və yaddaşda qalmasına kömək edir. Təlim ilə oyun elementlərinin birləşməsindən yaranan didaktik oyunlar təlim vəzifələrinə xidmət etdiyindən bəzi xüsusiyyətlərə malikdir. Həmin xüsusiyyətlərə oyunların qısamüddətli təşkil olunması, idrak fəallığını sürətləndirməyə çalışması və s. aid etmək olar. Oyun tapşırıqlarının əsas xüsusiyyəti ziddiyyətli xarakterdə olmasıdır. Bu ziddiyyətlər problem təlimə xas olan ziddiyyətlərdir [6, s.292].

Didaktik oyunlar yalnız oyun kimi qəbul edilməməlidir. Adından da məlum olduğu kimi, bu oyunlar didaktik vəzifə daşıyır. Bu mənada didaktik oyunlar öyrənənləri bilik əldə etməyə yönəltməlidir. Kiçikyaşlı məktəblilər oyun zamanı axtarışlar, təhlillər etməli, yeni biliyi özləri kəşf etməli və nəticəyə gəlməlidirlər. Öyrənənlər vahid məqsəd üçün çalışmalı, birlikdə fəaliyyət göstərməlidirlər. Oyun kiçikyaşlı məktəbliləri cəlb etməli, onları oyunun şərtlərini yerinə yetirməyə sövq etməlidir.

Didaktik oyunlar şagirdlərə bilikləri sistemləşdirmək işində kömək edir. Şagird hansısa lazımi məlumatı tapmaq istədikdə bütün mümkün məlumatları tutuşdurur, verilən suala uyğun cavab verməyə çalışır. Tapılan məlumatlar ümumiləşdirilir, sistemləşdirilir və bu iş idraki fəaliyyət hesab olunur.

Didaktik oyunlar kiçikyaşlı məktəbliləri hərtərəfli inkişaf etdirən güclü vasitədir. Kiçikyaşlı məktəblilər hələ məktəbəqədər dövrdə artıq didaktik oyunlarla tanış olurlar. I-IV siniflərdə oyunların tətbiqinə geniş yer verilsə də, I sinifdə oyuna daha çox ehtiyac hiss olunur. Sonrakı siniflərdə məktəblilərin oyuna meyli əvvəlki oyunların necə təşkilindən asılı olur. Buna görə də müəllimlər tədrisin oyunlarla təşkilinə xüsusi diqqət ayırmalıdırlar.

Oyun elə bir vasitədir ki, onun köməyi ilə şagirdlərin fəallığını gücləndirmək, onların yorğunluq və dalğınlığının qarşısını almaq olar. Müəllim oyunu elə təşkil etməlidir ki, kiçikyaşlı məktəblilərin diqqəti qeyri-ixtiyari şəkildə dərsə yönəlsin. Oyun düzgün təşkil olunduqda şagirdlərin əhvalı yaxşılaşır, dərsə cəlb olunma səviyyələri yüksəlir. Oyunun gedişində şagirdlərdə müəyyən davranış qaydaları formalaşır, bir sıra iradi keyfiyyətlər tərbiyə olunur. Şagirdlərə oyun zamanı şərti azadlıq verilir və bununla da onların xarakterindəki müəyyən yaxşı və pis cəhətləri aşkar etmək olur. Müəllimlər bundan istifadə etməli, kiçikyaşlı məktəblilərin xarakterindəki mənfi cəhətlərin aradan götürülməsinə, müsbət cəhətlərin isə formalaşdırılmasına çalışmalı, bu istiqamətdə tədbirlər görməlidirlər.

Didaktik oyunlar vasitəsilə təlim və oyun fəaliyyəti bir-birilə əlaqələndirilir. Öyrədici oyunların hər birində şagirdlərə idraki tapşırıq verilir. Oyun fəaliyyəti elə istiqamətləndirilir ki, bütün didaktik vəzifələr icra olunsun.

I-IV siniflərdə təlim oyunları elə təşkil olunmalıdır ki, məktəblilərin əxlaq tərbiyəsinə imkan yaransın. Oyunların köməyi ilə öyrənənlərdə əməksevərlik, düzgünlük, ədalətlilik, əməyə, həyata, ailəyə, insana sevgi tərbiyə olunur. Oyun prosesinin imkanlarından istifadə edərək əxlaqi keyfiyyətləri vərdişə çevirmək mümkündür. Şagirdlərin hamısı oyunun tələblərinə riayət edir, hansısa qayda pozulduqda ədalətli qərar verirlər ki, bu da onlarda müsbət əxlaqi keyfiyyətlərin yaranmasına kömək edir.

Didaktik oyunları seçərkən və təşkil edərkən çox diqqətli olmaq lazımdır ki, oyun ibtidai sinif şagirdlərinin idrak fəallığını gücləndirsin, lakin onlarda yorğunluq yaranmasın. Hal-hazırda dərs prosesində müxtəlif didaktik oyunlardan istifadə olunur. Öyrədici oyunları dərsin mövzusuna və məqsədinə uyğun olaraq müxtəlif mənbələrdən götürmək olar. I-IV siniflərdə istifadə olunan didaktik oyunları məzmununa, formasına, məqsəd və vəzifəsinə əsasən bir neçə yerə ayırmaq mümkündür:

1. Əyani didaktik oyunlar;
2. Sözlü didaktik oyunlar;
3. Riyazi didaktik oyunlar.

Əyani didaktik oyunlarda müəyyən cəhətlər məlum olduğundan axtarılanı tapmaq asanlaşır. Bu oyunlar öyrənəndən müşahidə və müqayisə etmə bacarığı tələb edir. Bu səbəbdən şagirdlərdə həmin bacarıqlar formalaşdırılmalıdır. Əyani oyunlar şagirdlərdən, eyni zamanda, yaxşı nitq bacarığı və təfəkkürün inkişafını tələb edir. Şagirdlər oyunda fikirlərini aydın, başa düşülən formada ifadə etməlidirlər. Əyani oyunlarda əyanilikdən (şəkil, sxem, paylama materialı və s.) istifadə axtarılan məsələni tez tapmağa kömək edir, müəyyən cəhətləri müəyyənləşdirməyə imkan verir.

Sözlü didaktik oyunlar Azərbaycan dili və riyaziyyat dərslərində daha çox tətbiq olunur. Bu oyunlar öyrənənlərin şifahi nitqinin, şifahi hesablama bacarıqlarının inkişafına, söz ehtiyatının zənginləşməsinə xidmət edir.

Riyazi didaktik oyunlar öyrənənlərin hesablama bacarığının daha da inkişafına və sürətlənməsinə şərait yaradır. Oyun elə təşkil olunur ki, şagirdlər cavabı tapmaq üçün düşünməyə, hesablamalar aparmağa vadar olurlar. Oyunun gedişində problemli situasiyalar yaradılır ki, şagirdlər problemi həll etmək üçün əqli əmək sərf edirlər. Nəticədə, onların riyazi təfəkkürü inkişaf edir. Bu oyunlar riyaziyyat dərslərində daha çox istifadə olunur. Amma riyazi oyunları həyat bilgisi, texnologiya, Azərbaycan dili, təsviri incəsənət dərslərində də tətbiq etmək olar. Bu oyunlar kiçikyaşlı məktəblilərin bütün fənlərdə öyrəndikləri məlumatları ümumiləşdirməyə və sistemləşdirməyə kömək edir, fənlərarası inteqrasiyanı təmin edir.

Şagirdlərdə təfəkkür müstəqilliyi formalaşdırmaq müasir dərsin başlıca vəzifəsidir. Hər bir müəllimdən şagirdlərdə dərketmə əməliyyatlarını yaxşılaşdırmaqla onların öyrənməsi üçün əlverişli şərait yaratmaq tələb olunur. Dərketmə əməliyyatları dedikdə qruplaşdırma, sistemləşdirmə, təhlil etmə, oxşarlıqla fərqin, səbəblə nəticə əlaqələrinin müəyyənləşdirilməsi nəzərdə tutulur. Bu əməliyyatlar şagirdlərə tədris tapşırıqlarını uğurla icra etməyə imkan yaradır. Didaktik oyunlar kiçikyaşlı məktəblilərin dərketmə əməliyyatlarını sürətləndirir, onlarda təlimə marağın yaranmasına, idrak fəallığının formalaşmasına kömək edir. Onlar oyadıcı və şagirdlərin təlim fəaliyyətini stimullaşdıran bir vasitə kimi çıxış edir [3, s.182].

**Problemin aktuallığı.** İbtidai siniflərdə didaktik oyunlardan istifadə təlim prosesini asanlaşdırır, onu əhəmiyyətli və dinamik edir. Oyun texnologiyalarının tətbiqi dərsin şagirdlər üçün daha maraqlı bir fəaliyyətə çevrilməsini təmin edir.

**Problemin elmi yeniliyi.** İbtidai siniflərdə istifadə olunan didaktik oyunların növləri müəyyənləşdirilmiş, bu oyunların tətbiqinin əhəmiyyəti açıqlanmış və istifadə imkanları araşdırılmışdır.

**Problemin praktik əhəmiyyəti.** I-IV siniflərdə təlim prosesində didaktik oyunların istifadəsi kiçikyaşlı məktəblilərin yaş xüsusiyyətlərinə tam uyğundur. Bu oyunlar vasitəsilə təlim prosesində böyük uğur əldə etmək mümkündür. Kiçikyaşlı məktəblilərin fəallığının artırılmasında, dərsi mənimsəmə səviyyəsinin yaxşılaşdırılmasında, idrak proseslərinin sürətləndirilməsində didaktik oyunların rolu böyükdür.

**Ədəbiyyat:**

1. Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası. // Azərbaycan müəllimi‖. - 2013, 25 oktyabr.

2. Azərbaycan Respublikasında ümumi təhsilin Konsepsiyası (Milli Kurikulumu) // Azərbaycan məktəbi, -2007, № 2.
3. Əhmədov, H.H. Pedaqogika. / H.H. Əhmədov, N.E. Zeynalova. -Bakı: Elm və təhsil, -2018, 456 s
4. Nəzərov, M.H. Pedaqoji texnologiyalar. / M.H. Nəzərov, N.Z. Quliyev, X.M. Nəzərova. - Bakı: ADPU-nun nəşriyyatı, -2020, -467 s
5. Paşayev, Ə.X. Pedaqogika. / Ə.X. Paşayev, F.A. Rüstəmov. -Bakı: Elm və təhsil, -2012, -464 s.
6. Rüstəmov, F.A. Ali məktəb pedaqogikası. / Rüstəmov F.A., Dadaşova, T.Y. -Bakı: Nurlan, -2007, -568 s.
7. Veysova, Z.A. Fəal/interaktiv təlim: Müəllimlər üçün vəsait. / Z.A. Veysova. -Bakı, -2008, -149 s.
8. https://e-qanun.az/framework/18343


**E-mail:** hasanova.shahla1996@mail.ru
**Rəyçi:** *ped.elm.dok., prof* . **İ.H. Cəbrayılov**
**Redaksiyaya daxil olub:09.01.2023.**

## *MƏKTƏBƏQƏDƏR TƏHSİL VƏ TƏRBİYƏ*
## *ДОШКОЛЬНОЕ ОБРАЗОВАНИЕ И ВОСПИТАНИЕ*
## *PRESCHOOL EDUCATION AND UPBRİNGİNG*

*UOT 373.2*

***Şərafət Aram qızı Baxışova***
*pedaqogika elmləri doktoru, dosent*
*Azərbaycan Dövlət Pedaqoji Universiteti*

# MƏKTƏBƏQƏDƏR YAŞLI UŞAQLARIN VALEOLOJİ TƏRBİYƏSİ SAĞLAM HƏYAT TƏRZİNİN FORMALAŞMASI AMİLİ KİMİ

***Шарафат Арам гызы Бахышева***
*доктор педагогических наук, доцент*
*Азербайджанского Государственного Педагогического Университета*

# ВАЛЕОЛОГИЧЕСКОЕ ВОСПИТАНИЕ ДЕТЕЙ ДОШКОЛЬНОГО ВОЗРАСТА, КАК ФАКТОР ФОРМИРОВАНИЯ ЗДОРОВОГО ОБРАЗА ЖИЗНИ

***Sharafat Aram Bakhishova***
*doctor of pedagogical sciences,*
*associate professor*

# VALEOLOGICAL EDUCATION OF PRESCHOOL CHILDREN AS A FACTOR IN THE FORMATION OF A HEALTHY LIFESTYLE

**Xülasə.** Sağlam və kamil insan yetişdirmək cəmiyyətin ən mühüm vəzifəsidir. Valeologiya sağlamlıq elmidir. Uşaq bağçasında valeologiya üzrə yaxşı hazırlanmış məşğələlər gələcəkdə uşağın sağlamlığını qorumağa, həyati təhlükəsi olan vəziyyətlərə düşməməyə kömək edəcəkdir. Valeologiya məşğələlərinin məqsədi uşaqların öz bədənləri, sağlamlıqları və həyat üçün təhlükəli vəziyyətlər haqqında təsəvvürlərini genişləndirmək, onlarda şəxsi gigiyena bacarıqları, şifahi ünsiyyətə, asudə vaxt mədəniyyətinə yiyələndirməkdir.
***Açar sözlər*****:** *valeoloji təhsil, sağlam insan, sağlam həyat tərzi, ailənin voleoloji bilikləri, düzgün fiziki inkişaf, sağlamlığın keyfiyyəti*

**Резюме.** Воспитание здорового и совершенного человека – важнейшая задача общества. Валеология – это наука о здоровье. Хорошо подготовленные упражнения по валеологии в детском саду помогут уберечь здоровье ребенка в будущем, не попасть в опасные для жизни ситуации. Цель занятий по валеологии - расширить представления детей о собственном теле, здоровье и опасных для жизни ситуациях, приобрести навыки личной гигиены, устного общения, культуры досуга.
***Ключевые слова***: *валеологическое образование, здоровый человек, здоровый образ жизни, валеологические знания семьи, правильное физическое развитие, качество здоровья*

**Summary.** Raising a healthy and perfect person is the most important task of the society. Valeology is a health science. Well-prepared exercises in valeology in kindergarten will help to protect the health of the future child, not to fall into life-threatening situations. The purpose of valeology classes is to expand children's ideas about their own body, health and life-threatening situations, to acquire personal hygiene skills, oral communication, and leisure culture.
***Key words*****:** *voleological education, healthy person, healthy lifestyle, physical education of children, proper physical development, quality of health*

Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il iyulun 16-da 137 nömrəli qərarı ilə təsdiq edilmiş “Məktəbəqədər təhsilin dövlət standartı və proqramı”nda [1] məktəbəqədər təhsil proqramlarının uşaqların öyrənmək həvəsinin, yaradıcı təxəyyülünün formalaşması, kommunikativliyinin inkişafı, fiziki və psixi sağlamlıqlarının qorunması və möhkəmləndirilməsi və s. məsələlərin vacibliyi göstərilmişdir.

Göstərilən tələblərin həyata keçirilməsi bir sıra amillərlə bağlıdır. Birincisi, sağlamlığında problemlər olan uşaqlar nəzərə alınmalıdır. İkincisi, ənənəvi təlimdən variativ və şəxsiyyətyönlü təlimə keçərkən uşaqların fiziki, psixi inkişafının, sağlamlığının möhkəmləndirilməsinin təmin olunmasına xidmət edən proqramların reallaşdırılmasına imkan yaradılması zəruridir.

Yerli və xarici təcrübənin öyrənilməsindən belə qənaətə gəlinir ki, məktəbəqədər təhsil müəssisələrində qismən də olsa valeologiya metodları ilə rejimin tənzimlənməsi məqsədəmüvafiqdir. Təlim prosesinin optimallaşdırılması prosesində valeoloji monitorinqin keçirilməsi uşaqların psixofizioloji gərginliyi və əsəbilik səviyyəsi aşağı endirilməsi ilə nəticələnir. Valeoloji maarifləndirmə, sağlam həyat tərzinin təbliği və fiziki mədəniyyətlə birlikdə bu cür işin aparılması uşaqların sağlamlığında müsbət nəticələr əldə etməyə imkan verir [2].

Ümumdünya Səhiyyə Təşkilatı (ÜST) sağlamlığın tərifini belə vermişdir: “Sağlamlıq fiziki, əqli və sosial rifahın bütöv bir şəkildə mövcud olması, xəstəliklərin və bəlanın insan bədənindən uzaq olmasıdır”[6].

Uşağın lazımınca qidalanması, peyvənd olunması, təhsili və onların tibbi xidmətdən yararlanması bütün ölkələrdə iqtisadiyyatın inkişafından və ya iqtisadi böhrandan asılı olmamalıdır. Hər bir uşağın normal inkişafı üçün bütün maneələr aradan qaldırılmalıdır.

2000-ci ildə əhalinin sağlamlığının yaxşılaşdırılması məqsədilə dünyada “Minilliyin İnkişaf Proqramı” qəbul edilmişdir. Minilliyin inkişaf proqramında qəbul edilmiş 8 məqsəddən 3-ü, 18 hədəfdən 8-i, 48 müddəadan 18-i sağlamlıqla bağlıdır [7].

Göründüyü kimi, insanların keyfiyyətli həyat yaşaması üçün ən başlıca amillərdən biri insanın bədəninin, əqlinin və yaşadığı mühitin sağlam olmasıdır.

İnsanın sağlamlıq haqqında aldığı bilik hələ onun sağlam həyat tərzi keçirəcəyinə zəmanət vermir. Bu baxımdan insanda sağlamlıq üçün sabit motivasiya yaratmaq lazımdır. Sağlam doğulmuş bir insan, bir qayda olaraq, onun pozulmasının ciddi əlamətləri görünənə qədər sağlamlığını hiss etmir.

Xüsusilə narahatedici vəziyyət uşaqların sağlamlığı ilə bağlıdır. Uşaq sağlamlığının qorunması Azərbaycanda prioritet istiqamətlərdəndir. Uşaqlar xalqımızın, dövlətimizin, hər bir ailənin ən qiymətli sərvətidir. Onları həm fiziki, həm də mənəvi cəhətdən sağlam böyütmək çətin və məsuliyyətli olduğu qədər də şərəflidir. Əgər gələcəyimizi bu günün uşaqlarına əmanət ediriksə, hər birinin düzgün tərbiyə olunması da bizi ciddi düşündürməlidir. Elə məhz buna görə də uşaqlara qayğı ən yüksək səviyyədə olmalıdır. Uşaqların yüksək qayğı ilə əhatə olunması, əlverişli mühitdə böyüməsi üçün zəruri şəraitin yaradılması, onların şəxsiyyət kimi formalaşmasının əsası ulu öndər Heydər Əliyev tərəfindən qoyulmuş dövlət uşaq siyasətinin prioritet istiqamətlərindən birini təşkil edir.

Azərbaycan xalqının özünəməxsus mütərəqqi uşaq tərbiyəsi üsulları var ki, dünyanın heç bir yerində bunlar yoxdur. Olsa belə, Azərbaycandakı qədər dolğun, mükəmməl və bir-birini tamamlaya biləcək səviyyədə özünü göstərmir. Azərbaycan ailələrində uşağın tərbiyə olunması üsulları zəngin, spesifik xüsusiyyətlərə malikdir. Azərbaycan ailələrində valideynlərin uşaqların təlim-tərbiyəsində xüsusi rolu var. Həmin rol ondan ibarətdir ki, valideynlər mümkün olduğu qədər uşaqları zərərli vərdişlərdən uzaq tutmağa çalışır. Valideynlər çox istəyir ki, öz övladını qayğı ilə əhatə etsin, daim diqqətdə saxlasın, hərəkətlərinə nəzarət etsin.

Şübhəsiz ki, sağlamlıq probleminin həlli üçün sağlamlıq mədəniyyətinin tərbiyəsi məsələsini dövlət proqramının tərkib hissəsinə tam şəkildə çevirmək lazımdır. Sağlamlığın qorunması və möhkəmləndirilməsi məsələləri həmişə aktual problem olmuş və bu gün də belədir. Uşaqlarda erkən yaş dövründən sağlam həyat tərzi mədəniyyəti, sağlam həyat tərzi bacarıqları formalaşdırmaq və möhkəmləndirmək lazımdır. Sosial sifarişi yerinə yetirən məktəbəqədər təhsil müəssisələri fiziki, mənəvi cəhətdən sağlam,

hərtərəfli inkişaf etmiş şəxsiyyətin yetişdirilməsinə tam cavabdehdir.

Bu gün uşaqların sağlamlığı problemi çox aktualdır. Uşaq tərbiyəsində əsas və vacib olan məsələ onların sağlam olmalarıdır. Hal-hazırda gənc nəslin sağlamlıq vəziyyəti fəlakətli bir şəkildə pisləşir. Zehni və nitq inkişafı pozğunluğu olan uşaqların sayı artır və bu vəziyyəti dəyişdirmək üçün mexanizmlər axtarmaq tələb olunur. İnsanın özünü, öz maddi və mənəvi potensialını maksimum reallaşdıra bilməsi üçün ona ilk növbədə fiziki sağlamlıq lazımdır.

Uşağın orqanizminin formalaşmasına aşağıdakı amillər təsir edir:

- ətraf mühit;
- ailələrin sosial səviyyəsi;
- qidalanma;
- oturaq həyat tərzi;
- əsəb gərginliyi;
- stress;
- əhalinin müəyyən təbəqələri üçün tibbi xidmətlərin əlçatmazlığı;
- yuxu;
- gigiyenik qaydalara düzgün riayət olunmaması.

Gigiyena sağlamlığın şərtidir. Gigiyena – tibbin həyat şəraitinin, insan əməyinin insana təsirini və müxtəlif xəstəliklərin profilaktikasını öyrənən sahəsidir; bu sağlamlığı qorumağa və ömrü uzatmağa kömək edir.

Məktəbəqədər təhsil müəssisələrində uşaqların valeoloji mədəniyyəti bir neçə komponentin birləşməsidir: sağlamlığa və həyata şüurlu münasibət, sağlamlıq haqqında biliklərə yiyələnmək, sağlamlığı qorumaq, möhkəmləndirmək bacarığı, habelə sağlam həyat tərzi ilə bağlı problemləri həll etmək, təhlükəsiz davranış, tibbi, psixoloji kömək və yardım göstərmək.

Məktəbəqədər yaş dövründə müşahidə edilən funksional sağlamlıq pozğunluqları əsasən valideynlərin qeyri-sağlam həyat tərzi ilə əlaqələndirilir. Bu, uşaqların məktəb təliminə uyğunlaşmasına mənfi təsir göstərir və sağlamlığının daha da pisləşməsinə səbəb olur.

V.P. Petlenkonun [3] fikrincə, insanın həyat tərzi onun konstitusiyasına uyğun olmalıdır, konstitusiya isə orqanizmin genetik potensialı, irsiyyət və ətraf mühitin məhsulu kimi başa düşülür. Konstitusiya həmişə fərdidir: insan sayı qədər həyat tərzi var. Bir insanın konstitusiyasını təyin etmək hələ də çox çətindir, lakin onu qiymətləndirmək üçün bəzi üsullar hazırlanmış və praktikada tətbiq olunmağa başlamışdır.

Müasir insanın sağlamlıq haqqında, eləcə də onu qorumaq və yaxşılaşdırmaq üçün nə etməli olduğu haqqında çox şey bilməsi məqsədəmüvafiqdir.

Sokratın: "Sağlamlıq hər şey deyil, sağlamlıqsız hər şey heçdir" fikrini bir kəşf hesab etsək, bu hikmətli sözlərin isbata ehtiyacı yoxdur.

Sağlamlığın təmin edilməsi adətən üç amilin – fiziki, əqli və sosial rifahın müxtəlif kombinasiyası şəklində həyata keçirilir və bunların hamısı birlikdə "sağlamlıq üçbucağı" adlanır. Fiziki sağlamlıq insanların sağlam bədənə malik olması deməkdir. Fiziki sağlamlığı qorumaq üçün müntəzəm fiziki fəaliyyətlə məşğul olmaq (idman), düzgün qidalanmaq və normal istirahət etmək lazımdır. Əgər insanlar normal qidalanarsa, həyat səviyyələri artarsa və keyfiyyətli səhiyyə xidməti ilə təmin olunarlarsa onların bədənləri fiziki cəhətdən sağlam olacaqdır.

Valeologiyada öyrənilmə mövzusu praktik olaraq sağlam insandır. Valeologiyanın vəzifələri – insanın aid olduğu risk qrupunun təyin olunması, insana onun üçün zəruri olan göstəriciləri təyin etməsinin, onlara nəzarət etməsinin, bu göstəricilərə əsaslanaraq öz həyat tərzini düzəltməsinin öyrədilməsidir.

İzrail Brexman [4] son 15 il ərzində sağlam insanın sağlamlıq problemləri üzərində işləyib. O, "valeologyanın" banisi olub (latın dilində valeo-sağlam, sağ-salamat olmaq deməkdir). Tanınmış alim valeologiyanın pedaqogika, profilaktik və müalicə səhiyyəsi, fiziki mədəniyyət və idmanla qarşılıqlı əlaqələrinin yollarını formalaşdırıb sağlamlaşdırıcı proqramların bütün səviyyələrdə həyata keçirilməsi zamanı yeni inkişaf istiqamətlərini müəyyənləşdirib.

Uzun illər ərzində məktəbəqədər müəssisələrdə təhsil və tərbiyənin məqsədi hərtərəfli inkişaf etmiş şəxsiyyətin formalaşdırılması kimi göstərilir, işin əslinə gəldikdə isə şəxsiyyətin keyfiyyəti, onun mədəniyyət və əxlaq səviyyəsi ikinci plana keçir. Təhsil və tərbiyədə prioritet istiqamət biliklərdir. Lakin, məlumdur ki, biliklər özlüyündə heç də uşağın ruhi və mənəvi keyfiyyətlərinə bir zəmanət deyildir. Çox vaxt onlar uşağın əxlaqi, psixi və fiziki sağlamlığının ziddinə gedirlər. Bu, biliklər əsas məqsədə çevrildikdə baş verir.

Aydındır ki, uşağa bilik lazımdır, lakin məqsəd kimi deyil, uşağın şəxsiyyətinin inkişaf etdirilməsi üçün bir vasitə, onun həyatda yaşaması üçün, ona vacib olan məsələləri həll edə bilməsi üçün lazımdır. Tərbiyə və təhsilin məqsədi uşağın özü, onun fiziki, ruhi və mənəvi inkişafı olmalıdır.

Tərbiyə və təhsilin neqativ nəticələrinin qarşısını uşaqda özünə, öz bədəninə, qəlbinə və ağlına məsuliyyətli yanaşmasını formalaşdıraraq almaq olar.

Valeologiya sağlamlığın yaradılması mövqeyindən bütün təlim-tərbiyə prosesini yenidən qiymətləndirməyə və bu problemləri həll etməyə kömək ola bilər. Bunun üçün tərbiyəçi-müəllimlərin sağlamlığın qorunub saxlanılması və möhkəmləndirilməsi proseslərinin idarə olunma texnologiyalarına yiyələnməsi məqsədəuyğundur.

Valeologiya sağlamlıq haqqında, onun təmin edilməsi, formalaşdırılması və qorunub saxlanılması haqqında elmdir. Ümumiyyətlə, valeologiyanın məqsədi sağlamlığı formalaşdıran qanunauyğunluqları öyrənmək, sağlam həyat tərzini modelləşdirməkdir.

Məktəbəqədər yaşlı uşaqların valeoloji təhsili və tərbiyəsi aşağıdakı prinsiplərə əsaslanır:

1. Sistemli yanaşma – obyektin (problemin, hadisənin, prosesin) tədqiq edilmiş nəticələrinə ən əhəmiyyətli təsir göstərən elementlərin, daxili və xarici əlaqələrin müəyyən edildiyi bir sistem kimi öyrənilməsinə yanaşmadır. İstənilən sistemli yanaşma beş əsas prinsiplə müəyyən edilir: bütövlük, iyerarxiya, strukturlaşma, çoxluq və ardıcıllıq. Sonuncu prinsip öz mahiyyətinə görə bütün digər prinsipləri birləşdirir.

2. “Zərər vermək olmaz”. Bu prinsip valeoloji iş prosesində yalnız təhlükəsiz müalicə üsullarından istifadəni nəzərdə tutur.

3. Humanizm prinsipi. Valeoloji təhsil uşağın şəxsiyyətinin daxili dəyərini tanıyır. Təhsi-lin əxlaqi qaydaları ümumbəşəri dəyərlərdir.

4. Altruizm prinsipi. Valeoloji mədəniyyətin mənimsənilmiş dəyərlərini bölüşmək ehtiyacını təmin edir: “Özün öyrəndinsə başqa bir dostuna da öyrət”.

4. Ölçü prinsipi. Sağlamlıq normada yaxşıdır.

Məktəbəqədər yaşlı uşaqların valeoloji mədəniyyətinin tərbiyəsində müəyyən olunmuş vəzifələrə nəzər salaq:

1. Qruplarda uşaqların müstəqil fəaliyyətini təmin etmək məqsədilə müxtəlif inkişaf mərkəzlərinin, inkişafetdirici mühitin yaradılması.

2. Məktəbəqədər təhsil müəssisələrində uşaqların valeoloji biliklərini artırmağa, onların idrak fəaliyyətini və müstəqilliyini inkişaf etdirməyə yönəlmiş məşğələlər hazırlayıb həyata keçirmək.

3. Valideynlərin valeoloji təhsilini artırmaq məqsədilə müxtəlif əlaqə formalarından istifadə etmək.

Ailədə sağlamlığın möhkəmləndirilməsi üçün əlverişli şəraitin yaradılması məqsədilə valideynlərlə iş (sağlam həyat tərzinin geniş təbliği, valideynlərin valeoloji mədəniyyətinin tərbiyəsi, sağlamlıq kodeksinin tərtib edilməsi, işgüzar oyunlar, testlər, sorğular və s.) aparılmalıdır.

Valideynlərin valeoloji təhsilinin vəzifələrinə aşağıdakılar daxildir:

• uşağın fiziki, mənəvi və psixomotor inkişafının diaqnostikasının nəticələrinin valideynlərlə birlikdə nəzərdən keçirilməsi;

• uşaqlarla istirahət tədbirlərinin planlaşdırılmasında valideynlərin fəal iştirakı;

• qrupda bədən tərbiyəsi və sağlamlaşdırıcı işlərin təşkil olunması ilə ailəni tanış etmək;

• valideynlərə sağlamlığın qorunması və möhkəmləndirilməsi üçün müxtəlif iş üsullarını öyrətmək (nəfəs alma məşqləri, özünü masaj və s.).

Valeologiya üzrə məşğələlərin aparılması metodikasının hazırlanması məqsədəuyğundur. Valeoloji məşğələlərin mövzusu hər bir yaş qrupu üçün təqvim-tematik planla müəyyən edilir:

• birinci kiçik qrup üçün mövzulardan ibarət kartoteka;

• ikinci kiçik qrup üçün mövzuların kartotekası;

• orta qrup üçün mövzuların kartotekası;

• böyük qrup üçün mövzuların kartotekası;

• hazırlıq qrupu üçün mövzuların kartotekası.

Valeoloji məşğələlər məktəbəqədər təhsil müəssisələrində müxtəlif yaş qruplarında eyni metodika əsasında aparılır. Yəni onların strukturu və vaxtı eynidir.

Uşaqların sağlam, hərtərəfli inkişafı üçün tərbiyəçi-müəllimin uşaqların valeoloji təhsilini həyata keçirməyə hazır olması, böyüklər və

uşaq arasında şəxsiyyətyönlü qarşılıqlı əməkdaşlığın yaradılması, valideynlərin uşaqların təlim-tərbiyəsi prosesində fəal iştirakının təmin olunması əsas məsələlərdəndir.

Sağlam və kamil insan yetişdirmək cəmiyyətin ən mühüm vəzifəsidir. Uşaq bağçasında valeoloji təhsili həyata keçirmək üçün yaxşı hazırlanmış məşğələlər gələcək uşağın sağlamlığını qorumağa, həyati təhlükəsi olan vəziyyətlərə düşməməyə kömək edəcəkdir. Valeoloji təhsilin və tərbiyənin məqsədi uşaqların öz bədənləri, sağlamlıqları və həyat üçün təhlükəli vəziyyətlər haqqında təsəvvürlərini genişləndirmək, onlarda şəxsi gigiyena bacarıqları, şifahi ünsiyyətə, asudə vaxt mədəniyyətinə yiyələndirməkdir.

**Problemin aktuallığı.** Hazırda tərbiyəçi-müəllimlərin qarşısında duran prioritet vəzifələrdən biri də təhsil və təlim prosesində uşaqların sağlamlığının qorunmasıdır. Sağlam həyat tərzinin formalaşması məktəbəqədər təhsil müəssisələrindən başlamalıdır. Yeni, gələcək nəslin fiziki cəhətdən möhkəm, sağlam olması üçün ölkəmizdə məktəbəqədər təhsil müəssisələri lazımi optimal şərait, yəni sağlamlaşdırıcı gigiyenik tədbirlərlə təmin olunmalıdır.

**Problemin elmi yeniliyi**. Təlim prosesinin optimallaşdırılması prosesində valeoloji monitorinqin keçirilməsi uşaqların psixofizioloji gərginliyi və əsəbilik səviyyəsinin aşağı endirilməsi ilə nəticələnir. Valeoloji maarifləndirmə, sağlam həyat tərzinin təbliği və fiziki mədəniyyətlə birlikdə bu cür işin aparılması uşaqların sağlamlığında müsbət nəticələr əldə etməyə imkan verir.

**Problemin praktik əhəmiyyəti və tətbiqi.** Məqalədən məktəbəqədər təhsil müəssisələrində çalışan mütəxəssislər faydalana bilər.

**Ədəbiyyat:**


1. Məktəbəqədər təhsilin dövlət standartı və proqramı. Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 16 iyul tarixli 137 nömrəli qərarı // Kurikulum, -2010, № 4
2. Baxışova, Ş.A. Məktəbəqədər təhsil: konseptual problemlər: Monoqrafiya / Ş.A. Baxışova. -Bakı: Elm və təhsil, -2015.
3. 3. Петленко, В.П. Основы валеологии. Книга третья. / В.П. Петленко -1999.- 433 с.
4. Брехман, И.И. Валеология – наука о здоровье. / И.И. Брехман. -М., -1990.
5. Татарникова, Л.Г. Педагогическая валеология. / Л.Г. Татарникова. -М., -1992.
6. https://un.mfa.gov.az ›

7. https://meteo.az ›


**E-mail:**sharafat_baxishova1960@mail.ru

**Rəyçilər:** *ped.ü.elm.dok., prof.* **M İ. İlyasov**
*ped.ü.elm.dok., prof.* **Ş.Q. Əliyeva**
**Redaksiyaya daxil olub:** 08.02.2023

# FİZİKİ MƏDƏNİYYƏT MƏSƏLƏLƏRİ
# ВОПРОСЫ ФИЗИЧЕСКОЙ КУЛЬТУРЫ
# ISSUES OF PHYSICAL CULTURE

UOT 372.879.6

**Hicran İbrahim oğlu Şərifov**
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Bədən Tərbiyəsi və İdman Akademiyası*
*https://orchid.org/0000-0002-9325-5111*

## XÜSUSİ TƏYİNATLI ALİ TƏHSİL MÜƏSSİSƏLƏRİ KURSANTLARINDA FİZİKİ HAZIRLIQ ÜZRƏ SƏRİŞTƏLƏRİN FORMALAŞDIRILMASI

**Хиджран Ибрагим оглы Шарифов**
*доктор философии по педагогике*
*Азербайджанская Государственная Академия Физической Культуры и Спорта*

## ФОРМИРОВАНИЕ ФИЗИЧЕСКИХ КОМПЕТЕНЦИЙ У КУРСАНТОВ СПЕЦИАЛЬНО НАЗНАЧЕННЫХ ВЫСШИХ УЧЕБНЫХ ЗАВЕДЕНИЙ

**Hijran Ibrahim Sharifov**
*doctor of philosophy in pedagogy*
*Azerbaijan State Physical Culture and Sports Academy*

## FORMATION OF PHYSICAL FITNESS COMPETENCIES IN SPECIALLY APPOINTED HIGHER EDUCATION INSTITUTIONS STUDENTS

**Xülasə.** Məqalədə xüsusi təyinatlı ali təhsil müəssisələrində kursantlarla və fiziki hazırlıq fənni üzrə aparılan eksperimental işin nəticələrindən danışılır. Beynəlxalq tələblər əsas götürülərək kursantlara aşılanan səriştələr müəyyənləşdirilir. Bu zaman "öyrənməyi öyrənin, etməyi öyrənin, birlikdə yaşamağı öyrənin, yaşamağı öyrənin" tələbləri fiziki hazırlıq və xüsusi fiziki hazırlığın məzmununa gətirilir. Müşahidə, müsahibə və sorğu metodundan istifadə olunaraq kursantların fiziki hazırlığı və xüsusi fiziki hazırlıq üzrə ehtiyaclar öyrənilir. Fənn üzrə xüsusi məzmun hazırlanır və eksperimental qruplarda sınaqdan keçirilir. Alınan nəticə keyfiyyətin yüksəldiyini və məzmunun səmərəliyini bir daha təsdiq etdi.
***Açar sözlər:*** *xüsusi təyinatlı, kursant, fiziki hazırlıq, xüsusi fiziki hazırlıq nəticənin qiymətləndirilməsi*

**Резюме.** В статье рассказывается о результатах экспериментальной работы, проведенной с курсантами специальных вузов по предмету физической культуры. Компетенции, присваиваемые курсантам, определяются на основе международных требований. В это время требования «научиться учиться, научиться делать, научиться жить вместе, научиться жить» включаются в содержание физической подготовки и специальной физической подготовки. Потребности курсантов в физической подготовленности и специальной физической подготовленности изучаются методами наблюдения, опроса и интервью. Специальное содержание разрабатывается и тестируется в экспериментальных группах. Полученный результат еще раз подтверждает, повышение качества и эффективность содержания.
***Ключевые слова:*** *специальное назначение, курсант, физическая подготовка, оценивание результатов специальной физической подготовки*

**Summary.** The article talks about the results of the experimental work conducted with cadets in special higher education institutions and on the subject of physical training. Competencies imparted to cadets

are determined based on international requirements. At this time, the demands of "learn to learn, learn to do, learn to live together, learn to live" are included in the content of physical training and special physical training. The needs of cadets in terms of physical fitness and special physical fitness are studied using observation, interview and survey methods. Subject-specific content is developed and tested in experimental groups. The result confirmed once again that the quality has increased and the effectiveness of the content.

***Key words:*** *special purpose, cadet, physical training, special physical training result evaluation*

"Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"də təhsil sahəsində dövlət siyasətinin strateji məqsədləri vurğulanır və növbəti onillikdə ölkənin sosial-iqtisadi inkişafına dair aşağıdakı beş Milli Prioritetin reallaşdırılmaması irəli sürülür: "1) dayanıqlı artan rəqabətqabiliyyətli iqtisadiyyat; 2) dinamik, inklüziv və sosial ədalətə əsaslanan cəmiyyət; 3) rəqabətli insan kapitalı və müasir innovasiyalar məkanı; 4) işğaldan azad olunmuş ərazilərə böyük qayıdış; 5) təmiz ətraf mühit və "yaşıl artım" ölkəsi".

Bu verilənlər əsasında deyə bilərik ki, əmək bazarının tələblərinə cavab verən keyfiyyətli təhsilin əlçatanlığının artırılması, iqtisadiyyatın innovativ inkişafının təmin olunması, cəmiyyətin və hər bir vətəndaşın ehtiyaclarının nəzərə alınması aktuallıq kəsb edir (1).

Avropa Mədəni Əməkdaşlıq Şurası (SCEC) qloballaşmanın Avropa tendensiyalarını ümumi kontekstdə əsas götürərək, təhsilin məqsəd və vəzifələrinə uyğun olan səriştələr müəyyən etmişdir. 21-ci əsr üçün Təhsil üzrə Beynəlxalq Komissiyanın "Təhsil: gizli xəzinə" adlı hesabatında Jak Delor əsas qlobal səriştələrə aşağıdakıları aid etdi: "öyrənməyi öyrənin, etməyi öyrənin, birlikdə yaşamağı öyrənin, yaşamağı öyrənin".

Yeni təhsil paradiqmasına keçid təhsilin məqsəd və vəzifələrini yenidən nəzərdən keçirilməsini, onlara uyğun gələn məzmunun müasirləşdirilməsini, prosesin texnoloji təminatının optimallaşdırılmasını nəzərdə tutur. Eyni zamanda, məzmunun seçilməsini və sistemləşdirilməsinin yeni prinsipləri haqqında danışmalıyıq ki, bu da tədris prosesinin ən vacib, fundamental, daimi, eyni zamanda, ən qabaqcıl və perspektivli biliklərin öyrənilməsinə yönəldilməsini nəzərdə tutur.

"Təhsil haqqında" Azərbaycan Respublikasının Qanunu (2), "Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər"(1) və xüsusən də "Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası" (4) təhsilalanın inkişafı üçün şəraitin yaradılmasına diqqət yetirməyi irəli sürür. Təhsil mühitində öz fərdi inkişafını müəyyən etmək və həyata keçirmək hazırlığını və bacarığını formalaşdırmağı bacaran insanın tərbiyəsi önə çəkilir. Sivi-lizasiyanın inkişafı ilə fiziki tərbiyənin cəmiyyətin həyatında rolu əhəmiyyətli dərəcədə artır. Bu, ilk növbədə, müasir sivilizasiyanın mənfi nəticələrinin - fiziki hərəkətsizlik, ətraf mühitin deqradasiyası, siqaret çəkmə, alkoqollu içki qəbul etmə, narkotik vasitələrdən və psixotrop maddələrdən istifadə və s. ilə özünü göstərir. Bundan əlavə, həyatın getdikcə artan ritmi insanlardan yaxşı psixofiziki vəziyyətə malik olmağı tələb edir.

Bununla yanaşı, xüsusi təyinatlı ali təhsil müəssisələrində mövcud vəziyyətin təhlili və ümumiləşdirilməsi göstərir ki, bu gün fiziki tərbiyə sistemində əsasən insanın bədən təbiətinin inkişafına yönəlmiş meyllər qorunub saxlanılır. Bununla əlaqədar olaraq kursantların fiziki hazırlığı və idman sahəsində kəskin problemləri var. Qarşıya qoyulan vəzifələrə uyğun olaraq onların fiziki vəziyyətinin öyrənilməsi mühüm əhəmiyyət kəsb edir.

Xüsusi təyinatlı ali təhsil müəssisələri kursantlarının fiziki hazırlıq sahəsində bacarıqlara malik olması gələcəkdə istehsalatda, elmdə və mədəniyyətdə rəqabətə davamlı mütəxəssislərin ümumi mədəniyyətinin bir növü kimi bədən tərbiyəsinin formalaşması üçün əsas olmalıdır. "2017-2020-ci illər üçün Azərbaycan Respublikasının Vahid İdman Təsnifatı"nda (8) həll edilməli olan əsas vəzifələr göstərilmişdir. Bu məqsədə nail olmaq üçün kursantların müxtəlif kateqoriya və qruplarının fiziki hazırlıq sistemi müasirləşdirilməlidir. Bunun üçün bir sıra tədbirlər həyata keçirdik, məsələn:

- sağlamlıq vəziyyətinin, fiziki inkişafın və fiziki hazırlığın monitorinqinin xüsusi təyinatlı ali təhsil müəssisələri sisteminə daxil edilməsi;

- xüsusi təyinatlı ali təhsil müəssisələrində fiziki hazırlıq dərslərinin (məşğələlərinin) keçirilməsinin səmərəliliyini artırmaq üçün tövsiyələrin verilməsi;

- xüsusi təyinatlı ali təhsil müəssisələri üçün fiziki hazırlıq proqramlarının hazırlanması və həyata keçirilməsi;

- dövlət təhsil standartına (3) uyğun olaraq kursantların fərdi qabiliyyətləri və sağlamlıq vəziyyəti nəzərə alınmaqla təhsil səviyyələri üzrə nümunəvi fiziki hazırlıq kurikulumlarının hazırlanması və bu proqramların səmərəliliyinin qiymətləndirilməsi.

Xüsusi təyinatlı ali təhsil müəssisələrində fiziki hazırlıq sisteminin modernləşdirilməsinin gözlənilən nəticələri:

-fiziki hazırlıqdan yeni dövlət təhsil standartlarının hazırlanması;

-xüsusi təyinatlı ali təhsil müəssisəsi kursantlarının fiziki hazırlıq və xüsusi fiziki hazırlığa sistemli cəlb edilməsi;

-səmərəli texnologiyaların işlənib hazırlanması və tətbiqi, fiziki hazırlıq və xüsusi fiziki hazırlıq sahəsində elmi-metodik, tibbi-bioloji, psixoloji və pedaqoji təminat sisteminin müasirləşdirilməsi.

Beləliklə, Azərbaycan Respublikası ali təhsil sistemində aparılan islahatlar fiziki hazırlıq fənninin təşkilinə yeni tələblər və yeni yanaşmalar irəli sürdü. Fiziki hazırlıq və xüsusi fiziki hazırlıq müasir təhsil alan kursantların uğur qazanmasına, keyfiyyətli nəticə göstərməsinə və peşə fəaliyyətlərində yüksək səmərəliliyə nail olmağa imkan verən əsas və xüsusi kompetensiyaların inkişafına yönəlib.

*Problemin tədqiqi vəziyyəti.* Ali təhsil müəssisələrində fiziki hazırlıq fənninin tədrisi problemləri respublika və xarici ölkə alimləri tərəfindən müxtəlif aspektdən araşdırılmışdır:

-universitetlərdə təhsil mühitinin öyrənilməsi (E.N. Zaitseva, E.V. Lobanova, S.L. Lobaçev və s.);

-səriştə əsaslı yanaşma çərçivəsində mütəxəssislərin peşəkar hazırlığı (V.A. Bolotov, E.F. Zeer, A.M. Novikov, C. Raven və b.);

- texnoloji yanaşma (T.A. İlina, M.V. Klarina, M.M. Levina);

- tədrisin idarə edilməsində modul təlim texnologiyası vasitəsilə ən effektiv şəkildə həyata keçirilməsi (M.İ.Çoşanov, P.A. Yutsyaviçene və s.);

- modul təlimdən istifadə məsələləri (T.G. Kovalenko, J.K. Xolodov və s.);

- səriştə əsaslı yanaşma (V.I. Baidenko, V.I. Zvonnikov, M.B. Çelişkova);

-informasiya-kommunikasiya texnologiyalarından istifadə etməklə təlimin keyfiyyətinin idarə edilməsi (P.K. Petrov, D.M. Polev, I.V. Robert);

-təlimin keyfiyyətinin qiymətləndirilməsi (A.İ. Subetto, İ.S. Sırvaçova);

-kursantların fiziki hazırlıq üzrə təhsil nailiyyətlərinin monitorinqi və qiymətləndirilməsi üçün reytinq sistemi, onun tədris prosesində tətbiqi xüsusiyyətləri (V.N. Besedina, G.L. Drandrova, B.X. Landy və b.).

Pedaqoji-psixoloji ədəbiyyatın təhlili və ümumiləşdirilməsi onu deməyə əsas verir ki, fiziki hazırlıq sahəsində tələbələrin səriştələrinin formalaşması problemi indiyədək müstəqil elmi tədqiqatların predmeti olmamış, digər tərəfdən, onun elmi həlli üçün müəyyən nəzəri əsaslar yaradılmamışdır.

Yuxarıdakıları ümumiləşdirərək belə bir nəticəyə gələ bilərik ki, tədqiqatımızın aktuallığı aşağıdakı ziddiyyətləri həll etmək ehtiyacı ilə bağlıdır:

***sosial səviyyədə:***

-sağlam həyat tərzinə və peşə fəaliyyətinə psixofiziki hazırlığı təmin edən proqramda və normativ sənədlərdə bəyan edilmiş göstəricilərin real səviyyəsi arasında (sağlamlıq, fiziki inkişaf, fiziki hazırlıq, fiziki məşqlərə maraq, xüsusi fiziki hazırlıq sahəsində qeyri-qənaətbəxş bilik səviyyəsi) fərqlər;

-cəmiyyətin və dövlətin fiziki hazırlıq sahəsində yüksək səviyyəli səriştəli gənc, rəqabətqabiliyyətli mütəxəssislərə olan ehtiyacı, bədən tərbiyəsinə öz müqəddəratını təyin etmək istəyi və hazırlığı ilə təzahür edən universitetlərin əksəriyyəti arasında onun formalaşmasının aşağı səviyyəsi;

***təşkilati və metodoloji səviyyədə:***

- "Ali təhsilin dövlət standartları", "2017-2020-ci illər üçün Azərbaycan Respublikasının Vahid İdman Təsnifatı"nda kursantlarda fiziki hazırlıq sahəsində təlimin təşkili üçün ənənəvi vasitələrin, metodların effektliliyi arasında – fiziki hazırlıq, pedaqoji nəzarət və onun nəticələrinin qiymətləndirilməsi sahəsində sosial səviyyədə həll etmək;

***elmi -nəzəri səviyyədə:***

- xüsusi təyinatlı ali təhsil müəssisələrində tədris prosesində səriştəyə əsaslanan yanaşmanın həyata keçirilməsi zərurəti ilə kursantların

fiziki hazırlıqlarının bu istiqamətdə nisbi cəhətdən inkişaf etməsi;

- xüsusi təyinatlı ali təhsil müəssisələrində fiziki hazırlıq fənn səriştələrinin mahiyyətinin və məzmununun əsaslandırılması;
- səriştələrin formalaşmasına yönəldilmiş fiziki hazırlıq fənninin məzmununun və strukturunun seçilməsinin məqsədəuyğunluğu;
- fiziki hazırlıq fənni üzrə səriştələrin qiymətləndirmə standartlarının hazırlanması;
- xüsusi təyinatlı ali təhsil müəssisələri tələbələrinin fiziki hazırlığın texnoloji təminatı, onların köməyi ilə öyrənilən təlim elementlərinə, fənn səriştələrinə adekvat olan tədris prosesinin təşkilinin vasitələri, metodları və formaları sistemi kimi;
- fiziki hazırlıq sahəsində səriştələrin formalaşma dərəcəsinin meyar və göstəricilərinin işlənib hazırlanması;
- fiziki hazırlıq sahəsində tələbələrin səriştələrinin formalaşma dərəcəsinin göstəricilərinin ölçülməsi və qiymətləndirilməsi sistemləri.

*Problemə metodoloji yanaşma*. Xüsusi təyinatlı ali təhsil müəssisələri sistemində fiziki hazırlıq fənni də daxil olmaqla bütün fənlərə təsir edən səriştə əsaslı yanaşma fəal şəkildə tətbiq olunur. Nəzəri cəhətdən əsaslandırılmasına baxmayaraq, onun effektliliyi fiziki hazırlıq və xüsusi fiziki hazırlıq təcrübəsində sübut olunmamışdır ki, bu da əsas ziddiyyətdir. Müvafiq olaraq fiziki hazırlıq fənni üzrə kursantların tədrisi prosesində bu yanaşmanın səmərəliliyinin yoxlanılması, sistem-struktur və komponent əlaqələrinin müəyyən edilməsi mühüm əhəmiyyət kəsb edir.

*Fiziki hazırlıq fənni üzrə kursantlarda formalaşdırılan səriştələr*

Təhsialanlarda səriştənin formalaşdırılması problemi mürəkkəb obyektlərin elmi və metodoloji məlumatlarından - sistematik yanaşmadan istifadə etmədən həll edilə bilməz. Sistemli yanaşmada ümumi münasibət və ümumi hərəkət, maddi gerçəkliyin formalaşması və onun insan şüurunda əks olunması, təlimin konkretləşdirilməsi forması kimi irəli sürülür. O, obyektlərin və hadisələrin mürəkkəb mütəşəkkil sistemlər nöqteyi-nəzərindən öyrənilməsini nəzərdə tutur. Eyni zamanda, idrakın əsas istiqamətləri, ilk növbədə, hadisələrin özləri tərəfindən qəbul edilən fərqliliyinin müəyyən edilməsi, sonra bu sistemin tərkib hissəsi kimi onların aydınlığının açıqlanması, eləcə də onun ümumiliyi kimi müəyyənliyidir.

Sistemli yanaşma təhlil və sintez üsullarının sistemləşdirilməsi mövqeyindən tətbiq edilmişdir. Bildiyimiz obyektlərin tədqiqində idrak onların inteqral sistemləri kimi və elementlər toplusu kimi sinxron şəkildə həyata keçirildi: komponentləri seçərkən biz onları verilmiş bir bütövün elementləri kimi müəyyənləşdirdik, sintez nəticəsində isə bütövlük kimi çıxış etdi.

Sistemli təhlil metodologiyasına uyğun olaraq, bu obyektlərin hər biri tərəfimizdən aşağıdakılara münasibətdə nəzərdən keçirilmişdir: 1) məqsədyönlülük (hədəf təhlili); 2) məzmun (struktur təhlili); 3) daxili və xarici fəaliyyət nöqteyi-nəzərindən (funksional təhlil); 4) yaranması və formalaşması (genetik analiz). İnsanın başa düşdüyü məqsəd, qanun onun hərəkətlərinin üslubunu müəyyən edir. Məqsədlər sistemi formalaşdıran tədbir kimi irəli sürülür, çünki onların sayəsində dəstin giriş komponentləri əlavə olunur. Nəticədə sistemin bütövlükdə ümumi mühitdən ayrılması üçün əsas tədbir onun nəzərdə tutulan məqsəd mövqeyindən təhlilidir (13).

Fəaliyyət subyektinin ayrılmaz xarakteristikası kimi fiziki hazırlıq sahəsində səlahiyyətlərin formalaşdırılması məqsədləri prosesin xüsusiyyətlərini, keyfiyyət və kəmiyyət göstəricilərinin nəticələrini və fiziki məşqlərin nəticələrini əhatə edir. Bu məqsədin keyfiyyət orijinallığı bu növ səriştənin universitet məzununun peşəkar səriştəsindən ayrılması, onu nisbətən müstəqil inteqral sistem kimi nəzərə alaraq məzmun, fəaliyyət və inkişaf xüsusiyyətləri baxımından öyrənilməsinin mümkünlüyünü və zəruriliyini müəyyən edir.

Pedaqoji sistemlər sosial sistemlərlə əlaqəlidir və müəyyən xüsusiyyətlərə malik olan fərdin inkişafına pedaqoji təsirin təşkili üçün zəruri olan vasitələr, üsullar və proseslərin məcmusudur. Müəllif peşəkar təhsilin məqsədyönlü pedaqoji sistem kimi idarə edilməsi prosesi kimi öyrənməyə yanaşmanın əhəmiyyətli effektivliyini göstərir (13).

Kursantların fiziki hazırlıq sahəsində səriştələrinin formalaşdırılması gələcək mütəxəssisin peşə hazırlığı sisteminin xüsusi vəzifəsidir ki, bu da fiziki hazırlıq fənn proqramının məzmununun mənimsənilməsi prosesində həll edi-

lir. Bu pedaqoji tapşırığın keyfiyyətcə orijinallığı fiziki hazırlıq sahəsində səriştələrin formalaşmasının çoxfunksiyalı sistem kimi vurğulanması və sistemli yanaşmadan istifadə edərək öyrənilməsi zərurətini müəyyən edir. Tədris prosesi idarə olunan pedaqoji sistem kimi bölünmə kimi bir xüsusiyyətə malikdir. Bu xassə onunla səciyyələnir ki, sistemin komponentləri, eləcə də bilavasitə pedaqoji nəzarət və qiymətləndirmə özləri sistemli şəkildə təşkil olunur.

Fiziki hazırlıq və xüsusi fiziki hazırlıq sahəsində səriştələrin formalaşması prosesinin pedaqoji nəzarəti və qiymətləndirilməsi həll ediləcək vəzifələr baxımından təlim prosesinin nisbətən müstəqil, keyfiyyətcə fərqli hissəsini təmsil edir; məzmun komponentlərinin (struktur və funksional elementlərin) qarşılıqlı təsiri vasitəsilə bütövlükdə funksiya və forma bura aid edilir. Ona görə də bu proses bizim tərəfimizdən sistemli formalaşma kimi qəbul edilir və struktur və funksional komponentlərlə xarakterizə olunur.

Beləliklə, hədəf təhlili tədqiqatın mövzusunu - sistemli şəkildə təşkil edilmiş üç obyekti ayırmağa imkan verdi: fiziki hazırlıq sahəsində səriştə, bu növ səriştənin formalaşması, pedaqoji nəzarət və səriştənin formalaşma keyfiyyətinin qiymətləndirilməsi.

Hədəf bu sistemin strukturunu və onun təşkilini üzə çıxaran komponentlərin və onların əlaqəsinin nəzərə alınmasını nəzərdə tutur. Tədqiqat zamanı obyekt öz mürəkkəbliyinə görə çox strukturlu, çoxsəviyyəli birlik kimi çıxış edir. Öz növbəsində, sistemin müxtəlif struktur elementlərinin işləməsi zamanı özünü göstərən özünəməxsus inteqral xassələrə malik olan inteqral məcmu struktur yaradır.

Dünyada dəyişən siyasi və iqtisadi şərait müəyyən etdi ki, son vaxtlar Azərbaycan Respublikasının Elm və Təhsil Nazirliyinin tələblərinə uyğun keyfiyyətin idarə edilməsinin inkişafı, tətbiqi nəzərə çarpacaq dərəcədə intensivləşmişdir. Təhsilin keyfiyyətinin idarəedilməsi sistemi gələcək mütəxəssislərin hazırlanmasının keyfiyyətinin və təhsil xidmətlərinin keyfiyyətinin müəyyən edilməsi tələblərinə uyğun olaraq sosial ehtiyaclara cavab verən səriştəli insan tərbiyə etməliyik.

Təhsilin keyfiyyətinin qiymətləndirilməsi (6) sisteminin qurulması mühüm əhəmiyyət kəsb edir. Kursantların təhsil uğurunun keyfiyyətini qiymətləndirərkən birinci yeri əldə edilmiş biliklərin miqdarı və ya nümunələr üzrə təkrarlanması alqoritmi deyil, əsas səriştələr, təhsil və peşə problemlərinin həllinə yaradıcı yanaşma bacarığı tutur.

Kursantların şəxsi keyfiyyətlərini nümayiş etdirmək problemi tədris prosesinin keyfiyyətini izləmək və qiymətləndirmək üçün pedaqoji texnologiyalarda ən çətin problemlərdən biridir. Üstəlik, təlim prosesinin bütün mərhələlərində seçilmiş şəxsiyyətin strukturlaşdırılması konsepsiyasını tətbiq etmək mümkündür, keyfiyyət isə diaqnostik konsepsiya kimi şərh edilməlidir.

Universitet məzunlarının hazırlığının keyfiyyətini müəyyən edərkən bu təlimin təhsil və peşə komponentlərini qiymətləndirmək tövsiyə olunur. Universitetlər kursant hazırlığının tədris hissəsinin qiymətləndirilməsində böyük təcrübə toplayıblar ki, bu da peşəkar komponentin qiymətləndirilməsi üçün standart sistemlərin yaradılması haqqında demək olmaz. Bu problemin öyrənilmə dərəcəsini təhlil edərkən görürük ki, çoxlu sayda elmi-pedaqoji əsərlərdə universitetin təhsil sisteminin keyfiyyətinin qiymətləndirilməsi mexanizmlərinin və tədris prosesinin ayrı-ayrı aspektlərinin işlənib hazırlanması məsələlərinə diqqət yetirilmişdir.

Təhsilin keyfiyyətinin qiymətləndirilməsinə yeni yanaşmalar işlənib hazırlanarkən, ilk növbədə, təhsilin keyfiyyətinin qiymətləndirilməsi prosesinin ən mühüm təşkilati-pedaqoji şərtlərini nəzərə almaq lazımdır. Belə ki, T.A. Korçak öz tədqiqatında əsas təşkilati və pedaqoji şərtləri sadalayır. Ali məktəblərdə təhsilin keyfiyyətinin uğurlu qiymətləndirilməsi: təhsil mühitinin informasiyalaşdırılması və kompüterləşdirilməsi; təhsildə davamlılıq sisteminin qurulması; pedaqoji monitorinq metodlarından istifadə; abituriyentlərin universitetdə hazırlıq səviyyəsinə nəzarət; ali təhsil sisteminin formalaşmasının milli xüsusiyyətlərini nəzərə alaraq təhsilin keyfiyyətinin hərtərəfli (çoxsaylı) qiymətləndirilməsi sisteminin həyata keçirilməsi [13, s.73]

Təhsilin keyfiyyətinin qəbul edilmiş innovativ şərhi ilə müqayisə oluna bilən proseslərdə və təlim nəticələrində müsbət dəyişikliklərin etibarlı və əsaslı qiymətləndirilməsi üçün pedaqoji ölçmə aparatının, elmi əsaslı qiymətləndirmə metodlarının işlənib hazırlanması və tətbiqi vəzifəsi ön plana gəlir [13, s. 93].

Bu gün xüsusi təyinatlı ali təhsil kursantlarının təlim keyfiyyətinin qiymətləndirilməsi sistemlərinin formalaşmasında biliklərin metodologiyası nöqteyi-nəzərindən səciyyələnən kvalimetrik yanaşma (latınca "kvali" – keyfiyyət və yunanca "metro" – ölçmək) yanaşmasından fəal şəkildə istifadə olunur, onun əsasını obyektlərin və ya proseslərin keyfiyyətinin öyrənilməsi təşkil edir. Pedaqoji təcrübədən istifadə nöqteyi-nəzərindən kvalimetrik metodları nəzərə alaraq, obyektin keyfiyyətinin ölçülməsi, təhsilin məzmununun seçilməsi, təhsil elementlərinin strukturlaşdırılması, habelə kursantların diaqnostikası texnologiyalarının işlənib hazırlanması imkanlarından danışmaq lazımdır.

*Kursantların fiziki hazırlıq sahəsində bacarıqlarının formalaşdırılması üçün fərdi inteqrativ təhsil yol xəritələrinin tərtib edilməsi texnologiyası*

Fərdi inteqrativ təhsil yol xəritəsi layihəsinin kursantlar tərəfindən praktiki şəkildə fiziki hazırlıq fənni üzrə tədris prosesində informasiya-kommunikasiya texnologiyalarından (İKT) istifadə etməklə həyata keçirilir.

Bu texnologiyaların (12) tədris prosesinə tətbiqi kursantların və müəllimlərin intellektual imkanlarının artmasına, idrak motivasiyasının yüksəlməsinə, tədris materialının daha intensiv mənimsənilməsinə, müstəqil iş üçün şəraitin yaradılmasına kömək edir.

Kursantların artan müxtəlif informasiya axınında yeri, onu qlobal internetə qoşmaq, məzmunu çevik qiymətləndirmək, nəzəri və praktiki fəaliyyət zamanı tətbiq etmək bacarığının formalaşmasını xüsusi qeyd etmək lazımdır. Kursantlarda bu bacarığı formalaşdırmaq mühüm əhəmiyyət kəsb edir, çünki onun şəxsiyyətinə bilavasitə təsir edir, müəyyən tələbatları, motivləri, münasibətləri, eləcə də qarşıya qoyulan məqsədlərə çatmaq üçün öz potensialını səfərbər etmək bacarığını formalaşdırır.

Beləliklə, kursantların informasiya-kommunikasiya texnologiyalarından istifadə etməklə fiziki hazırlıq fənn proqramını mənimsəmə prosesi tərəfimizdən didaktik və təşkilati səviyyələrdən ibarət pedaqoji sistem kimi qəbul edilir.

Hər bir pedaqoji sistemin əslində sosial sifarişi müəyyən edən sistem yaradan amili kadr hazırlığının məqsədi, peşə hazırlığı sahələrində sosial sifarişin pedaqoji əsasını bizim tərəfimizdən tərtib etdiyimiz əlavə səlahiyyətlər (kvalifikasiya xarakteristikaları) təşkil edir. Bu mütəxəssisin hazırlanmasının təhsil məqsədləri fənn səviyyəsində, yəni onun strateji oriyentasiyasında cəmlənir.

Ali təhsilin dövlət standartının tələblərindən irəli gələn fiziki hazırlıq sahəsində xüsusi təyinatlı ali təhsil müəssisələri kursantlarının hazırlanması məqsədi onların fiziki hazırlıq üsullarından müstəqil, metodik cəhətdən düzgün istifadə vasitələrinə yiyələnmələridir. Təhsil və sağlamlığın möhkəmləndirilməsi, peşə fəaliyyətini təmin etmək üçün lazımi fiziki hazırlıq səviyyəsinə çatmağa hazır olmalıdırlar.

Səriştəli bir insanın formalaşdırılması kursantların inkişaf məqsədlərini, müasir təhsil paradiqmasını, fiziki hazırlıq sahəsində təhsil sisteminin informasiyalaşdırılmasını birləşdirən inteqrativ xarakter daşıyır. Kursantların fiziki hazırlıq məqsədinin dəyişdirilməsi didaktik sistemin tərkib hissələrinin məzmununun dəyişməsinə səbəb olur.

Xüsusi təyinatlı ali təhsil müəssisələri kursantlarında fiziki hazırlıq və xüsusi fiziki hazırlıq üzrə səriştələrin formalaşdırılması yeni məzmunun tətbiqini nəzərdə tutur. Bunun üçün kvalimetro-modul seçim və strukturlaşdırma texnologiyası səriştə əsaslı yanaşması nöqteyi-nəzərindən fiziki hazırlıq sahəsində tədrisin xarakterik xüsusiyyətlərini ayırmağa imkan verir. Fiziki hazırlıq üzrə tədris prosesinin eksperimental təşkilində vacib olan distant təhsil elementlərinin (bundan sonra DT) istifadəsidir ki, bu da bizə fiziki hazırlıq sahəsində xüsusi təyinatlı ali təhsil müəssisələrinin tədrisi sistemini təkmilləşdirməyə imkan verdi. Bu şəkildə qurulmuş fiziki hazırlıq fənni üzrə təhsil sistemi İKT alətlərinin üstünlük təşkil etməsi nəzərə alınmaqla onu fərdiləşdirməyə imkan yaratmışdır. Xüsusi təyinatlı ali təhsil müəssisələri kursantlarına fiziki hazırlıq fənninin tədrisi üzrə fərdi tədris yol xəritələrinin layihələrinin modelləşdirilməsi prosesinin elmi-metodiki təminatı yaradılmışdır. İKT-dən istifadə edərək nəzəri və metodik-praktik modulları öyrənərkən həm kursantlar, həm də müəllimlər üçün interaktiv tərəfdaşlıq yaranır, bunun nəticəsində subyektlər arasında əks əlaqə həyata keçirilir.

Fiziki hazırlıq üzrə distant təhsilin müvəffəqiyyəti istifadə olunan texnologiyalardan,

elektron resursların imkanlarından asılıdır. Distant təhsilin yaradılması üçün təlimin bütün mərhələləri optimal alətlər dəsti ilə (həm müəllim, həm də kursant üçün) təmin edilməlidir.

*Kursantların təlim nailiyyətinin qiymətləndirilməsi*

Mövcud normativ sənədlərə əsasən, xüsusi təyinatlı ali təhsil müəssisələri kursantlarının fiziki hazırlıq sahəsində səriştələrinin formalaşma səviyyəsinin qiymətləndirilməsi ali təhsilin dövlət standartının tələbləri əsasında həyata keçirilir (7). Bacarıqlara əsaslanan yanaşmanın qəbulu bilik, bacarıq və vərdişlərin ənənəvi qiymətləndirilməsindən kifayət qədər geniş toplusunun mənimsənilmə səviyyəsinə keçidə gətirib çıxaran əldə edilmiş səriştə səviyyəsinin müəyyən edilməsinin əsas vəzifələrindən biri kimi qarşıya qoyulur. Bu şərtlərdə, mövcud və artıq adət edilmiş nəzarət standartlarının, fiziki hazırlıq testlərinin və ya cavab seçimi ilə ayrı-ayrı nəzəri suallar üzrə tapşırıqların yerinə yetirilməsi ilə məhdudlaşmaq mümkün deyil.

Pedaqoji ölçmələr nəzəriyyəsinin müasir nailiyyətləri əsasında qurulan, fiziki hazırlıq üzrə kursantların təlim nailiyyətinin çoxşaxəli və çoxstruktur xüsusiyyətlərinin formalaşma səviyyəsini qiymətləndirməyə imkan verən prinsipial olaraq yeni ölçmə və qiymətləndirmə vasitələrinə ehtiyac var. Kursantların fiziki hazırlıq sahəsində səriştələrinin formalaşması səviyyəsinin qiymətləndirilməsi üçün standartların olmaması əlavə çətinliklər yarada bilər (Xüsusi təyinatlı ali təhsil müəssisələri kursantlar sonda idmançı olmayacaqlar, lakin peşə fəaliyyətlərində bu səriştələrə ehtiyacları olacaqdır).

Birincisi, səriştələr çoxfunksiyalı və geniş mövzuludur, bunun əsasında müxtəlif qiymətləndirmə alətlərindən, çoxölçülü metodlardan istifadə etmək tələb olunur.

İkincisi, fiziki hazırlıq sahəsində səriştələrin mənimsənilməsi səviyyəsi kursantların qabiliyyət amili ilə əvvəlcədən müəyyən edilir ki, bu da fiziki hazırlıq və xüsusi fiziki hazırlıq sahəsində qiymətəndirmə prosesində ayrı-ayrı psixodiaqnostik metodlardan istifadə etmək zərurətinə gətirib çıxarır, hansıları ki, bu sahədə ölkəmizin normativ sənədlərlərində nəzərdə tutulmamışdır. Bu ehtiyac, səriştələrin qiymətləndirilməsində psixoloji dəstəyin yüksək səviyyədə inkişaf etdiyi bir çox xarici ölkələrin təcrübəsi ilə sübut olunur.

Üçüncüsü, fiziki hazırlıq və xüsusi fiziki hazırlıq üzrə səriştələrin mənimsənilməsi səviyyəsinin qiymətləndirilməsini şərh edərkən nəzərə almaq lazımdır ki, səriştələrin formalaşması bir çox amillərin törəməsidir: təlimin məzmunu, təlimin təşkili, texnologiyalardan istifadə, pedaqoji əməkdaşlıq, təlim metodları, kursantlarla tərəfdaşlıq, akademiyada monitorinq və qiymətləndirmə sisteminin keyfiyyət göstəriciləri, kursantın tədris prosesinə cəlb edilməsi vəziyyəti, akademiyanın ümumi "təhsil ab-havası", eksperimentin xarakteri və s.

Təlim nailiyyətinin qiymətləndirilməsinə müasir xarici yanaşmalar, kursantların hazırlıq səviyyəsini müəyyən edən statik qiymətləndirmələrin dinamik qiymətləndirmələrə əlavə edilməsini nəzərdə tutur. Yəni təhsil müəssisələrində təlim fəaliyyətinin monitorinqi sistemlərində toplanmalı olan hazırlıq keyfiyyətin qiymətləndirilməsində nəzərə alınır.

Dinamik yanaşmada təlim nəticəsinin qiymətləndirilməsi texnologiyası zaman amili nəzərə alınmaqla qurulur və kursantın hazırlığında bilik, bacarıqların təkmilləşdirilməsi və şəxsi keyfiyyətlərin inkişafı kimi müəyyən edilən dəyişikliklərin müəyyənləşdirilməsinə əsaslanır.

Pedaqoji qiymətləndirmə kursantların təlim keyfiyyətinin nəticələrinin etibarlılığını artırmağa imkan verir.

Müxtəlif səviyyələrdə fiziki hazırlıq fənninin məzmunu öyrədilərkən, tələbələrin təhsil uğurlarının təhlilini apararkən diqqəti təlim prosesinə yönəltmək lazımdır, lakin eyni zamanda, ali təhsilin dövlət standartında təqdim edilmiş hədəf paradiqmasından imtina etmək olmaz. Təlim prosesində təhsil proqramlarının həyata keçirilməsi mərhələsinin ikinci səviyyəsində təhsilin uğuru materialı mənimsəmək üçün tədris prosesinin təşkili səviyyəsi ilə müəyyən edilən bir çox amillərin məcmusudur. Üçüncü səviyyədə, təlim prosesinin nəticələrinin qiymətləndirilməsi təhsil uğurunun əsası sayılır.

Xüsusi təyinatlı ali təhsil müəssisələrində tədris dövrünün müddəti, kursantlarda formalaşan fənn bacarıqlarının çoxluğu, kursant ötürülən bilik və bacarıqların müxtəlifliyi təlim fəaliyyətinin mürəkkəb struktura malik olması deməkdir. Bütün bu amillər əldə edilmiş bilik, bacarıq və vərdişlərin monitorinq sisteminin qu-

rulmasının, habelə müvafiq səriştələrin formalaşdırılmasının zəruriliyini nəzərdə tutur.

Mövcud qiymətləndirmə sistemi müəyyən bir təhsil müddətinin sonunda biliyin yekun nəzarətinə əsaslanır. Amma belə nəzarət prosesə nəzarət baxımından heç nə vermir. Kursantın öyrənilməmiş bilikləri artırmaq üçün praktiki olaraq heç bir imkanı qalmır: bu halda təlim prosesini düzəltmək üçün hər hansı bir tədbir praktiki olaraq artıq təsirsizdir (o, artıq bu fənn üzrə təhsilini başa vurub).

Digər tərəfdən, təlim nəticəsinin qiymətləndirilməsinin düzgün aparılmaması həyata keçirilən təlim prosesinin korreksiyası tədbirlərini də səmərəsiz edə bilər, çünki yeni kursantlar əhəmiyyətli fərqlər meydana çıxara bilər. Buradan əldə edilmiş bilik və bacarıqların müntəzəm monitorinqinin və qiymətləndirilməsinin aparılması zəruriliyi haqqında nəticə çıxarılır. Monitorinq, nəzarət və qiymətləndirmə olmadan nəzərdə tutulmuş (təmin edilmiş kurikuluma) və müstəqil işin həqiqi vəziyyəti arasında uyğunsuzluq yaranar. Bu, xüsusilə, kursantların günahından deyil, özünütəşkilatçılığın aşağı səviyyədə olmasından irəli gələ bilər.

Beləliklə, xüsusi təyinatlı ali təhsil müəssisələrində fiziki hazırlıq fənninin tədrisində keyfiyyətə nail olmaq üçün summativ qiymətləndirmənin nəticələrinin təhlilinin aparılması və qərarvermədə nəzərə alınması mühüm əhəmiyyət kəsb edir.

**Problemin aktuallığı** post müharibə dövründə bizə fiziki cəhətdən sağlam gənclərin tərbiyə olunması hava kimi, su kimi lazımdır. II Qarabağ Müharibəsində rəşadət göstərmiş şəhidlərimizin işini davam etdirəcək xüsusi təyinatlıların formalaşdırılması bu məsələni aktuallaşdırır.

**Problemin nəzəri əhəmiyyəti** ondan ibarətdir ki, xüsusi təyinatlı ali məktəblərdə fiziki və xüsusi fiziki hazırlıq fənninin məzmununun səriştəyönlü qurulmasını zənginləşdirəcəkdir**.**

**Problemin praktik əhəmiyyəti ondan ibarətdir ki,** xüsusi təyinatlı ali təhsil müəssisələrində kursantlarda fiziki və xüsusi fiziki hazırlıq üzrə səriştələrinin formalaşdırılmasında müəllimlərə işlərini yenidən qurmaqda kömək edəcəkdir.

**Ədəbiyyat:**


1. “Azərbaycan 2030: sosial-iqtisadi inkişafa dair Milli Prioritetlər” / Azərbaycan Respublikası Prezidentinin 2021-ci il 2 fevral tarixli Sərəncamı ilə təsdiq edilmişdir.
2. "Təhsil haqqında", ”Azərbaycan Respublikasının qanunu. Bakı: Hüquq, 2009
3. “Ali təhsil pilləsinin dövlət standartı və proqramı”nın təsdiq edilməsi haqqında /Azərbaycan Respublikası Nazirlər Kabinetinin 2010-cu il 23 aprel tarixli, 75 nömrəli qərarı
4. “Azərbaycan Respublikasında təhsilin inkişafı üzrə Dövlət Strategiyası”/ Azərbaycan Respublikası Prezidentinin 2013-cü il 24 oktyabr tarixli Sərəncamı ilə təsdiq olunmuşdur.
5. Azərbaycan ordusunda fiziki hazırlıq üzrə təlimat. Bakı: Hərbi nəşriyyat, 2017, 216 s.
6. Azərbaycan Respublikası ali təhsil müəssisələri tələbələrinin bakalavr pilləsində dövlət attestasiyası haqqında Əsasnamə / Təhsil Nazirliyinin 27.01.1997-ci il tarixli, 54 nömrəli əmri.
7. “Ali təhsil müəssisələrinin bakalavriat və magistratura səviyyələrində kredit sistemi ilə tədrisin təşkili Qaydaları" / Azərbaycan Respublikasının Nazirlər Kabinetinin saylı 24 dekabr 2013-cü il tarixli qərarı.
8. “2017-2020-ci illər üçün Azərbaycan Respublikasının Vahid İdman Təsnifatı”/ Azərbaycan Respublikasının Gənclər və İdman Nazirliyinin 19 dekabr 2016-cı il tarixli , 08 nömrəli qərarı.
9. Bədən tərbiyəsi və idmanla bağlı hüquqi sənədlər. -Bakı: “ Avropa” nəşriyyatı, -2008, 256 s.
10. Əliyev, K. İdmançının qələbə psixologiyası. / K. Əliyev. -Bakı: Oğuz-Eli, -2014, -200 s.
11. İsmayılov F.F. Məktəblilərin fiziki və hərbi-vətənpərvərlik tərbiyəsinin yeni əsaslar üzrə təşkili metodikası. -Bakı: “Nigar Ə” KM-nin mətbəəsi, -1997, -80 s.
12. Mehrabov, A.O. Pedaqoji texnologiya. / A.O. Mehrabov, Ə. M. Abbasov [və b.] - Bakı: Mütərcim, -2006, -267 s.
13. Психология и современный спорт: Международный сборник работ по психологии спорта / Сост. А.В. Роионов, Н.А. Худадов. -М.; Физкулътура и спорт. -1982, -228 с.


**E-mail:** hicran_sharifova@mail.ru
**Rəyçi:** *ped.ü.elm.dok.prof.* **P.B. Əliyev**
**Redaksiyaya daxil olub:** 11.01.2023.

# *PEDAQOJİ TƏNQİD VƏ BİBLİOQRAFİYA*
# *ПЕДАГОГИЧЕСКАЯ КРИТИКА И БИБЛИОГРАФИЯ*
# *PEDAGOGICAL CRITICISM AND BIBLIOGRAPHY*

*UOT 371*

## DƏYƏRLİ DƏRS VƏSAİTİ

## ЦЕННОЕ УЧЕБНОЕ ПОСОБИЕ

## VALUABLE STUDY GUİDE

Tədqiqatlar və təcrübə göstərir ki, ali məktəblərdə müvafiq ixtisaslar üzrə innovativ tədris resurslarının, o cümlədən dərslik və dərs vəsaitlərinin hazırlanması tələbələrin təlim nailiyyətlərinin inkişafında mühüm rol oynayır. Ona görə də resursların müasir tələblərə uyğun daim yenilənməsi, təkmilləşdirilməsi və tələbələrin istifadəsinə verilməsi vacibdir. Tədris proqramına uyğun, eyni zamanda, texnologiya baxımından fərqli olan bu resurslar nəticəyönlü təlim məqsədlərinin reallaşdırılmasına əhəmiyyətli dərəcədə təsir göstərir. Belə resursların tətbiqi həmişə maraq doğurur və təqdir olunur. Bu yaxınlarda professor Məcid İsmixanov və professor Həsən Bayramovun həmmüəlifliyilə nəşr edilmiş “Pedaqogika” dərs vəsaiti də bu baxımdan diqqəti cəlb edir.

Dərs vəsaiti ali məktəblərin bakalavriat səviyyəsində təhsil alan tələbələri üçün nəzərdə tutulsa da, onun məzmunundan kollec tələbələri də faydalana bilərlər. Vəsaitin məzmunu həm də tədqiqatçılar, praktik müəllimlər üçün əhəmiyyətlidir.

Pedaqogikanın bir elm kimi ən mühüm problemləri vəsaitdə dörd hissəni əhatə edən on beş fəsildə ümumiləşdirilmişdir. Birinci hissədə pedaqogikanın nəzəri-metodoloji məsələləri əhatə olunmuşdur. İlk növbədə, pedaqogikanın mövzusu, sahələri, tədqiqat metodları təqdim edilmiş, pedaqogika elminin və pedaqoji fikrin inkişaf tarixi nəzərdən keçirilmiş, şəxsiyyətin inkişafı və tərbiyəsi məsələləri izah edilmişdir. Daha sonra pedaqoji proses, onun səciyyəvi cəhətləri, texnologiyası və yenilənməsi məsələlərinə aydınlıq gətirilmişdir. Burada pedaqoji sistemin innovasiya əsaslı yeniləşməsi və optimallaşdırılmasının vacibliyindən, onun həyata keçirilməsi yollarından bəhs edilmişdir. Müəlliflər göstərirlər ki, pedaqoji sistemi yeniləşdirməyin başlıca istiqamətləri, ilk növbədə, məktəbin demokratikləşdirilməsi və pedaqoji prosesin humanistləşdirilməsindən, eyni zamanda, təlim-tərbiyənin məzmununun yeniləşdirilməsi və təlim-tərbiyə prosesinin fərdiləşdirilməsindən başlanır. Bundan başqa yeni pedaqoji texnologiyaların tətbiqi, məktəbin idarə edilməsi sisteminin təkmilləşdirilməsi və digər mühüm məsələlərə də xüsusi diqqət yetirilməsi vacibdir.

Vəsaitdə “Təhsil sistemi” ayrıca fəsil kimi təqdim edilmiş və burada təhsil sistemi anlayışının mahiyyəti, Təhsil Qanunu, təhsil sisteminin prinsipləri, quruluşu, müasirləşdirilməsi istiqamətləri və təhsilin inkişaf strategiyası verilmişdir. Burada əksini tapmış təlim materialları tələbələrin təhsil sisteminə aid ən zəruri bilik və bacarıqlarının formalaşdırılması üçün geniş imkanlar yaradır.

Digər bir fəsildə pedaqoji fəaliyyətin xüsusiyyətləri, müəllimin peşə qabiliyyətləri əksini tapmış, müəllimin cəmiyyətdə və pedaqoji prosesdə rolu, onun şəxsi keyfiyyətləri, pedaqoji ustalığı və etik davranış qaydaları şərh edilmişdir.

Dərs vəsaitinin ikinci hissəsi “Didaktika”-ya həsr edilmişdir. Burada təhsilin məzmunu, təlim prosesinin mahiyyəti, qanunauyğunluqları, prinsipləri, metodları, vasitələri, texnologiyaları, eyni zamanda, təlimin təşkili formaları, təlimdə nəzarət və qiymətləndirmə problemləri əksini tapmışdır. Müəlliflər burada ənənəvi yanaşmalardan fərqli olaraq, müasir yanaşmalara üstünlük verərək pedaqoji məsələləri sadə, aydın və elmi şəkildə izah edir, təlimin səmərəli təşkili

yollarını göstərirlər. Onlar müasir yanaşmalar baxımından fəal təlim, oyun, distant, kompüter, tədqiqat əsaslı və modul təlim texnologiyalarının mahiyyətini geniş şərh edərək onun tətbiqi üsullarını əsaslandırırlar. Haqlı olaraq belə bir fikir vurğulanır ki, tədqiqat əsaslı təlim şagirdlərdə faktları təhlil etmək, tədqiqat aparmaq, nəticə çıxarmaq, ümumiyyətlə, zehni iş bacarıqlarını formalaşdırmaq baxımından böyük əhəmiyyət daşıyır.

Dərs vəsaitinin məzmunca ən geniş hissəsi "Tərbiyə nəzəriyyəsi" adlanan üçüncü hissəsidir. Burada verilən təlim materialları on üç fəsildə əhatə edilmişdir. Bu hissədə, ilk növbədə, tərbiyənin mahiyyəti, məqsədi və məzmunu, tərbiyənin qanunauyğunluqları və prinsipləri verilmiş, daha sonra tərbiyə metodları təhlil edilmiş, əqli, ideya-siyasi, əxlaq, əmək və peşəyönümü, iqtisadi, estetik tərbiyə və tərbiyənin digər sahələri haqqında elmi fikir və müddəalar ümumiləşdirilmişdir. Müəlliflər tərbiyənin mahiyyəti və məzmunundan bəhs edərkən tərbiyə prosesinin strukturu və mərhələlərinə də münasibət bildirmiş, bu məsələ ilə əlaqədar elmin son nailiyyətlərini əks etdirmişlər. Belə ki, tərbiyəni mürəkkəb dinamik sistem kimi izah etmiş, tərbiyə sisteminə daxil olan struktur komponentlərini (tərbiyənin məqsədi, məzmunu metod və formaları) əsaslandırmışlar. Aparılmış araşdırmalar göstərir ki, tərbiyə prosesi əsasən aşağıdakı mərhələlər üzrə həyata keçirilir:

1) şagirdlərin düzgün davranış normaları və tələbləri ilə tanış edilməsi; 2) həmin norma və tələblərə münasibətin formalaşdırılması; 3) düzgün davranış motivlərinin və arzusunun aşılanması; 4) sabit davranış təcrübəsinin, adət və vərdişlərinin formalaşdırılması; 5) sistem halını almış adət və ənənələrin tədricən şəxsiyyətin xarakter əlamətinə çevrilməsi. Bu mərhələlərin sistemli şəkildə nəzərə alınması tərbiyə işində məqsədəuyğun nəticələrin əldə olunmasına geniş imkanlar yaradır.

Dərs vəsaitində bu məsələlərə xüsusi diqqət yetirilmiş və tərbiyə prosesində onların nəzərə alınması məqsədəuyğun hesab edilmişdir.

Vəsaitdə diqqət çəkən məqamlardan biri də tərbiyə prinsiplərindən bəhs edilərkən tərbiyədə pedaqoji rəhbərliklə insanın təşəbbüs və özfəaliyyətinin əlaqələndirilməsi prinsipinin tətbiqinə xüsusi əhəmiyyət verilməsidir. Pedaqoji əməkdaşlığı nəzərdə tutan bu prinsip indiki dövrdə olduqca aktualdır. Çünki bu prinsipə yetərincə əməl edilməməsi nəticəsində iki hal özünü daha çox büruzə verir. Birinci hal uşaqların tam sərbəst buraxılması, ikinci hal isə ona nəzarətdə həddin, normanın aşılamasıdır. Hər iki hal qəbuledilməzdir. Belə ki, hər iki halın nəticəsi tərbiyəyə ciddi zərbə vurur, uşaqların cəmiyyətin tələblərinə uyğun formalaşması və sosiallaşmasında problemlər yaradır. Təcrübə göstərir ki, sərbəst həyat tərzi keçirməyə alışan uşaq böyüdükcə valideynlərini də eşitmək istəmir, heç bir məsləhəti qəbul etmir və beləliklə, əksər hallarda pis vərdişlərə aludə olur, cəmiyyətin normal üzvü ola bilmir.

İkinci halın nəticəsi də arzuolunan deyil. Belə ki, uşağa həddindən artıq təsir göstərmək, onun müstəqilliyini, müstəqil düşüncəsini buxovlamaq yolverilməzdir. Belə halda da uşaq ən kiçik məsələləri həll etməkdə acizlik göstərir, valideynlərdən asılı olur. Böyüdükcə asılılıq daha da artır və öz müstəqil mövqeyini müəyyənləşdirə bilmir. Ona görə də ailədə uşaqların tərbiyəsinin təməli düzgün qoyulmalı və məktəbdə bu proses məqsədəuyğun şəkildə düzgün davam etdirilməlidir. Tədqiqatlar göstərir ki, müasir dövrdə uşaq və yeniyetmələri, şagird və tələbələri elmi-pedaqoji prinsip və tələblər əsasında tərbiyələndirmək üçün, onları şəxsiyyət kimi formalaşdırmaq və inkişaf etdirmək üçün səmərəli iş formaları və metodları mövcuddur.

Dərs vəsaitində bu məsələlər təhlil edilmiş, problemin doğru həll yolları göstərilmişdir.

Tərbiyə işinin məqsədəuyğun təşkilində ən vacib məsələlərdən biri də uşaq və yeniyetmələrin, təhsilalanların dünyagörüşünün formalaşdırılmasına ciddi əhəmiyyət verilməsidir. Dünyagörüşü insanın davranış və fəaliyyətinin tənzimləyicisi rolunda çıxış edir. Bitkin və sistemli dünyagörüşü insanın şəxsiyyət kimi formalaşmasının başlıca göstəricilərindən biri hesab olunur.

İnsanın həyata elmi, fəlsəfi, hüquqi, əxlaqi, dini, siyasi, estetik baxışlarının ümumiləşdirilmiş sistemi olan dünyagörüşünün formalaşdırılması prosesi hələ kiçik yaşlarından başlayır. Araşdırmalardan aydın olur ki, dünyagörüşün formalaşdırılması prosesinə bir sıra amillər təsir göstərir. Məsələn, sosial mühit, ailə həyatı, təlim və tərbiyə, kütləvi informasiya vasitələri və

s. bu baxımdan daha təsirli vasitələr hesab edilə bilər. Ona görə də hər bir ailədə və eyni zamanda, məktəbdə bu məsələyə ciddi yanaşılmalı, uşaqların dünyagörüşünün formalaşdırılması məsələsi davamlı olaraq diqqətdə saxlanılmalıdır. Dünyagörüşün quruluşunda zehni, emosional və iradi komponentlərin hər biri özünəməxsus funksiya daşıyır. Lakin onların ümumilikdə vəhdət təşkil etməsi şəxsiyyətin tamlığı və harmonik inkişafında mühüm rol oynayır.

Qeyd etdiyimiz bu məsələlərə prof. M. İsmixanov və H. Bayramovun həmmüəllif olduqları dərs vəsaitində münasibət bildirilmiş, tərbiyə işində və şəxsiyyətin formalaşdırılmasında dünyagörüşün roluna aydınlıq gətirilmişdir. Burada dünyagörüşü tərbiyəsinin yolları və vasitələri, elmi və dini dünyagörüşün xüsusiyyətləri təhlil edilmiş, tələbələrin tənqidi təfəkkürünün inkişafı üçün imkanlar yaradılmışdır.

Dərs vəsaitinin sonuncu - dördüncü hissəsi ”Məktəbşünaslığ”a həsr edilmişdir. Bu hissədə məktəbin idarə edilməsi və ona rəhbərlik məsələləri əksini tapmışdır. Müəlliflər müasir dövrdə məktəbşünaslığın aktual problemlərini işləmiş, bu baxımdan ümumpedaqoji, nəzəri fikirləri əsaslandırmışlar. Burada məktəbin idarə edilməsi və ona rəhbərliyin ümumi əsasları, idarəetmənin quruluşu, funksiyaları verilmiş, məktəb rəhbərliyi və kollegial orqanların səciyyəvi xüsusiyyətləri şərh edilmişdir.

Tədqiqatlardan aydındır ki, idarəetmə prosesi müxtəlif mərhələlərdən ibarətdir. Belə ki, məqsədin müəyyən edilməsi, vəziyyətin öyrənilməsi və təhlillər əsasında işin planlaşdırılması (proqramın tərtib edilməsi), planın həyata keçirilməsi (işin təşkili), işin stimullaşdırılması (ona nəzarət edilməsi və zəruri düzəlişlərin aparılması), nəticələrin təhlili və qiymətləndirilməsi kimi mühüm mərhələlərə ardıcıl olaraq diqqət yetirildikdə idarəetmədə keyfiyyətli nəticələr əldə etmək mümkün olur. Eyni zamanda, məktəbə rəhbərliyin özü də müəyyən pedaqoji prinsiplərə əsaslanmalıdır. Bu baxımdan məqsədyönlülük və sistemlilik, demokratikləşdirmə və humanistləşdirmə, kollegiallıqla vahid rəhbərliyin əlaqələndirilməsi, elmilik, obyektivlik, planlılıq və aşkarlıq prinsiplərinin nəzərə alınması olduqca vacibdir.

Məktəbin idarə edilməsində digər vacib məsələlərdən biri metodik xidmətin təşkilidir. Metodik xidmət müəllimlərin pedaqoji-metodik hazırlıq səviyyəsini yüksəltmək, onları yaradıcı işə sövq etmək, özünütəhsil bacarıqları və peşəkarlığının inkişaf etdirilməsi üçün əlverişli şərait yaratmaq məqsədini həyata keçirir. Dərs vəsaitinin müəllifləri bu məsələlər üzərində də dayanmış, onların mahiyyəti, məzmunu və əsaslandırılmış tətbiq yollarını göstərmişlər. Vəsaitdə ayrı-ayrı fənlər üzrə metodik xidmətin qiymətləndirilmə meyarlarından bəhs edilərkən əsasən üç meyara üstünlük verilməsi məqsədəuyğun bilinmişdir: 1) şagirdlərin fənn üzrə bilik səviyyəsi və bilikləri tətbiq etmək bacarıqları; 2) şagirdlərin müstəqil, yaradıcı düşünmə və işləmə bacarıqları; 3) müəllimlərin yeni metod və texnologiyalardan səmərəli istifadə etmək bacarıqları.

Ümumiyyətlə, müasir dövrdə məktəbdə öyrənmə mühitinin təmin olunması və təlim keyfiyyətinin yüksəldilməsində metodik xidmətin səmərəliliyinin artırılmasına xüsusi önəm verilməsi vacidir. Vəsaitdə bu məsələlərə diqqət yetirilməsi əhəmiyyətlidir.

Bütövlükdə prof. M. İsmixanov və prof. H. Bayramovun həmmüəllifliyi ilə nəşr edilmiş “Pedaqogika” dərs vəsaiti struktur və məzmun etibarilə innovativ yanaşmalara istiqamətləndiyindən maraq doğurur və dəyərli vəsait kimi pedaqogika elminə töhfə verir.

**İntiqam Cəbrayılov,**
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun*
*Təhsilin nəzəriyyəsi və tarixi şöbəsinin müdiri,*
*pedaqogika elmləri doktoru, professor*
**Redaksiyaya daxil olub: 06.01.2023.**

***MÜƏLLİMİN ÖZÜNÜTƏHSİLİ***
***САМООБРАЗОВАНИЕ УЧИТЕЛЯ***
***SELF-EDUCATION OF THE TEACHER***

*UOT 37.0*

***Akif Nurağa oğlu Abbasov***
*pedaqogika elmləri doktoru, professor, Əməkdar müəllim*
*Azərbaycan Respublikasının Təhsil İnstitutunun elmi katibi*
https://orcid.org/ 0000-0002-9210-714 https://doi.org/10.5281/zenodo.6444842 A

# ƏDƏBİYYATIMIZA YENİ RUH, YENİ NƏFƏS GƏTİRMİŞ ZƏLİMXAN YAQUB

***Акиф Нурага оглу Аббасов***
*доктор наук по педагогике, профессор, Заслуженный учитель,*
*ученый секретарь Института Образования Азербайджанской Республики*

# ЗАЛИМХАН ЯГУБ ВНЕСШИЙ НОВЫЙ ДУХ, НОВОЕ ДЫХАНИЕ В НАШУ ЛИТЕРАТУРУ

***Akif Nuragha Abbasov***
*doctor of pedagogical sciences, professor, Honored teacher*
*scientific secretary at the Institute of Education of the Republic of Azerbaijan*

# ZALIMKHAN YAGUB INTRODUCED A NEW SPIRIT, A NEW BREATH TO OUR LITERATURE



**Xülasə**: Məqalə xalq şairi Zəlimxan Yaqubun yaradıcılığına həsr edilmişdir. Şairin “Peyğəmbər” poeması, Xətayiyə və Qazi Bürhanəddinə, Atatürkə və Heydər Əliyevə həsr olunmuş şeirləri üzərində dayanılır.

Zəlimxan nəinki Azərbaycanımızın, həmçinin türk dünyasının sevilən, seçilən böyük şairi idi. Böyük şairi olaraq qalacaqdır!

***Açar sözlər:*** *xalq şairi, Azərbaycan ədəbiyyatı tarixində, şairin yaradıcılığı, "Peyğəmbər" poeması, Xətayiyə həsr edilmiş şeir*

***Akif Nurağa oğlu Abbasov***

**Резюме**: Статья посвящена творчеству народного поэта Залимхана Ягуба. Внимание обращено на поэму поэта «Пророк», стихи, посвященные Хатаи, Гази Бурханеддину, Ататюрку и Гейдару Алиеву.

Залимхан был великим поэтом, которого любили не только в Азербайджане, но и во всем тюркском мире. Он навсегда останется великим поэтом!

***Ключевые слова**: народный поэт, история азербайджанской литературы, творчество поэта, поэма «Пророк», поэма, посвященная Хатаи*

**Summary**: The article is devoted to the work of the national poet Zalimkhan Yagub. Attention is drawn to the poet's poem "Prophet", poems dedicated to Khatai, Gazi Burhaneddin, Ataturk and Heydar Aliyev.

Zalimkhan was a great poet who was loved not only in Azerbaijan, but also in the Turkic world. He will remain a great poet!

***Key words**: people's poet, history of Azerbaijani literature, poet's work, poem "Prophet", poem dedicated to Khatai*

Xalq şairi Zəlimxan Yaqub Azərbaycan ədəbiyyatı tarixində özünəməxsus yer tutur. Onun çoxsaylı şeirləri və poemaları nəşr olunmuş, yaradıcılığından nümunələr dərsliklərə salınmışdır. Zəlimxan ədəbiyyatımıza yeni ruh, yeni nəfəs gətirmiş, poeziyamızın zənginləşməsində əvəzsiz rol oynamış, ümumxalq məhəbbəti qazanmışdır.

Zəlimxan Yaqub gözəl nitqə, natiqliyə malik olmaqla yanaşı, poeziya aləmində də zirvələr fəth etmişdi. Şairin yaradıcılığı müxtəlif mövzulara – Vətənə, təbiətin gözəllikləri, məhəbbət, dostluq, sədaqət, xeyirxahlığa, bundan başqa, ermənilərin xalqımıza qarşı düşmənçilik siyasətinin lənətlənməsinə, onların törətdikləri soyqırımlara, yaramazlıqlarına nifrətə və s. mövzulara həsr edilib. Həmin əsərlər arasında İslam dininin yaradıcısı həzrəti Məhəmməd peyğəmbərə, tarixi şəxsiyyətlərə (Şah İsmayıl Xətayiyə, Qazi Bürhanəddinə, Heydər Əliyevə), dahi mütəfəkkirlərə, görkəmli şairlərə (Nizamiyə, Füzuliyə, Şəhriyara və b.), dövlət xadimlərinə (Heydər Əliyevə, Mustafa Kamal Atatürkə), Qarabağa aid əsərlər xüsusilə diqqəti cəlb edir.

"Peyğəmbər" poeması İslam dininin yaradıcısı, Allahın elçisi (Rəsulullah), sonuncu peyğəmbər həzrəti Məhəmməd əleyhissəlama (570-632) həsr olunub və böyük məhəbbətlə qələmə alınıb.

Poema belə başlayır:

*Arzu uca idi ümid mötəbər,*
*Duyğular getdikcə çözələnirdi.*
*Xəbər gözləyirdi dünya şad xəbər,*
*Səs-səs, nəfəs-nəfəs təzələnirdi.*

*Cahillik insanın faciəsiydi,*
*Nadanlıq tarixin baş qəhrəmanı.*
*Ancaq xilas yolu haqqın səsiydi,*
*Qaramat basmışdı əsri, zamanı.*

*Yol yoxdu haqq yolu tutub getməyə,*
*Cəhalət dünyası dağılmalıydı*
*Köhnə fikirləri alt-üst etməyə*
*Ruhun xilaskarı doğulmalıydı.*

Poemada bu hissə "Bir işıq doğulub gəldi dünyaya" (*Peyğəmbərin doğumu*) adlanır.

Aşağıdakı misralarda şair peyğəmbərimizin özəlliklərini, böyüklüyünü, müqəddəsliyini, müsəlmanlar və bütün dünya üçün önəmliliyini və əvəzolunmazlığını parlaq boyalarla təsvir edib. Onun insanların, xüsusən müsəlmanların həyatında oynadığı böyük rol diqqət mərkəzinə gətirilib:

*Yatmış vicdanları nurla oyatdı.*
*İnsanın əşrəfi həddinə yetdi,*
*Peyğəmbər yaşına çatana qədər.*
*Gözü tox, nəfsi tox, nəfəsi halal,*
*Saflıqda ad alıb, ün qazanırdı.*

*Özündən xəbərsiz peyğəmbərliyə*
*Ömür qazanırdı, gün qazanırdı.*
*Qurutdu gözlərin axan yaşını,*
*Kəsdi tayfaların sərt savaşını".*

"Peyğəmbər" poeması Təbrizdə də nəşr edilmişdir.

Zəlimxan Yaqubun belə bir şeiri var:

"*Şeyxim mənim, şahım mənim,*
*şairim mənim*".

Bu şeir Azərbaycanın dövlətçilik tarixində özünəməxsus yeri və rolu olan, Səfəvilər dövlətinin yaradıcısı, böyük hökmdarı, qüdrətli sərkərdəsi, diplomatı, müqtədir şairi Şah İsmayıl Xətayiyə (1487-1524) həsr olunub. Azərbaycan

türkcəsi məhz Şah İsmayılın sayəsində ilk dəfə dövlət dili səviyyəsinə qaldırılmışdır. Onun hakimiyyəti illərində Azərbaycanın ərazisi üç milyon kvadrat kilometrdən artıq idi.

"*Şeyxim mənim, şahım mənim, şairim mənim*" şeiri erməni işğalçılarının ölkəmizə qarşı qəsbkarlıq siyasətinin tüğyan etdiyi illərdə, Qarabağda qanlı-qadalı müharibənin getdiyi vaxtlarda qələmə alınmışdı. Şair öz şeirində düşməni lənətləyir:

*Əldən çıxdı, fürsət mənim, çəm mənim deyil,*
*Göycə yoxsa, necə deyim, qəm mənim deyil,*
*Təbriz, Dərbənd həm mənimdi,*
*həm mənim deyil,*
*ŞEYXİM mənim, ŞAHIM mənim,*
*ŞAİRİM mənim!*

Şair çətinliklərin, düşdüyümüz ağır vəziyyətin müvəqqəti olduğuna diqqəti yönəldərək, xalqımızın mərdlik, qəhrəmanlıq və mübarizə tarixini yada salır, həmin tarixdən ibrət götürməyi məsləhət bilir. Belə məqamda I Şah İsmayıl yada düşür. Onu haraylayır:

*Qollarınla torpağıma sarıl, gəl, babam,*
*Oxa çevril, kaman kimi gəril, gəl, babam,*
*Dirilt bizi, yaşat bizi, diril, gəl, babam,*
*ŞEYXİM mənim,*
*ŞAHIM mənim,*
*ŞAİRİM mənim!*

*Çaldıranda yaralanmış şahıma qurban,*
*Bu yaradan tüstülənən ahına qurban.*
*Tarixdəki on üç yaşlı dahimə qurban,*
*ŞEYXİM mənim*
*ŞAHIM mənim,*
*ŞAİRİM mənim.*

Zəlimxan "Qismət" şeirini də Xətayiyə həsr etmişdir. Şair Xətayinin aşağıdakı fikirlərini öz şeiri üçün proloq seçmişdir:

*"Uçmaqda tuti quşuyam,*
*Ağır ər başıyam,*
*Mən sufilər yoldaşıyam,*
*Qazilər, deyən şah mənəm".*

"Qismət" şeirində oxuyuruq:

*On üç yaşında gəldi şahlığın sarayına,*
*Otuz yeddi yaşında şeyxim və şahım mənim.*
*Azərbaycan adında bir məmləkət yaratdı,*
*Bir dərgaha baş əydi neçə dərgahım mənim.*

I Şah İsmayıl da, Qazi Bürhanəddin də uzaq keçmişlərdə yaşamışdır. Zəlimxan Yaqub mənbələrə, öz təsəvvürlərinə görə onların obrazlarını yaratmış, hünərlərindən söz açmışdır.

Zəlimxan Ümummilli liderimiz Heydər Əliyev haqqında da şeirlər və poemalar yazmışdır. Digər dövlət xadimlərindən, mütəfəkkirlərdən fərqli olaraq, o, Ulu öndərin müasiri idi. Heydər Əliyevin Azərbaycanın taleyi üçün necə narahat olduğunu, ölkəmizi və xalqımızı firavanlığa, xoşbəxtlik və səadətə çatdırmaq, respublikamızın müstəqilliyini və ərazi bütövlüyünü qorumaq üçün necə çalışdığını, gecəsini gündüzünə necə qatdığını görmüş və eşitmişdi:

Müasir Azərbaycanın memarı olan Heydər Əliyevin həyatı, fəaliyyəti, fədakarlığı, təbii ki, onun şeir və poemaları üçün çox aktual və önəmli mövzu oldu. Zəlimxan bir-birinin ardınca Ümummilli öndərimizə həsr olunmuş iki poema qələmə aldı: *"Əbədiyyət dastanı"* və *"Böyük ömrün dastanı"*.

Zəlimxan "*Böyük ömrün dastanı*" poemasında deyir:

*Xalqı zirvələrə qaldırmaq üçün*
*Sevgi şahlığının taxtına çıxdın.*
*Oğul xalq üçündür, zirvə dağ üçün,*
*Nə yaxşı bu xalqın baxtına çıxdın!*

Heydər Əliyevin dünyasını dəyişməyi hamımız kimi Zəlimxan Yaquba da ağır təsir etdi. Qəm, qüssəsini, ağır kədərini şeirin dili ilə "*Böyük ömrün dastanı*" poemasında belə təsvir edir:

*"Sazın sinəsi yandı, muğamat xal itirdi,*
*Bülbüllər yaşıl çəmən, çiçəklər bal itirdi.*
*Qaya xınalı kəklik, zirvə qartal itirdi, –*
*"Heydər köçdü" deyəndə".*

Şair sonra əlavə edir:

*"Mən belə ağlamışam qanlı fələk ilk dəfə*
*Ürəyimi qıranda.*
*Yetim qalıb atamı torpağa*
*Tapşıranda".*

Daha sonra Zəlimxan sonsuz kədərini aşağıdakı kimi ümumiləşdirir:

*Həsrətini çəkəcəyəm illər boyu,*
*Kövrək qəlbim oyum-oyum oyulacaq.*
*Eşqin ilə yaratdığım bu dastanın*
*Son nöqtəsi mən öləndə qoyulacaq.*

Bəli, bu ümumxalq kədəri idi, böyük itki idi. Fəqət təsəllimiz bu oldu ki, Ulu öndər cismən bizdən ayrılıb, o, bütün canlılardan canlıdır, ruhən aramızdadır, əməlləri yaşayır.

Ümummilli liderin dedikləri həqiqət oldu – torpaqlarımız düşmən tapdağından azad olundu. Ali Baş Komandan, Azərbaycan Respublikasının Prezidenti cənab İlham Əliyevin rəhbərliyi altında ordumuz erməni faşist işğalçılarını torpaqlarımızdan qovdu, erməni ordusunu darmadağın etdi.

Zəlimxan Yaqubun yaradıcılığında Türkiyə (“Dünya türkün olacaq”, “Döyüşən türk, oyanan türk, qalxan türk”, “Türk yağıdan üzr istəməz”, “İstanbul qızı” və s.) və Mustafa Kamal Atatürk mövzusu da özünəməxsus yer tutur. Türkiyə qardaş ölkə, türklər və azərbaycanlılar qardaş xalqlardır.

Heydər Əliyev müasir Azərbaycanın yaradıcısı olduğu kimi, Mustafa Kamal Atatürk də müasir Türkiyə Respublikasının yaradıcısı və ilk Prezidentidir.

Haqqında danışılam mövzulara Zəlimxan Yaqubun müraciət etməsi təqdir edilməlidir. Şairin “Atatürk köşkündə keçən günlərim” şeirinin bəzi misraları ilə tanış olaq:

*Çox ömrün payına qar-şaxta düşdü,*
*Cana nə düşdüsə, sazaqda düşdü.*
*Ürəyim ağrıyan bir vaxta düşdü,*
*Atatürk köşkündə keçən günlərim.*

*Qaçmadı ölümdən, qorxmadı yasdan,*
*Oldu Çanaqqala dillərdə dastan*
*Başladı Samsundan, çıxdı Sivasdan,*
*Atatürk köşkündə keçən günlərim.*

SSRİ-yə daxil olduğumuz illərdə rus imperiyası azərbaycanlıların türklərlə, Türkiyə ilə, İranda yaşayan azərbaycanlılarla əlaqə saxlamalarına hər vəchlə mane olur, onlara “pantürkist”, “panislamist” damğası vuraraq zindanlara atır, ölüm hökmü kəsir, sürgün etdirirdi. Beləliklə, qardaşı qardaşdan ayrı salırdılar.

Bu ayrılığı salmaq səbəbsiz deyildi. Biz oğuz türkləriyik. Qardaşlar bir yerdə olanda dəmir yumruq kimi möhkəmlənir, endirdikləri zərbə öldürücü təsir göstərir. Ümummilli liderimiz Heydər Əliyev uzaqgörənliklə deyirdi: “Bir millət, iki dövlət!”

Zəlimxanın Türkiyəyə, türk xalqına həsr etdiyi şeirlər arasında “Dünya türkün olacaq” şeiri özünün səviyyəsinə, ifadə tərzinə və əhəmiyyətinə görə möhtəşəmdir.

*Vaxt Təbrizin, dünya Ərkin dünyası,*
*Yol Tanrının, haqqı dərkin dünyası,*
*Əvvəl-axır dünya Türkün dünyası,*
*Üç gün, beş gün gecim-tezim olacaq,*
*Bu gün-sabah dünya bizim olacaq.*

Natiqlik məharəti, şairlik istedadı Allah vergisidir ki, tanrı bunu Zəlimxandan əsirgəməmişdi. Danışanda, şeir dəyəndə Zəlimxan sanki od püskürürdü, sözlər, mənalı, məntiqli, cilalanmış fikirlər sürətlə bir-birini əvəzləyirdi. Düşünürdün: “İlahi, bu nə qüvvət, bu nə qüdrət!”

Osmanlı imperiyası altı əsrdən artıq bir müddətdə dünyaya hökmranlıq, ağalıq etmişdi. Bu gün də Türkiyə Respublikası dünya dövlətləri sırasında öncül yerlərdən birini tutur, çox ağıllı, uğurlu daxili və xarici siyasət yürüdür. Türk Silahlı Qüvvələri dünyanın ən qüdrətli ordularından biridir. Bu gün Türkiyə Azərbaycanın yanındadır. Türkiyə qardaşlıq ənənələrinə sadiq qalaraq, 44 günlük müharibədə ölkəmizə öz köməyini göstərdi.

2021-ci il iyun ayının 15-də bu iki dövlət – Azərbaycan və Türkiyə arasında müttəfiqlik münasibətləri ilə bağlı Bəyannamə imzalanıb.

Tarixin gedişatından görünür ki, Zəlimxan “Dünya türkün olacaq” deyəndə öz sözlərində yanılmamışdı. Hazırda dünyada Türkiyənin, bu ölkənin Prezidenti Ərdoğanın sözü eşidilir. Qanlı müharibə edən iki dövlət - Rusiya və Ukrayna münasibətlərinin tənzimlənməsi, sülh danışıqları bir sıra hallarda Türkiyənin vasitəçiliyi ilə aparılır. Zəlimxan demişkən, həqiqətən də dünya türkün olacaq:

*Yeni düzən, yeni mizan qurandı,*
*İlk andımız, son andımız Turandı,*
*Soraq verən peyğəmbərdi, Qurandı,*

*Nə yozulsa xeyrə yozum olacaq,*
*Bu gün-sabah dünya bizim olacaq.*
*Qovuşacaq bölünənlər, bölgələr,*
*Nurlanacaq qaranlıqlar, kölgələr,*
*Diriləcək Oğuzxanlar, Bilgələr,*
*Türkə səcdə, Türkə təzim olacaq,*
*Bu gün-sabah dünya bizim olacaq.*

Şairin "Döyüşən türk, oyanan türk, qalxan türk" şeiri də uğurludur.

*Silkələdin göyün yeddi qatını,*
*Qucaqladın doğu ilə batını.*
*Dur yəhərlə ərənlərin atını,*
*Dəniz kimi dalğalan, Türk, çalxan, Türk,*
*Döyüşən Türk, oyanan Türk, qalxan Türk!*

*Hardan hara getdiyini bilən yol,*
*Üfüqlərə qovuşanda gülən yol,*
*Atilladan Atatürkə gələn yol,*
*Qalxan olsun başın üstə, qalxan, Türk!*

Zəlimxan Yaqub mütəfəkkirlərə, şair və yazıçılara, alimlərə də şeirlər yazmışdır. Bu fikir baxımından dahi Nizami Gəncəviyə ehtiramını bildirən "Nizami" şeiri səciyyəvidir:

*Sözdü, bir də qələmdi Nizaminin silahı,*
*Sözdə, qələmdə gördü peyğəmbəri, Allahı.*
*Sözlə gəldi axşamı, sözlə açdı sabahı,*
*Gördü bir tamaşadı, gördü bir həyatdı söz.*

*Zamanların fövqünə ucaldıqca, ucaldı,*
*O, zamandan güc aldı,*
*zaman ondan güc aldı.*
*Cavan qaldı həmişə, nə soldu, nə qocaldı,*
*Min illərdən söz aldı, min illərə çatdı söz.*

Zəlimxan Yaqubun "Şahim-şairim" şeiri görkəmli dövlət xadimi, Sivasın hökmdarı, məşhur sərkərdə və poeziyamızın inkişafında əvəzsiz rol oynamış, Azərbaycan əruz vəzninin yaradıcısı Qazi Bürhanəddinə (1344-1398) həsr olunmuşdur. Qazi Bürhanəddin Azərbaycan, türk və fars dillərində çoxsaylı şeirlər, qəzəllər yazmışdır.

"Şahım, şairim" şeirində Zəlimxan Yaqub Qazi Bürhanəddini bizə belə təqdim edir:

*"Yüz illərdən min illərə*
*yol gəlirsən, yorulmursan,*
*Uçulmayan şan-şöhrətim,*
*dağılmayan qalam, Qazi!*
*İzin də var, sözün də var,*
*haqqın da var bu torpaqda,*
*Bağdad olsun, Hələb olsun,*
*ya Rum olsun, yaş Şam, Qazi!*
*At oynatdın, qılınc vurdun,*
*qələm tutdun, şeir yazdın,*
*Ey şah babam, şair babam,*
*ey ər babam, ərən babam.*
*Ey döyüşlər pəhləvanı,*
*ey savaşlar qəhrəmanı,*
*Ən amansız tufanlara*
*sinəsini gərən babam.*
*Şahlığımın uca taxtı,*
*taleyimin qızıl baxtı,*
*Bir millətdə özül olmaq,*
*təməl olmaq səadətdir.*
*Həm keçmişim, həm gələcək,*
*elim-günüm obam, Qazi!*

Zəlimxanın "Bakıdan gəlmişəm, Şəhriyar babam" şeiri Cənubi Azərbaycanda yazıb-yaratmış görkəmli şair Məhəmmədhüseyn Şəhriyara həsr olunub.

Bildiyimiz kimi, müstəqilliyimizi əldə edənə qədər Şimali Azərbaycanla Cənubi Azərbaycanı bir-birindən tikanlı məftillər ayırırdı. Torpaqların ikiyə bölünməsi nəticəsində biri bu yanda, digəri o yanda qalmış iki doğma qardaş, iki bacı, ana və oğul Arazın bu tayından o tayına, bu tayından o yana tikanlı məftillər üzərindən, məftillərin arasından baxardılar. Bəzən buna da icazə verməzdilər.

Sovet imperiyası dağıldı. Ötən əsrin 90-cı illərində Azərbaycan müstəqilliyinə qovuşdu. Tikanlı məftillər aradan götürüldü, sərhədlər açıldı. Doğmalar bir-birini görə bildilər, bir-birinin evinə qonaq gedib-gəldilər. Fəqət Şəhriyar artıq haqq dünyasına qovuşmuşdu. Zəlimxan bu həsrəti yana-yana, göz yaşları içərisində, ürək ağrısı ilə təsvir etmişdir:

*Üzünü heç zaman görəmmədiyin,*
*Bircə çiçəyini dərəmmədiyin,*
*Qoşa qapısından girəmmədiyin*
*Bakıdan gəlmişəm, Şəhriyar babam!*

Şəhriyara Azərbaycan Respublikasını, onun baş şəhəri Bakını görmək qismət olmadı:

*İllərlə qovrula-qovrula qaldın,*
*Aylarla qıvrıla-qıvrıla qaldın,*
*Bakının üzünü görə bilmədin.*
*Bakıdan gəlmişəm, Şəhriyar babam!*
*Kəlbəcər nəfəsli, Göyçə dilәkli,*
*Naxçıvan qeyrətli, Gəncə ürəkli,*
*Borçalı ətirli, Xəzər havalı,*
*Qarabağ nisgilli, Şuşa davalı*
*Bakıdan gəlmişəm, Şəhriyar babam!*

Hamımız kimi, Zəlimxan da Qarabağ dərdi çəkirdi. Şuşa, Qarabağ namus idi, şərəf idi, şan idi, şöhrət idi, Vətən idi, can idi!!! Candan, Vətəndən necə ayrı düşmək olardı?! Qarabağ dərdi bizim hər birimizi neçə il qocaltdı, bəzilərini hətta apardı.

Vətənpərvər şair Qarabağ mövzusuna biganə qala bilməzdi. Odur ki, yazdı, yaratdı. İlk növbədə Xocalının dərdinə ağladı, göz yaşı tökdü. Hiss elədi ki, qəddi əyilib. Göz yaşlarını tökə-tökə “Layla, Xocalım, layla”, “Xocalım, ay Xocalım” şeirlərini meydana gətirdi.

“Layla, Xocalım, layla” şerini oxuyaraq o ağrıları, acıları yaşayırıq. Erməni faşist işğalçıları 1992-ci il fevral ayının 25-dən 26-na keçən gecə sovet ordusunun 366-cı motoatıcı alayının himayədarlığı və əməliyyatda, soyqırımda bilavasitə yaxından iştirakı ilə Xocalıda daşı daş üstündə qoymadı, dinc əhaliyə divan tutdu. Yüzlərlə insan öldürüldü.

*Daş üstə daşmı qaldı,*
*Salamat başmı qaldı,*
*Gözümdə yaşmı qaldı?*
*Layla, Xocalım layla*
(“*Layla, Xocalım, layla” şeirindən*).

Xocalıda törədilən faciənin dünyada misli-bərabəri yox idi. Dərələr, düzlər, dağlar, yamaclar qan ağlayırdı. Bu yerlər Xocalı sakinlərinin meyitləri ilə dolu idi. İnsanlığı itirmiş, vəhşiləşmiş, quduzlaşmış ermənilər qocalara, qadınlara, uşaqlara, xəstələrə, şikəstlərə, bir sözlə, heç kimə aman vermədən qətliam törətmişdilər. İnsanlar güllələnmiş, süngüdən keçirilmiş, bir çoxunun başının dərisi soyulmuşdu.

*Töküldülər üstünə quduz kimi, ac kimi,*
*Şumladılar yer kimi, qırdılar ağac kimi,*
*Dağıtdılar çöllərə əsir, yalavac kimi.*
*Səni qaldırammasam başım üstə tac kimi,*

*Tarixin yaddaşında çətin qalxım, ucalım,*
*Xocalım, ay Xocalım!*
(“*Xocalım, ay Xocalım” şeirindən*)

Yüzlərlə insan amansızlıqla qətlə yetirilsə də, dünya bu faciəyə, soyqırıma göz yumdu (“Dünya darmı görəsən? Qulaq karmı görəsən? Allah varmı görəsən? Layla, Xocalım, layla). Sanki heç nə olmamışdı.

*Dərdin kimi acı yox,*
*Ağrı var, əlacı yox.*
*Ağlamağa bacı yox,*
*Layla, Xocalım, layla.*

Daha 30 il həqiqətin ağzına daş basdılar. Uzun illər ATƏT-in Minsk qrupu işğalçıların – ermənilərin mövqeyini müdafiə etdi. Budur dünyanın haqsızlığı, ikili standartı! Haqqı nahaqqa verməyi!

*Şuşanın ətəyi qan,*
*Balı qan, pətəyi qan.*
*Düşmənin kötəyi qan,*
*Layla, Xocalım, layla.*

Zəlimxan dünyanın vəfasına çox da bənd olmamağı, öz işini ehtiyatlı tutmağı insanlara da məsləhət görürdü. “Belə dünya” şerində dediyi kimi:

*A bostançı, bostanına güvənmə:*
*Dünya özü bostan əkən Dünyadı.*
*Ağlar qoyub anasını torpağın*
*Bərəkətini göyə çəkən Dünyadı.*

Müdrik atalarımız demişkən, “Sən saydığını say, gör fələk nə sayır!..” Ordumuzun 2020-ci il sentyabrın 27-də Qarabağda başladığı uğurlu əks-hücum əməliyyatı sayəsində Şuşamız da, Ağdam, Füzulu, Cəbrayıl, Qubadlı, Zəngilan, Kəlbəcər, Laçın, Hadrut da düşməndən azad olundu.

Hələ ki, Xocalı düşmən tapdağı altındadır. Tezliklə o da azad olacaqdır.

Zəlimxan Yaqubun şeirləri, eyni zamanda, insana qəlb rahatlığı, sevinc, nikbinlik bəxş edir. Həmin şeirlər “insanın ən böyük kəşfi olan mə-

həbbətə" (*N. Hikmət*), təbiət gözəlliklərinə, anaya, halallığa, Vətənə və s. həsr olunmuşdur. "Bu yaşıl ağacın altı bizimdir", "Gözəldir", "Qalardım", "Sevərmiş", "Allah, gözlərə bax", "Bəs niyə sevməyək bir-birimizi?", "Səni sevmək üçün gəldim dünyaya", "Heç vaxt məni tərk eləmə", "Sevgi", "Sən yorulmadın" və s. bu qəbildəndir.

"Bu yaşıl ağacın altı bizimdir" şeiri insana nikbin ruh, xoş əhval-ruhiyyə aşılayır. Bu nikbinliklə, Zəlimxan Yaqubla bağlı qənaətlərimizi onun şerindən alınmış aşağıdakı misralarla tamamlayırıq:

*Su içər sevginin kökü ömürdən,*
*Sevgi əl üzməsin təki ömürdən,*
*Xoş bir xatirədi iki ömürdən,*
*Bu yaşıl ağacın altı bizimdi.*

Bəli, "bu yaşıl ağacın altı bizimdir!" 8 noyabr ölkəmizdə Zəfər günü elan edilmişdir. Şuşa düşməndən həmin gün, o biri rayon və şəhərlərimiz ondan əvvəl və iki gün sonra azad olunmuşdur. "Bu yaşıl ağacın altı bizim" olduğundan indi Şuşamızda və digər işğaldan azad edilmiş rayonlarımızda rahat, dinc yaşaya bilərik, fəqət ayıqlığımızı, sayıqlığımızı da gözləməliyik.

Zəlimxan yaşasaydı, çox xoş olardı, yeni-yeni şeirlərilə, odlu-alovlu nitqlərilə bizi sevindirər, məmnun edərdi! Fəqət indi o, aramızda yoxdur.

Zəlimxan Yaqub nəinki Azərbaycanımızın, həmçinin türk dünyasının sevilən, seçilən böyük şairi idi. Böyük şairi olaraq qalacaqdır!

**Problemin aktuallığı**. Xalq şairi Zəlimxan Yaqub Azərbaycan ədəbiyyatına yeni ruh, yeni nəfəs gətirdiyindən onun yaradıcılığı aktuallığı ilə seçilir.

**Problemin elmi yeniliyi**. Şairin "Peyğəmbər" poeması, Şah İsmayıl Xətaiyə, Xətayiyə və Qazi Bürhanəddinə, Atatürkə və Heydər Əliyevə həsr olunmuş şeirləri diqqət mərkəzinə gətirilmişdir.

**Problemin praktik əhəmiyyəti**. Məqalə gənc tədqiqatçılardan ötrü faydalı olacaqdır.

**Ədəbiyyat**:
1. Zəlimxan Yaqub. Seçilmiş əsərləri. 2 cilddə. 1-ci cild. / Zəlimxan Yaqub. - Bakı: Şərq-Qərb, -2006.
2. Zəlimxan Yaqub. Seçilmiş əsərləri. 2 cilddə. 2-ci cild./ Zəlimxan Yaqub. -Bakı: Şərq-Qərb, -2006.

**E-mail**: prof.akif@mail.ru
**Rəyçilər**: *ped.ü.elm.dok., prof.* **F.B. Sadıqov,**
*ped.ü.elm.dok. prof.* **İ.H. Cəbrayılov**
**Redaksiyaya daxil olub**: 12.01.2023.

*UOT 37.0*

***Rafael Mail oğlu Əliyev***
*Azərbaycan Dövlət Neft və Sənaye Universitetinin müəllimi*
https://orcid.org/0000-0001-9702-265X
https://doi.org/10.5281/zenado.6445822

## AZƏRBAYCAN UŞAQ ƏDƏBİYYATININ MAARİFÇİ-REALİST DÖVRÜ

***Рафаэль Маил оглы Алиев***
*преподаватель Азербайджанского Государственного Университета Нефти и Промышленности*

## ПРОСВЕТИТЕЛЬСКО-РЕАЛИСТИЧЕСКИЙ ПЕРИОД АЗЕРБАЙДЖАНСКОЙ ДЕТСКОЙ ЛИТЕРАТУРЫ

***Rafael Mail Aliyev,***
*teacher at the Azerbaijan State University of Oil and Industry*

## EDUCATIONAL-REALISTIC ERA OF AZERBAIJANI CHILDREN'S LITERATURE

**Xülasə.** XIX əsri sonu, XX əsrin əvvəlləri Azərbaycan uşaq ədəbiyyatının inkişafında xüsusi mərhələdir. Yeni tipli məktəblərin yaranması, dərslik ehtiyacı, anadilli məktəblərin problemləri, uşaqların məktəbə cəlb edilməsi, qadın təhsili, əlifba məsələsi və s. kimi məsələlər həllini gözləyən aktual problemlərdən idi. Dövrün şair və yazıçıları maariflənməni bir problem kimi bütünlükdə mühitin qarşısına qoyurdu. Gələcək nəslin formalaşmasında da uşaq ədəbiyyatının inkişafını xüsusi olaraq qeyd edirdilər. S.Ə. Şirvani, A. Bakıxanov, S.M. Qənizadə, R. Əfəndiyev, A. Şaiq, A. Səhhət, M.Ə. Sabir, Ə. Nəzmi, M. Sidqi və başqaları bu istiqamətdə gərəkli əsərlərin yaranmasında mühüm rol oynamışlar.
***Açar sözlər:*** *XIX əsrin sonu, XX əsrin əvvəllərində ədəbi mühit, uşaq ədəbiyyatı, uşaq poeziyası, maarifçilik hərəkatı, R. Əfəndiyev , Abdulla Şaiq, A. Səhhət, dərsliklər*

**Резюме.** Конец XIX начало XX века особый этап развития Азербайджанской детской литературы. Создание школ нового типа, потребность в учебниках, проблемы школ на родном языке, привлечение детей в школы, женское образование, вопрос алфавита и многие другие актуальные проблемы ждали своего решения. Поэты и писатели этого периода ставили образование перед средой как проблему. Они также подчеркнули важность развития детской литературы в формировании будущего поколения. С.А.Ширвани, А.Бакиханов С.М.Ганизаде, Р.Эфендиев, А.Шаиг, А.Саххат, М.А.Сабир, А.Шаиг, А.Назми, М.Сидги и другие сыграли важную роль в создании необходимых произведении в этом направлении.
***Ключевые слова:*** *конец XIX века, литературная среда начала XX века, детская литература, детская поэзия, просветительное движение, Р. Эфендиев, А.Шаиг, А.Саххат, учебники*

**Summary.** The end of XIX and the leginning of XX centuries are special periods in the development of Azerbaijan children's literature. Construction of a new type of schools, the need for textbooks, problems of native-speaking schools, involvement of children in schools, women's education, alphabet issues and others were the urgent problrms tobe salved. Poets and writers of the day put education in front of the whole environment as a problem. Childrens literature was also highlighted in shaping the next generation. S.A.Shirvani, S.M.Ganizade, R.Afandiyev, M.A.Sabir, A.Shaig, A.Nazmi, M.Sidgi and others played significant roles in the creation of necessary plays in this direction.
***Key words:*** *literary environment in the late 19th and early 20th centuries, children's literature, children's poetry, R.Afandiyev, A.Shaig, A. Sahhat, educational movement, textbooks*

Azərbaycan uşaq ədəbiyyatının inkişafında XIX əsrin sonu, XX əsrin əvvəlləri xüsusi bir mərhələdir. Bu dövrün bədii düşüncəsində olan əsas məsələlərdən birisi uşaq ədəbiyyatındakı nəzərə çarpan boşluğu doldurmaq, təhsildəki yaranmış ədəbiyyat ehtiyacını əsaslı şəkildə aradan qaldırmaq idi. Çünki yeni tipli məktəblərin yaranması, əlifba islahatının zərurətə çevrilməsi, qadın azadlığı, dünyəvi təhsil sisteminin formalaşdırılması, ana dilində dərsliklərin hazırlanması, ana dilinin təhsilə gətirilməsi ən ümdə məsələ olaraq ədəbi-mədəni mühitin qarşısında dururdu. Uşaq ədəbiyyatı sahəsində olanlar da bir xətt kimi mühüm əhəmiyyət kəsb edirdi. H. Zərdabi, M. Mahmudbəyov müasirlərinə müraciətlərində bu məsələlərə ardıcıl şəkildə toxunur və xalqın övladlarının başa düşəcəyi tərzdə əsərlər yazmağı bir məqsəd olaraq vurğulayırdı. Böyük maarifçi A. Bakıxanov "Nəsihətlər" əsərinin başlanğıcında xüsusi olaraq bu vəziyyəti şərh edərək deyirdi: "Mən nə qədər axtardımsa uşaqların təlimi üçün elə bir kitab tapa bilmədim ki, o asan və anlaşılan bir dil ilə onların əxlaq gözəlliyinə dəlalət etsin. Bəzi işlənməkdə olan kitablar o qədər qarışıq-dolaşıq ibarələrlə yazılmışdır ki, müəllimlərin çoxu özləri onları dərk edə bilmirlər. Bəzi kitablar isə o qədər uzun və pərakəndədir ki, onları anlamaq çox çətindir. "Uşaqlıqda öyrədilən elm daşa yazılmış şəkil kimidir" zərbül-məsəlinin məzmunundan qəflət olunur. Uşaq yaşlarında hər zamandan daha artıq əxlaq gözəlliklərini onlara öyrətmək lazımdır. Pis xasiyyətlər təkrar olunduğu zaman adətə çevrilib uşaq təbiətinə daxil olduqdan sonra, onlara elm və ədəb öyrətmək müşkül olar. Beləliklə, aydın və sadə bir kitab yazdım" (1, s. 68). Düşünəndə ki, bu fikirlər 1836-cı ildə söylənmişdir, onda məsələnin mahiyyəti daha da önəmli görünür. Göründüyü kimi, burada bir neçə məsələ: uşaqların tərbiyəsi, dil məsələsi, təhsil və s. kimi o dövr üçün ciddi problemlər qaldırılır. "Vaxtilə F. Köçərli "Vətən dili" dərsliyində milli ədəbiyyat nümunələrinin azlığından şikayətlənən Həmzət bəy Qəbulov-Şirvanskinin rəyi münasibətilə "Zakafkaziya" qəzeti redaksiyasına göndərdiyi məktubunda israr etmişdi ki: "Qasım bəy Zakirdən və Hacı Seyid Əzim Şirvanidən başqa Azərbaycan yazıçıları və şairləri elə bir əsər verməyiblər ki, uşaqların oxuması üçün əlverişli və yararlı ola bilsin" (2,s 241). Əlbəttə, görkəmli ədəbiyyatşünasın ədəbiyyat tarixi müstəvisində təhlilləri bütün mərhələlərdə ciddiliyi və faktura zənginliyi ilə mühüm önəm daşıyır. Onun problemə bu kontekstdə yanaşması "Zakirə qədərki ədəbiyyat tariximizdə, hətta A. Bakıxanovun özündə "uşaqların oxuması üçün əlverişli və yararlı" nümunələr tapa bilməməsinin səbəbi isə, ilk növbədə, dil məsələsi ilə izah edilə bilər. Q. Zakirə qədərki klassiklərimizin əsərlərində kiçik oxucular üçün məna və məzmunca nə qədər münasib nümunələr olsa da, bu əsərlər ya ümumiyyətlə fars dilində idi, ya da ərəb-fars tərkibi ilə ağırlaşdırılmışdı" (6, s. 16). Göründüyü kimi, uşaq ədəbiyyatının ümumi problemləri ətrafında gedən mübarizə bütünlükdə mahiyyətin ifadəsi, yolun düzgünlüyünün müəyyənləşməsi məsələlərinə yönəlmişdi. Sultan Məcid Qənizadə, Rəşid bəy Əfəndiyev, Həsən bəy Zərdabi, Yusif Əfəndizadə, Məhəmməd Hadi, Əlabbas Müznib, Əli Ülvi, Camo bəy Aciz Şirvani, Əli Nazim, Məhəmmədtağı Sidqi, Rza Sabit, İsmayıl Həqqi, Abbas ağa Nazir Qayıbzadə, Əbdürrəhman Dai, Abdulla bəy Əfəndizadə, Cəfər Bünyadzadə, Əli Fəhmi, Ağabəy İsrafilbəyov, Əsəd Həsənzadə, Şəfiqə Əfəndizadə, Abid Rəhimzadə, Qafur Rəşad Mirzəzadə və s. kimi onlarla sənətkar uşaq ədəbiyyatının inkişafına, üslub rəngarəngliyinə öz töhfələrini verdilər. Bir növ bu ədəbiyyatın məqsəd və məramını, prinsiplərini, sonrakı dövr üçün gediləcək yolu müəyyənləşdirdilər. Doğrudan da "görkəmli şair və maarifpərvər ziyalı S.Ə. Şirvaninin XIX əsrin 70-ci illərində Şamaxıda ana dilində açdığı məktəb xalqımızın maarif həyatında çox mühüm hadisə oldu. Gündəlik tədris prosesi, şagirdlərin mənəvi ehtiyacları S.Ə. Şirvanini bir ziyalı, həmçinin özünün şəxsi bacarığı olan bədii istedad sahibi kimi uşaqlar üçün ana dilində əsərlər yazmağa və dərslik yaratmağa sövq etdi. Beləliklə, Seyid Əzim özü xalq balaları üçün bədii əsərlər yazaraq həmin əsərlərdən ibarət "Rəbiül-ətfal" (1878) və "Tacül kütüb" (1883) kimi iki dəyərli dərslik tərtib etdi. Bu dərsliklərdəki bədii nümunələrlə maarifpərvər şair Azərbaycan uşaq ədəbiyyatının bünövrəsini qoymuş oldu" (3, s. 5). H. Zərdabi, C. Ünsizadə, C. Vəlibəyov, M.T. Sidqi, R. Əfəndiyev, A.O. Çernyayevski və başqaları fəaliyyətlərində əsas istiqamət kimi uşaq ədəbiyyatının zənginləşməsinə üstünlük verdi-

lər. R. Əfəndiyev də məhz maarifpərvər ədib kimi bu hərəkatın ən fəallarından olaraq müxtəlif istiqamətli işlərin aparılmasında öz töhfələrini verdi. “Uşaq bağçası”, “Bəsirətül-ətfal” kitabları ilə məktəbdəki dərslik ehtiyacının ödənməsinə yardımçı oldu. R. Əfəndiyevin yaradıcılığının əsas məqsəd və məramı mövcud vəziyyətə uşaqların ehtiyacını ödəməyə hesablanmışdı. “Uşaq baxçası” (1898) dərsliyində ədibin “Durna”, “Gap”, “Vəsfi-bahar”, “Məktəbə dəvət”, “Vəsfi-payız”, “Vəsfi-qış”, “Ay qurd”, “Qaz və durna”, “Kirpi və dovşan”, “Xəyal” “Bəsirətül-ətfal” da (1901) isə “Bahar”, “Bahariyyat”, “Payız fəslində”, “Təbiət-torpaq”, “Su”, “Vətən məhəbbəti”, “Elmin şərafəti”, “Uşaq və ayna” və s. şeirləri toplanmışdır. Onu da əlavə edək ki, bu dərsliklər sonrakı illərdə bir sıra mətn əlavələri və təkmilləşmələrlə bir neçə dəfə çap olunmuşdur. “Bülbül”, “Keçi”, “Qırqovul”, “Kürt və cücəsi”, “Bənövşə” və s. kimi şeirləri onun bir maarifpərvər ziyalı kimi nə qədər gərəkli işlər gördüyünü aydınlaşdırır. “Məktəbə dəvət” şeirində təhsilin önəmliyi, mədəni səviyyənin yüksəldilməsi qayğısı və narahatlığı xüsusi olaraq vurğulanır.

*Məktəb vəqtidir, əzizim, dur ayağa, ey oğul,*
*Gün çıxıb pəncərədən düşdü otağa, ey oğul.*
*Çox zamandır ki, xoruzlar oyadıbdır xəlqi,*
*Paltarın əyninə gey, çəkmən ayağa, ey oğul.*
*(3, s. 43).*

Burada dövrün özündən gələn ciddi problemlər vardır ki, R. Əfəndiyev də məhz bu tip şeirləri ilə mövcud vəziyyətin təsvirinə çalışmışdır. Mahiyyətində olan isə elmin fəzilətini insanlara başa salmaq, uşaqları təhsilə istiqamətləndirmək idi.

Azərbaycan ədəbi-mədəni mühitinin zənginləşməsində əvəzsiz xidmətləri ilə seçilən böyük şəxsiyyətlərdən biri də Abdulla Şaiqdir. “Uşaq çeşməyi”, “İkinci il”, “Gülşəni-ədəbiyyat”, “Gülzar”, “Milli qiraət”, “Qiraət kitabı” və s. dərslikləri A. Şaiqin maarif və mədəniyyət sahəsində bir pedaqoq kimi sistemli fəaliyyətinin göstəricisidir. “Nə üçün”, “Yad et”, “Hamımız bir günəşin zərrəsiyik”, “Uşaq və dovşan”, “Xoruz”, “Yetim cücə”, “Təpəl kəlim”, “Payızın son ayı”, “Cütcü”, “Bülbül” , “At”, “Yağış” və s. kimi uşaq şeirləri özlüyündə ədəbiyyatımız üçün A. Şaiq üslubunu formalaşdırmışdır. “A. Şaiqin pedaqoji fəaliyyətinin effektiv nəticəsi onun bir sıra şeirlərinin bədii təsvirlərində öz əksini tapır. Bu şeirlərdə maarifçiliyin inkişafına təkan verən ideyalar, uşaqların və valideynlərin məktəbə sevgi hisslərinin tərənnümü daha qabarıq nəzərə çarpır. A. Şaiqin yaratdığı valideyn obrazları elmi, məktəbi, ədəbi təbliğ edir, övladını “məktəbə get, dərs oxu” tövsiyəsi ilə tərbiyəsinə çalışır” (4, 141). A. Şaiq uşaq dünyasının ən yaxşı bilicilərindəndir. Böyük ədibin “Payız”, “Bahar”, “Qışın nəğməsi”, “Qərənfil”, “Bənövşə”, “Qızıl gül”, “Zanbaq”, “Arı”, “Kəpənək” və s. şeirlərində bu, güclü tərəf kimi özünü göstərir. Burada digər məsələ məktəbə çağırışla bağlı olanlardı ki, A. Bakıxanov, İ. Qutqaşınlı, M.Ş. Vazeh, H. Zərdabi, M. Mahmudbəyov, S.M. Qənizadə, E. Sultanov, A. Səhhət, Ü. Hacıbəyov, S.S. Axundov, R. Əfəndiyev və başqalarında gördüyümüz təsəvvürlərlə eyni xətdə dayanır.

*Bəyənmişəm məktəbi, çox sevmişəm,*
*Gəl məni də məktəbə qoy, ay ata! –*

misraları A. Şaiqin bir maarifçi kimi problemləri uzaqgörənliklə müəyyənləşdirə və qiymətləndirə bilmək bacarığından irəli gəlir.

A. Səhhət istedadı, zəngin yaradıcılığı ilə uşaq ədəbiyyatı sahəsində də qələmini sınamış və bir-birindən orijinal sənət nümunələri yaratmışdır. “Məktəb uşağı”, “Ana və oğul”, “Cücələr”, “Qarı və qulluqçuları”, “Qaranquş balaları”, “Ata və oğul”, “İt və kölgəsi”, “Yaz”, “Quşlar”, “Ot biçini”, “Tənbəl”, “Güllərin bəhsi”, “Küçə uşağı”, “Qarışqa və milçək”, “Ayı və arılar”, “Tülkü və meymun”, “Tülkü və qurd”, “Ayı və şir”, “Sərçə və qırğı”, “Oğru və anası”, Gün və külək”, “Ulaq və aslan”, “İlk bahar”, “İki uşaq”, “Köç”, “Aşpaz və pişik” və s. kimi əsərləri uşaq ədəbiyyatının uğurlu nümunələri kimi zaman-zaman ədəbi-nəzəri fikrin marağına səbəb olmuşdur. Uşaq şeirləri ilə A. Səhhət təkcə o dövrdəki problemləri həll etməmiş, həm də uşaq ədəbiyyatımızı bir boy da zənginləşdirmişdir. Təkcə onu demək kifayət edər ki, onun “Cücələr”, “Ayı və şir”, “Qaranquşlar”, “İlk bahar” və s. şeirləri artıq yarandığı gündən dərsliklərin bəzəyinə çevrilmişdir.

*Quşlar, quşlar, a quşlar!*
*Qaranquşlar, a quşlar!*
*Cəh-cəh vurun burada,*
*Gah yerdə, gah yuvada.*
*Qonun bu tək budağa,*
*Çox getməyin uzağa.*
*A quşlarım getməyin,*
*Məni qəmgin etməyin. (5, 161)*

A. Səhhət "Quşlar" şeirini 1908-ci ildə yazmışdır. Bəzi istisnalar nəzərə alınmazsa bu şeir, demək olar, yarandığı gündən dərsliklərə düşmüş və aşağı siniflərin hamısının yaddaşında öz izini qoymuşdur. M.Ə. Sabirin "Məktəb şərqisi", "Uşaq və buz", "Yaz günləri", "Ağacların bəhsi", "Cütcü", "Qarğa və tülkü", "Məktəb şagirdlərinə töhfə", "Təbib ilə xəstə", "Qarınca", "Molla Nəsrəddinin yorğanı", "Uşaq və pul", "İsgəndər və fəqir", "Hörümçək və ipəkqurdu", "Artıq alıb, əskik satan tacir", "Yalançı çoban", "Camuşçu və sel" və s. şeirləri uşaq ədəbiyyatının klassik fondu kimi uzun illər bədii mühitin faktına çevrilmişdir.

Göründüyü kimi, XIX əsrin sonu, XX əsrin əvvəlləri Azərbaycan uşaq poeziyası bütün müstəvilərdə rəngarəngliyi, zənginliyi, uşaq fantaziyasını ifadəni, onların formalaşdırılması amalını və bu istiqamətdə görülən işləri, tərbiyə məsələlərini özündə əks etdirir. Burada digər tərəf həmin məqsəd və məramın üsul və yollarının müəyyənləşməsidir ki, ədiblər bu sahədə də özünəməxsus üslub yaradıcıları kimi uğurlara imza atmışlar. Bütün bunlar uşaq poeziyasının XIX əsrin sonu və XX əsrin əvvəllərindəki ümumi mənzərəsini səciyyələndirir.

**Problemin aktuallığı.** Realist-maarifçi ədəbiyyatın görkəmli nümayəndələri öz əsərlərində dil zənginliyindən yararlanmaqla əvəzsiz sənət nümunələri yaratmış, özünəməxsus üslub yaradıcıları kimi bədii düşüncənin inkişafına yardımçı olmuşlar.

**Problemin elmi yeniliyi.** XIX əsrin sonu, XX əsrin əvvəlləri Azərbaycan uşaq ədəbiyyatının inkişafında xüsusi mərhələdir. Poeziya bu dövrdə aparıcı xətt kimi daha böyük önəm kəsb etmişdir. Ədəbiyyatın görkəmli nümayəndələri zəngin yaradıcılıqları ilə uşaq ədəbiyyatını dil, üslub, forma baxımından zənginləşdirmişlər.

**Problemin praktik əhəmiyyəti.** Təhlillər onu deməyə əsas verir ki, XIX əsrin sonu və XX əsrin əvvəlləri ictimai, siyasi, mədəni mühitdə yeniləşmələrlə səciyyələndiyi kimi, uşaq poeziyasının inkişafında da xüsusi hadisədir. Uşaq ədəbiyyatının qızıl dövrü kimi səciyyələndirilə biləcək bu dövr sonrakı zamanlar üçün örnək olmuş və gediləcək yolu müəyyənləşdirmişdir.

**Ədəbiyyat:**


1. Bakıxanov, A. Seçilmiş əsərləri. / A. Bakıxanov. -Bakı: Yazıçı, -1984, -475 s.
2. Köçərli, F. Seçilmiş əsərləri. / F. Köçərli -Bakı: Azərbaycan nəşriyyatı, -1963, -341 s.
3. Azərbaycan uşaq ədəbiyyatı antologiyası.- Bakı, Elm, -1998, -300 s.
4. Xəlil, Z. Uşaq ədəbiyyatı. / Z. Xəlil, F. Əsgərli. -Bakı: ADPU, -2011, -498 s.
5. Səhhət, A. Seçilmiş əsərləri. / A. Səhhət. -Bakı, Lider, -2005, -456 s.
6. Məmmədov, M. Pedaqoji mühit və uşaq ədəbiyyatı. / M. Məmmədov, Y. Babayev, T. Cavadov. -Bakı: Maarif, -1992, -288 s.


**E-mail:** adnsu61@mail.ru

**Rəyçi**: *filol.ü.fəls.dok.* **V.C. Abbasova,**
*ped.ü.fəls.dok., dos.* **A.X. Hacıyev**
**Redaksiyaya daxil olub:** 03.06.2022.

## AKADEMİK MEHDİ MEHDİZADƏ – 120
## АКАДЕМИК МЕХТИ МЕХТИЗАДЕ – 120
## ACADEMIC MEHDI MEHDIZADE – 120

UOT 37.0



**Ramiz Calal oğlu Əliyev**
*pedaqogika üzrə fəlsəfə doktoru*
*Azərbaycan Dövlət Pedaqoji Universitetinin Təhsil menecmenti kafedrasının dosenti*

# PEDAQOJİ FİKİR TARİXİMİZDƏN: ƏNƏNƏ VƏ MÜASİRLİK

**Рамиз Джалал оглы Алиев**
*доктор философии по педагогике,*
*доцент кафедры управления образованием Азербайджанского Государственного Педагогического Университета*

# ИЗ ПЕДАГОГИЧЕСКОГО НАСЛЕДИЯ: ТРАДИЦИИ И СОВРЕМЕННОСТЬ

**Ramiz Jalal Aliyev**
*doctor of philosophy in pedagogy*
*associate professor of the department of Education management at the Azerbaijan State Pedagogical University*

# PEDOGIC HERITAGE: TRADITIONS AND MODERNITY

**Xülasə.** Məqalədə akademik Mehdi Mehdizadənin təlim-təhsil məsələləri ilə bağlı ideyalarından, ənənə və müasirliyi özündə ehtiva edən, məktəb təcrübəsinin təkmilləşdirilməsində əhəmiyyətli rol oynayan yenilikçi fikirlərindən bəhs olunur.

***Açar sözlər:*** *təhsil, tərbiyə, inkişaf, stimul, yenilik, müasirlik, millilik, dünyəvilik, motivasiya*

**Резюме.** В статье повествуется о педагогическом наследии академика М.М. Мехдизаде по вопросам образования и обучения. Его идеи и мысли интерпретируются в контексте традиции и современности, а также высказывается возможность использовать их на новом этапе школьной практики.

***Ключевые слова:*** *образование, обучение, воспитание, развитие, стимул, новшество, современность, национальные качества, светский, мотивация*

**Summary.** The article tells about the pedagogical heritage of academician M.M. Mehdizade concerning education and training. His ideas and thoughts are interpreted in the context of tradition and modernity, and the possibility is expressed of using them at the new stage of school practice.

***Key words:*** *education, training, upbringing, development, stimulus, innovation, modernity, national qualities, secular, motivation*

Azərbaycan Respublikası müstəqillik əldə etdikdən sonra təhsil sahəsində aparılan islahatlar bu sistemdə inkişafın istiqamətlərini, məzmununu, elmi-pedaqoji əsaslarını, kadr potensialını, islahatın aparılması forma və yollarını, mərhələlərini dəqiqləşdirir. Təhsil sahəsində islahat proqramında qeyd edilir ki, mövcud təhsil sahəsində toplanmış təcrübənin mütərəqqi əsaslarını saxlamaqla müstəqil Azərbaycan Respublikasının strateji məqsədlərini həyata keçirməyə qadir olan intellektual potensialı formalaşdıran yeni təhsil mühitinin qurulması həyata keçirilməlidir. Qeyd olunmalıdır ki, ötən illərdə aparılmış islahatlar nəticəsində mütərəqqi əhəmiyyət daşıyan xeyli təcrübə toplanmışdır. Bu təcrübənin zənginləşməsindən ayrı-ayrı pedaqoqların, filosofların, həm də dövlət xadimlərinin təhsilimizin inkişafına yönələn müəyyənedici, həm də həlledici təsirə malik ideyaları əhəmiyyətli rol oynayır. Keçmiş irsimizə nəzər saldıqda bu günün nailiyyətlərinin keçmişdən qidalandığını, ondan qüvvət aldığını da görürük. Bu bir həqiqətdir ki, keçmişlə müasirliyi düzgün uzlaşdırmadan, onu düzgün dəyərləndirmədən, müqayisə etmədən bugünkü məktəbimizin və pedaqoji fikrimizin səviyyəsini müəyyənləşdirmək çətindir.

Ötən illərdə aparılmış islahatlar nəticəsində müəyyən qədər mütərəqqi əhəmiyyətli təcrübə toplanmışdır. 1960-1970-ci illərdə tərbiyəyə kompleks yanaşılması, mənəvi tərbiyənin aktuallaşdırılması, fəal həyat mövqeyinin formalaşdırılması, təlim metodlarının, dərs prosesinin təkmilləşdirilməsi və s. istiqamətlərdə nəzəri və praktik əhəmiyyət daşıyan xeyli işlər görülmüş, səmərəli nəticələr əldə edilmişdir. Bu zəngin təcrübənin toplanmasında akademik Mehdi Mehdizadənin mühüm rolu olmuşdur. Müasir dövrdə təhsil islahatını həyata keçirənlərin bir çoxu məhz Mehdi Mehdizadənin yetirmələridir.

Mehdi Mehdizadənin zəngin pedaqoji irsi pedaqogika elminin, təhsil, təlim-tərbiyə işinin, demək olar ki, bütün sahələrini əhatə edir. Bu gün Azərbaycan məktəblərində təlimin məzmununu, təlim metodları, dərsin təşkili formaları kimi didaktik məsələlər tədqiqat obyektinə çevrildiyindən M. Mehdizadə irsində təlim məsələlərinin qoyuluşu təcrübəsindən hazırkı təhsil islahatının həyata keçirilməsində istifadə məqsədilə bəzi cəhətləri nəzərdən keçirmək istərdim.

Böyük pedaqoq təlim materialının elmiliyini, ictimai və təbiət hadisələrini, qayda-qanunların dialektik şərhini, qarşıda duran vəzifələrin dərsdə təlim materialları ilə əlaqələndirilməsini zəruri şərtlərdən hesab edirdi. O bildirirdi ki, mövzular zəncir halqası kimi bir-biri ilə əlaqəli olmalı, hər bir mövzu mümkün qədər özündən əvvəlkilərə istinad etməklə, sonrakı mövzuların əsasını təşkil etməlidir.

M. Mehdizadənin didaktik baxışları quru nəzəriyyəçiliklə məhdudlaşmır. Bu baxışlar təcrübəyə ötürülmüş elmi ideyaların, didaktik təlimatların təcrübədə özünü doğrultması ilə təsdiqlənir. Bu baxış nəzəriyyə və praktikanın vəhdətinə söykənir, biri digərindən qidalanır. Alim təlim-tərbiyə prosesinin səmərəliliyini təmin etmək üçün müvafiq şəraitin yaradılmasını əsas şərt kimi irəli sürür. Onun fikrincə, əsas şərtlərdən biri şagirdlərin fəallığının təmin edilməsidir. M. Mehdizadə öz dövrünə görə müasir hesab olunan dərsin mahiyyətini açmış, ona verilən tələbləri göstərmişdir. 1970-80-ci illərin mövqeyini ifadə edən həmin tələblər bu gün də aktualdır. M. Mehdizadənin qənaətincə, müasir dərs ənənəvi dərsə nisbətən həm məzmununa, həm də metod, priyom və vasitələrinə görə çox zəngindir, təşkili cəhətdən xeyli mürəkkəbdir. O, müəllimdən yalnız bacarıq deyil, həm də gərgin yaradıcı iş tələb edir. Müasir dərs təlimin müxtəlif növlərinə geniş yer verilməsi ilə də ənənəvi dərsdən fərqlənir. Ənənəvi dərsdə izahlı reproduktiv təlim, demək olar ki, yeganə təlim növü idi. Müasir dərsdə isə bundan başqa, proqramlaşdırılmış, alqoritmləşdirilmiş, reproduktiv-axtarıcı, problemli təlim, diferensial təlim növləri, təlimin fərdiləşdirilməsi və intensivləşdirilməsi tətbiq edilir. Müasir dərs onunla səciyyələnir ki, burada dərsin hər üç vəzifəsi: təhsil, tərbiyə və proqramın hər bir konkret mövzusu üzrə şagirdlərin inkişafı vəzifələri layihələndirilir,

planlaşdırılır, həyata keçirilir. Burada təlimin texniki vasitələri geniş planda tətbiq olunur, dərslər kabinet sistemi üzrə keçirilir. Dərsin səmərəliliyinin təmin olunmasında məzmunla yanaşı, təlim metodlarının yeniləşdirilməsini də əsas amil hesab edən alim təlimin təkmilləşdirilməsini, təhsil islahatına kompleks yanaşmanı faydalı hesab edirdi.

M. Mehdizadə təlimin məzmununun yeniləşdirilməsində təhsilin fasiləsizliyini və şagirdlərin gələcəkdə də öz biliklərini müstəqil artırmaq bacarığını formalaşdırma imkanlarını nəzərə almağı vacib hesab edərək, şagirdə yalnız faktları mənimsətmək yox, bilik verən məlumatlar axınından baş açmaq bacarığı aşılamağı günün didaktik vəzifəsi kimi irəli sürür. Bütün bunlar hazırkı kurikulum təhsil modelində nəzərə alınmalı şərtlərdir. M. Mehdizadə təhsil prosesinin permanent (fasiləsiz) olmasını nəzərə alaraq, məktəblilərə hər şeyi öyrətməyə cəhd etməkdənsə, onlara "öyrənməyi öyrətməyi" vacib bilir. Buradan da şagirdlərdə idrak fəallığının təmin olunması, müstəqil işlərə geniş yer verilməsi məsələləri aktuallaşır. Təlim metodlarının təkmilləşdirilməsi və yeniləşdirilməsindən bəhs edən M.M. Mehdizadə müqayisə yolu ilə daha səmərəli metodları üzə çıxarır, onların tətbiqi priyomlarını, əməli nəticələrini aşkarlayır. Pedaqoji ədəbiyyatda təqdim olunan təlim metodu qruplarının: informasiya metodları, əyanilik, reproduktiv, axtarıcılıq və s. adını çəkdikdən sonra müəllif bildirir ki, müasir dərs ənənəvi metodlarla yanaşı, tədricən axtarıcılığa istiqamətlənmiş metodların da (evristik, problemli şərh, tədqiqat, seminar-mühazirə, referat, təlim mübahisəsi metodları və s.) tətbiqinə nail olmağı tələb edir. M.M. Mehdizadənin təlimin müxtəlif metod və priyomlarından dərsdə istifadə edilməsinə dair fikirləri dövrünə görə yenilikçi ruhu ilə seçilir. Alim qətiyyətlə bildirir ki, o təlimin səmərəliliyinin yüksəldilməsi müəllimin, şagirdlərin fəaliyyəti ilə yanaşı, təlimin metod və priyomlarının düzgün seçilməsindən, dərsdə onlardan bacarıqla istifadə edilməsindən də çox asılıdır.

M. Mehdizadə hələ 1960-cı illərdə bu fikirdə idi ki, təlim metodlarını ya universallaşdırmaq, ya da onlara şablon kimi yanaşmaq olmaz. Dərsin hər bir mərhələsində məktəblilərin fəallığına, məqsədə və s. görə metod seçmək səmərəli nəticələr verir. Müəllif fikrini əyanilləşdirmək üçün şagirdlərə yeni bilik verərkən istifadə oluna biləcək metodların adlarını çəkir. Onun fikrincə, elə yeni biliklər vardır ki, onları öyrətmək üçün müəllim izahatdan, şifahi şərhdən, məktəb mühazirəsindən istifadə etməlidir. Qrammatika, riyaziyyat, tarix və s. fənlər üzrə bilikləri müsahibə yolu ilə öyrətmək daha əlverişlidir. Bu, evristik yoldur. Bəzi bilikləri şagirdlər dərslik və digər la mənbələr üzərində müstəqil işləmək yolu ilə ala bilərlər. Bu, yeni bilikləri müstəqil əldə etmək yoludur. Bəzi bilikləri isə şagirdlər müəllimin rəhbərliyi altında bu və ya digər təbiət hadisəsi üzərində müşahidə aparmaq, kimya, fizika və biologiyadan müxtəlif təcrübələr aparmaq yolu ilə əldə edə bilərlər. Buna tədqiqatçılıq yolu deyilir. M. Mehdizadə "kitab üzərində işi, laborator məşğələləri, müşahidə yolu ilə tədqiqatçılıq metod və formalarını tədris prosesinə cəsarətlə daxil etməyi" vacib hesab edirdi. O, həmçinin bildirir ki, şagirdləri düşünməyə, axtarmağa, tapmağa məcbur edən evristik müsahibədən geniş istifadə edilməlidir. Məktəblilərə müstəqil qrafik işləri daha çox vermək, onları mürəkkəb məsələlərin həlli üzərində çalışdırmaq, inşa yazmağı öyrətmək, təcrübə aparmaq vərdişləri aşılamaq lazımdır. Pedaqoq praktik əmək vərdişlərinin şagirdlərə aşılanması nəticəsində onların idrak fəaliyyətini qiymətləndirməyin, müstəqil təfəkkür bacarıqları və əmək vərdişlərini formalaşdırmağın, onlara "öyrənməyi öyrətməyin" mümkünlüyünü bildirirdi. Alimin bu fikri də maraqlıdır ki, təlimin müxtəlif metodlarının tətbiqi ilə dərsi yüngülləşdirmək, sadələşdirmək heç də məqsədə çevrilməməlidir, çünki əqli inkişaf məhz şagirdlər çətin tapşırıqlar üzərində işlədikdə, çətinlik qarşısında qaldıqda təmin edilir. Akademik M.M. Mehdizadə dərsdə problem-situasiyanın yaradılmasını, əks-əlaqənin qurulmasını, tədris prosesinin intensivləşdirilməsini, təlim prosesinin fərdiləşdirilməsini, təlimin müasir texniki vasitələrindən istifadə olunmasını didaktik priyomlar kimi zəruri sayır və bunları dərsə verilən tələblər səviyyəsinə qaldırırdı. Görkəmli pedaqoq dərsin təkmilləşdirilməsi, təlim məsələləri ilə əlaqədar illərlə düşündüklərini son tədqiqat əsəri olan "Ümumtəhsil məktəblərində təlim-tərbiyə prosesinin təkmilləşdirilməsi yolları" adlı kitabında ümumiləşdirmiş-

dir. Həmin kitabın nəşrindən ötən 22-23 il ərzində respublikada didaktik məsələləri əhatə edən belə sanballı əsər yaranmamışdır. M. Mehdizadənin həmin kitabda şərh etdiyi nəzəri və təcrübi məsələlər, elmi-əməli mahiyyətinə görə, bu gün də əhəmiyyətlidir.

Fikrimizcə, akademik Mehdi Mehdizadənin təlim prosesi, təlim metodu, metodik priyom və s. anlayışların şərhi ilə əlaqədar açıqlamaları öz aktuallığını saxlamaqdadır. O yazırdı: "Təlim prosesi müəllim və şagirdlərin müəyyən quruluşa malik olan elə birgə fəaliyyətidir ki, burada bilik, bacarıq, vərdişlər sistemi, təlimin formaları, növləri, metodları, didaktik, əyani və texniki vasitələrdən ibarət komponentlərdən istifadə edərək şagirdlərin təhsil, tərbiyə, inkişaflarını təmin etməyə yönəldilir". "Təlim metodu müəllim və şagirdlərin elə qarşılıqlı fəaliyyət sistemidir ki, müxtəlif vasitələrdən istifadə yolu ilə təlim prosesində didaktik problemlərin həllinə xidmət edir". M.M. Mehdizadə metodik priyomu təlim metodunun ünsürü hesab edir, eyni zamanda, müstəqil priyomların da olduğunu bildirirdi.

Təlim metodlarını məlumatvermə, əyanilik, reproduktiv, axtarış, nəzarət metodları kimi təsnif edən alim bunların hərəsinə bir neçə öyrənmə metodunun daxil olduğunu göstərir. O, təlim metodlarını qrup halında ümumiləşdirərək, hər qrupa bir neçə metodu aid edir. O yazır: "Məlumatvermə metodlarına aşağıdakılar daxildir: 1. Öyrətmə metodları: şərhetmə, nəqletmə, müsahibə, mühazirə, mətni oxumaq və s. 2. Öyrənmə metodları: dinləmə, dərslik üzərində iş (mətni öyrənmə), məlumatı dərk etmə, yadda saxlama, öyrənilənləri təkrar etmə və s.

Əyanilik metodları dedikdə, aşağıdakılar nəzərdə tutulur: 1. Öyrətmə metodları: əyani vəsaiti, təcrübəni (fizika, kimya, biologiya üzrə), təlim filmini nümayiş etdirmə, müasir texniki təlim vasitələrinin tətbiqi, ekskursiyalar və s. 2. Öyrənmə metodları: müşahidə etmək, şəkil çəkmək, dəftərə qeyd etmək, paylanmış didaktik materiallar üzərində iş və s.

Reproduktiv metodlar qrupuna daxil olanlar: 1. Öyrətmə metodları: dərk edilmiş materialın təkrarlanmasını təşkil etmək, çalışmalara nümunə göstərmək, mətni oxumaq, laboratoriya məşğələlərini aparmaq yollarını şərh etmək, emalatxanalarda, təcrübə tarlasında aparılan işlər haqqında məlumat vermək və s. 2. Öyrənmə metodları: öyrənilmiş materialı möhkəmləndirmək, dərslik üzərində işləmək, müxtəlif yazı işlərini yerinə yetirmək, məsələ və misallar həll etmək, laboratoriya məsələləri, qrafik işlər, əmək tapşırıqlarını yerinə yetirmək və s.

Pedaqoq aşağıdakı metodları müasirliyi ilə diqqəti cəlb edən axtarış metodlarına daxil etmişdir. Onlardan ən mühümləri bunlardır:

- evristik-müsahibə və ya qismən axtarış metodu;
- problemli şərh metodu;
- tədqiqat metodu;
- seminar metodu;
- mühazirə-seminar metodu; referat metodu;
- disput metodu;

M. Mehdizadə təlimin tipləri məsələsinə də toxunmuş və qeyd etmişdir ki, 1980-ci illərdə yeni təlim tipləri meydana çıxmış və kütləvi olaraq izahlı-reproduktiv təlim növü ilə birlikdə tətbiq olunmaqdadır. O, yeni təlim tipləri kimi aşağıdakıları göstərmişdir:

- proqramlaşdırılmış təlim;
- diferensial və ya fərdiləşdirilmiş təlim.

Akademik Mehdi Mehdizadə yeni təlim tiplərinin ənənəvi təlim növlərindən xeyli üstün keyfiyyətlərə malik olduğunu bildirərək, onların fərqini aydınlaşdırır. O, proqramlaşdırılmış təlimin ənənəvi təlim növündən fərqli olduğunu şagirdlərə göstərir və onların bir-bir izahını verir:

- elmi məlumatın, yəni biliklərin mənbələrinə görə;
- biliklərin təqdim edilmə yollarına görə;
- müstəqil iş sisteminə görə;
- təlimin fərdiləşdirilməsinə görə;
- şagirdlərin idrak fəaliyyəti üzərində, onların bilik, bacarıq və vərdişlərlə yiyələnmələri üzərində nəzarətə görə, şagirdlərin zehni fəaliyyətinin nəticələri haqqında (biliklərinə verilən qiymətlərin ümumiləşdirilməsinə görə).

Mehdi Mehdizadənin alqoritm və problemli təlim haqqında fikirləri bu gün də aktualdır. Onun fikrincə, alqoritm birtipli məsələlərin həll edilməsi qaydaları sistemidir. Problemli təlim isə şagirdlərə yeni bilik vermək üçün təlim prosesində problemli vəziyyətlər yaradıb, müəllimin onları məharətlə açması və şagirdlərə açdırması sistemini ifadə edən təlimdir. Bu, məktəblilərin zehni fəaliyyətlərinin gücləndirilməsi,

onlarda axtarış tələbatı, müstəqil işləmək meyl və bacarıqlarının aşılanması yollarından biridir. M.M. Mehdizadənin təlim məsələlərinə aid irsi ilə tanışlıq göstərir ki, o, təlim nəzəriyyəsinin zənginləşdirilməsi sahəsində mühüm xidmətlər göstərmiş, təlim prosesinin optimallaşdırılması, dərsin təkmilləşdirilməsi yollarını nəzəri baxımdan aydınlaşdırmış, qabaqcıl iş təcrübələrini ümumiləşdirmişdir.

Təhsil islahatının və zamanın tələbləri baxımından təlimin yeni məzmununun yaradılması, təlimin təkmilləşdirilməsi və yeniləşdirilməsi, yeni təlim metodlarının bir çoxunun elementlərini onun təbliğ etdiyi metodlar içərisində tapmaq mümkündür. Bu baxımdan demokratikləşdirmə və humanistləşdirmə prinsiplərinin əsas götürüldüyü indiki dövrdə M. Mehdizadə irsindən yaradıcılıqla istifadə ümumi işimizə xeyir verə bilər.

**Problemin aktuallığı.** Pedaqoji alimin elmi-pedaqoji yaradıcılıq irsinin ənənə və müasirlik müstəvisində araşdırılıb təhlil edilməsi, yeni şəraitdə müqayisələr aparmaqla ideyaların sistemə salınması və hazırkı inkişaf mərhələsində onlardan istifadə imkanlarının müəyyənləşdirilməsi həm elmi-nəzəri, həm də praktik baxımdan xüsusi əhəmiyyət kəsb edir.

**Problemin elmi yeniliyi.** Tədqiqatda pedaqoji nəzəriyyə ilə təcrübənin vəhdəti təlim prosesinin daim inkişafda olması, təhsilin məzmununun təkmilləşdirilməsinə tarixilik, müasirlik kontekstində yanaşılması ideyalarının konseptuallağı ilə səciyyələnir.

**Problemin praktik əhəmiyyəti.** Tədqiqat sovet dövrü pedaqoji prosesini, onun təşkili və əsas cəhətlərini qavramağa, mütərəqqi ideyaları üzə çıxarmağa, müasir təlim işinin təşkil və idarə olunmasında şəxsiyyətyönlü və inkişafyönlü olanları istifadə üçün müəyyənləşdirməyə imkan verir.

**Ədəbiyyat:**


1. Mehdizadə M.M. Məktəb sisteminin yenidən təşkili məsələlərinə dair bəzi qeydlər. Bakı, "Azərbaycan müəllimi" qəzeti , 1958 , 9 oktyabr
2. Mehdizadə M.M. Pedaqoji effekt. -Bakı, "Bakı" qəzeti, -1996, dekabrın 22-si.
3. Mehdizadə M.M. Azərbaycan SSRİ məktəblərində təlim prosesinin təkmilləşdirilməsi yolları. -Bakı: “Azərbaycan məktəbi" jurnalı, -1975, № 12.
4. Mehdi Mehdizadə ömrünün işığı / Tərtibçilər: V. Xəlilov, H. Musayev. -Bakı, -1998.
5. Rüstəmov F.A. Azərbaycanda pedaqoji elm: təşəkkülü, inkişafı və problemləri. -Bakı, -1998.


**E-mail:** shliyeva817@gmail.com

**Rəyçilər:** *ped.elm.dok., prof.* **H.Ə. Əlizadə**
*ped.elm.dok., prof.* **R.L. Hüseynzadə**
**Redaksiyaya daxil olub:** 23.01.2023.

## *MÜNDƏRİCAT*
## *ОГЛАВЛЕНИЕ*
## *CONTENTS*

### *ÜMÜMMİLLİ LİDER HEYDƏR ƏLİYEVİN ANADAN OLMASININ 100 İLLİYİ QARŞISINDA*
### *К 100-ЛЕТИЮ СО ДНЯ РОЖДЕНИЯ ОБЩЕНАЦИОНАЛЬНОГО ЛИДЕРА ГЕЙДАРА АЛИЕВА*
### *ON THE 100 th ANNIVERSARY OF THE NATIONAL LEADER HEYDAR ALIYEV*



### *BAŞ REDAKTORDAN*
### *ОТ ГЛАВНОГО РЕДАКТОРА*
### *FROM THE EDITOR İN CHIEF*



### *ÜMUMPEDAQOJİ PROBLEMLƏR*
### *ОБЩЕПЕДАГОГИЧЕСКИЕ ПРОБЛЕМЫ*
### *GENERAL PEDAGOGICAL PROBLEMS*

*PSİXOLOGİYA, YAŞ FİZİOLOGİYASI VƏ İNKLÜZİV TƏHSİL MƏSƏLƏLƏRİ*
*ПСИХОЛОГИЯ, ВОЗРАСТНАЯ ФИЗИОЛОГИЯ*
*И ВОПРОСЫ ИНКЛЮЗИВНОГО ОБРАЗОВАНИЯ*
*ISSUES OF PSYCHOLOGY, AGE PHYSIOLOGY AND INCLUSIVE EDUCATION*



*BİOLOGİYANIN TƏDRİSİ METODİKASI*
*МЕТОДИКА ПРЕПОДАВАНИЯ БИОЛОГИИ*
*METHODS OF TEACHING BİOLOGY*

***HƏYAT BİLGİSİ FƏNNİNİN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ПРЕДМЕТА ПОЗНАНИЕ МИРА***
***METHOS OF TEACHING THE SUBJECT OF KNOWLEDGE OF THE WORLD***



***KİMYANIN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ХИМИИ***
***METHODS OF TEACHING CHEMISTRY***



***XARİCİ DİLLƏRİN TƏDRİSİ METODİKASI***
***МЕТОДИКА ПРЕПОДАВАНИЯ ИНОСТРАННЫХ ЯЗЫКОВ***
***FOREIGN LANGUAGE TEACHING METHODS***

***MƏKTƏB VƏ PEDAQOJİ FİKİR TARİXİ***
***ИСТОРИЯ ШКОЛЫ И ПЕДАГОГИЧЕСКОЙ МЫСЛИ***
***HISTORY OF SCHOOL AND PEDAGOGICAL THOUGHT***



***İBTİDAİ TƏHSİLİN AKTUAL PROBLEMLƏRİ***
***АКТУАЛЬНЫЕ ПРОБЛЕМЫ НАЧАЛЬНОГО ОБРАЗОВАНИЯ***
***ACTUAL PROBLEMS OF PRIMARY EDUCATION***



***MƏKTƏBƏQƏDƏR TƏHSİL VƏ TƏRBİYƏ***
***ДОШКОЛЬНОЕ ОБРАЗОВАНИЕ И ВОСПИТАНИЕ***
***PRESCHOOL EDUCATION AND UPBRİNGİNG***



***FİZİKİ MƏDƏNİYYƏT MƏSƏLƏLƏRİ***
***ВОПРОСЫ ФИЗИЧЕСКОЙ КУЛЬТУРЫ***
***ISSUES OF PHYSICAL CULTURE***



***PEDAQOJİ TƏNQİD VƏ BİBLİOQRAFİYA***
***ПЕДАГОГИЧЕСКАЯ КРИТИКА И БИБЛИОГРАФИЯ***
***PEDAGOGICAL CRITICISM AND BIBLIOGRAPHY***

## İSTİFADƏ EDİLMİŞ ƏDƏBİYYATIN BİBLİOQRAFİK TƏSVİRİ
## БИБЛИОГРАФИЧЕСКОЕ ОПИСАНИЕ ИСПОЛЬЗОВАННОЙ ЛИТЕРАТУРЫ
## BİBLİOGRAPHİC DESCRİPTİON OF USED LİTERATURE

Jurnalımızın son səhifələrində azərbaycanca, rusca və ingilis dilində "Məqalələrin yazılışına verilən tələbləri" əks etdirmişik. Bəzi müəlliflər həmin tələbləri ciddi şəkildə nəzərə aldıqları halda digər müəlliflər mövcud qaydaları gözləmədən redaksiyaya məqalə gətirir, yaxud elektron poçtla göndərirlər. Bu isə, o deməkdir ki, təqdim olunan məqalə işlənmək üçün geri qaytarılmalı, yaxud da redaksiya tərəfindən redaktə edilməlidir. Belə məqalələr, adətən zəif olur, özündə elmi ideya əks etdirmir, təsviri xarakter daşıyır, məqalənin sonunda verilən ədəbiyyat siyahısı da necə gəldi formalaşdırılır.

2019-cu ildə Azərbaycan Respublikası Prezidenti yanında Ali Attestasiya Komissiyasının yeni Əsasnaməsi təsdiq olunmuş, dissertasiyaların, avtoreferatların, ədəbiyyat siyahısının tərtibinə yeni tələblər verilmişdir. Ölkəmizdə dissertasiyaların əsas nəticələrinin dərc olunması tövsiyə edilən elmi nəşrlərdə öz məqalələrini görmək istəyən alimlər, gənc tədqiqatçılar – doktorantlar və dissertantlar "İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i ilə tanış olmalı, həm dissertasiyalarında, həm məqalələrində, həm də konfrans materiallarında mövcud tələbləri nəzərə almalıdırlar.

"İstifadə edilmiş ədəbiyyatın biblioqrafik təsviri və nümunələr"i aşağıdakı bölmələrə ayrılır: nəşrin növü; biblioqrafik təsvirin forması; nümunələr.

**Tələblərə** diqqət yetirək: Çoxcildli nəşrlər belə yazılır: 1. Əliyev, H.Ə. Müstəqilliyimiz əbədidir: [46 cilddə] / H. Əliyev. – Bakı: Azərnəşr, – c. 45. 2013. – 384 s. 2. Azərbaycan Milli Ensiklopediyası / Red. hey. sədri İ.H. Əliyev. – Bakı: Azərbaycan Milli Ensiklopediyası Elmi Mərkəzi, – c. 8: Enollar – Fedin. – 2018. – 598 s. Müəllifi göstərilməyən nəşrlər: Azərbaycan bayatıları / tərt. ed. B.Abdulla – Bakı: XXI Yeni nəşrlər evi, – 2004. – 304 s.

**Müəllifi dörd nəfərədək olan nəşrlər**, o cümlədən bir müəllifli nəşrlər: Əlizadə, Ə.Ə. Qadın psixologiyası: Fəlsəfi-psixoloji esselər / Ə.Ə. Əlizadə. – Bakı: Təhsil, – 2015. – 416 s.

**İki və üç müəllifli nəşrlər**: Abbasov, A.N. Pedaqogika: Müntəxəbat. Dərs vəsaiti. / A.N. Abbasov, R.R. Məmmədzadə, L.A. Məmmədli. – Bakı: Mütərcim, – 2021. – 608 s.

**Müəllifi dörd və daha çox olan nəşrlər**. Dörd və beş müəllifli nəşrlər: Pedaqogika: Ali məktəblər üçün dərs vəsaiti / Y.R. Talıbov, Ə.Ə. Ağayev, A.İ. Eminov [və b.] – Bakı: Adiloğlu, – 2003. – s. 48

**Beşdən çox müəllifli nəşrlər**: Kurikulum bələdçisi: İzahlar və tətbiqlər / Ə.M. Abbasov [və b.] – Bakı: Elm və təhsil, – 2019. – 320 s.

**Jurnal məqalələri**: Məmmədli L.A. Şagirdlərin milli qəhrəmanların nümunəsində tərbiyə olunması // – Bakı: Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, – 2020. № 6, – s. 59-62.

**Müəllifi üçdən çox olan jurnal məqalələri**: Rüstəmov, Q.Ə. Vibrasiyalı kəsmə prosesində müqavimət momenti dəyişməsinin tədqiqi / Q.Ə. Rüstəmov, İ.A. Yolçuyev, Ə.T. Həzərxanov [və b.] // Milli Aviasiya Akademiyasının Elmi əsərləri, – Bakı: – 2005. №1, – s. 80-86.

**Konfrans materialları**: Аббасов, А.Н. Подготовка подростков и молодежи к семейной жизни // Материалы 66-й Международной научно-практической конференции на тему: «Актуальные вопросы науки», Москва: Спутник: -10 августа 2020, с. 33-37 Azərbaycan Respublikasının Təhsil İnstitutunun Elmi əsərləri, Cild 89 , № 6, 2022, № 5

**Dissertasiyalar**: Əliyeva, L.X. Təhsilin demokratikləşdirilməsi pedaqoji kadrların hazırlanmasının mühüm prinsipi kimi: ali pedaqoji məktəblərin bakalavr pilləsinin materialları əsasında: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyası) / – Bakı, 2012. – 147 s.

**Dissertasiyanın avtoreferatı**: Əliyev, R.S. Yeniyetmələrin yenidəntərbiyəsi üzrə işin sistemi: / pedaqogika üzrə fəlsəfə doktoru dissertasiyasının avtoreferatı) / - Bakı, 2003. - 29 s.;

**Elektron resurslar**: Меликов, А. Легенда о любви [Звукозапись] / – Баку, 1994. – CDROM. Azərbaycan etnik musiqisi: [Elektron resurs] / tərt. ed. T. Məmmədov və b.; Azərbaycan Respublikası Mədəniyyət və Turizm Nazirliyi. – Bakı, 2006. – DVD+; 13 sm

**Normativ-hüquqi sənədlər**: Azərbaycan Respublikasının Konstitusiyası // 12 noyabr 1995-ci ildə qəbul edilmişdir (24 avqust 2002-ci il tarixdə olan dəyişiklik və əlavələr). – Bakı: Qanun, – 2002, – 48 s.

**Qəzet məqalələri**: Abbasov, A.N. Pedaqoji internatura // Azərbaycan müəllimi. -2020, 22 avqust. – s. 6

**Arxiv materialları**: Xarici İşlər naziri Məhəmməd Həsən Hacınskinin məruzəsi (Gəncə: 15 iyul 1918-ci il) // Azərbaycan Respublikası Dövlət Arxivi, Fond № 1061, siyahı №1, iş № 95, vərəq –1.

Azərbaycan Respublikasının Təhsil İnstitutunun "Elmi əsərlər"inə pedaqogikanın, təhsil, təlim və tərbiyənin, didaktikanın, təhsilin idarə olunmasının müxtəlif məsələləri ilə bağlı məqalə yazan alimlərə, gənc tədqiqatçılara xahişimiz budur ki, istifadə edilmiş ədəbiyyatın siyahısını hazırlayarkən yuxarıda göstərilən qaydalara əməl etsinlər.

## TƏQDİM OLUNAN MƏQALƏLƏRƏ VERİLƏN TƏLƏBLƏR

1. Digər redaksiyalara təqdim olunmamış məqalələr qəbul edilir.
2. Məqalələr son tədqiqatların nəticələrini əks etdirməli, yeni ideyalarla zəngin olmalı, elmi məqalələrin yazılışına qoyulan tələblər gözlənilməlidir.
3. Məqalənin mətni təxminən 6-8 səhifə olmalıdır. Azərbaycan, rus və ingilis dillərində məqaləyə aid açar sözlər verilir.
4. Məqalənin mətni Azərbaycan dilində latın əlifbası (Times New Roman), rus dilində krill əlifbası və ingilis dilində ingilis (ABŞ) əlifbası ilə Times New Roman - 14 şrift ilə 1,5 intervalla yığılmalı, elektron variantı ilə birlikdə (disklə) təqdim olunmalıdır.
5. Məqalələr üç dildən - Azərbaycan, rus və ingilis dillərindən birində çap olunur. 3 dildə (Azərbaycan, rus və ingilis) məqalənin xülasəsi təqdim edilir. Xülasədə irəli sürülən başlıca elmi müddəalar, tədqiqatdan alınan nəticələr, problemin nəzəri və praktik əhəmiyyəti öz əksini tapmalıdır.
6. Məqalə aşağıdakı ardıcıllıqla yazılır: birinci sətirdə müəllif(lər)in adı, atasının adı və soyadı; ikinci sətirdə elmi dərəcəsi və elmi adı (yaxud doktorant də dissertant olması və s.); üçüncü sətirdə iş yeri, vəzifəsi; dördüncü sətirdə böyük hərflərlə məqalənin adı. Daha sonra bu qaydada həmin məlumatlar rus və ingilis dillərində təkrar edilir.
7. Həmmüəlliflərin üç nəfərdən artıq olması məqsədəuyğun deyildir.
8. Redaksiya məqalədə zəruri dəyişiklər və ixtisarlar, redaktə aparrmaq hüququna malikdir. 9. Məqalələrə iki mütəxəssisin rəyi, şöbə və ya kafedranın, həmçinin ali məktəbin Elmi Şurasının və ümumtəhsil, yaxud orta ixtisas təhsili müəssisəsinin pedaqoji şurasının iclas protokollarından çıxarışlar əlavə olunur.
10. Məqalədəki faktların, məlumatların dürüstlüyünə müəlliflər cavabdehdir. İrəli sürülən elmi müddəalar müəllifin özünə məxsus olmalı, istifadə edilmiş nəzəri fikirlərin mənbəyi göstərilməlidir.
11. Məqalədə son 5-10 ildə çap olunan əsərlərə istinadlara üstünlük verilməlidir. Məqalənin sonunda verilən ədəbiyyat siyahısı əlifba ardıcıllığı ilə deyil, istinad olunan ədəbiyyatların mətndə rast gəlindiyi ardıcıllıqla nömrələnməli və məsələn, (1) və ya (1, s. 119) kimi işarə olunmalıdır. Eyni ədəbiyyata mətndə başqa bir yerdə təkrar istinad olunarsa, onda istinad olunan həmin ədəbiyyat əvvəlki nömrə ilə göstərilməlidir.
12. Jurnal öz profilinə uyğun məqalələri dərc edir.
13. Elmi məqalələrin sonunda elm sahəsinin və məqalənin xarakterinə uyğun olaraq aktuallıq əsaslandırılmalı, elmi yeniliyi, tətbiqi əhəmiyyəti, iqtisadi səmərəsi və s. aydın şəkildə verilməlidir.
14. Daha sonra istinad olunmuş ədəbiyyatın siyahısı verilir.
15. Plagiatlıq faktları aşkar edildikdə həmin məqalənin nəşri dayandırılır.
16. Məqalə müəlliflərinin hüquqları qorunur.
17. Jurnalda “ardı növbəti nömrədə” adı altında seriya məqalələr dərc olunmur.
18. Məqalələrin müxtəlif dillərdə olan xülasələri bir-birinin eyni olmalı və məqalənin məzmununa uyğun gəlməlidir.
19. Məqalənin sonunda rəyçilərin adı, atasının adı və soy adı, elmi dərəcəsi və elmi adı; sonrakı sətirdə məqalə müəllifinin elektron ünvanı (E-mail) göstərilməlidir.
20. Məqaləyə müəllif haqqında aşağıdakı məlumatlar əlavə olunur: məqalə müəllif(lər)inin adı, atasının adı soyadı, işlədiyi müəssisə (hansı müəssisədə doktorant və dissertant olması) və müəssisənin ünvanı, müəllif(lər)in vəzifəsi, elmi dərəcəsi və adı, iş və ev telefonları, ev ünvanı, elektron poçt ünvanı (Email).

**ТРЕБОВАНИЯ К ПРЕДСТАВЛЕННЫМ СТАТЬЯМ**

1. Принимаются статьи, не представленные в других редакциях.
2. Статьи должны отражать результаты последних исследований, быть богатыми новыми идеями, в них должны быть соблюдены требования, предъявляемые написанию научных статей.
3. Текст статьи должен составлять около 6-8 страниц. Ключевые слова для статьи должны быть представлены на трех языках: азербайджанском, русском и английском.
4. Текст статьи должен быть представлен на диске вместе с электронным вариантом, с интервалом 1,5; шрифтом 14 Times New Roman - латинского алфавита на азербайджанском языке, кириллицы на русском языке, и английским алфавитом (США) на английском языке.
5. Статьи публикуются на одном из трех языков - азербайджанском, русском и английском. Резюме статьи предоставлено на 3 языках (азербайджанском, русском и английском). В статье должны быть отражены основные научные положения, изложенные в резюме, выводы, сделанные из исследования, должна быть представлена теоретическая и практическая значимость проблемы.
6. Статья должна быть написана в следующем порядке: на первой строке имя, фамилия и отчество автора (авторов); вторая строка содержит ученую степень и ученое звание (диссертант или докторант и т. д.); третья строка указывает место работы, должность; на четвертой строке представлено название статьи прописными буквами. Затем эта же информация повторяется на русском и английском языках.
7. Нежелательно иметь более трех соавторов.
8. Редакция имеет право вносить изменения и сокращения в статью.
9. Вместе со статьей должно быть предоставлено два отзыва специалистов: заведующих кафедрой или отделом, а также выписка из протокола Ученого совета вузов и педагогического совета общеобразовательного или среднего специального образования.
10. Авторы статьи несут ответственность за достоверность приведенных в статье фактов и информации. Предлагаемые научные положения должны принадлежать автору и должен быть указан источник используемых теоретических идей.
11. Ссылки следует давать на работы, опубликованные за последние 5-10 лет. Список литературы, приведенный в конце статьи, должен быть пронумерован не в алфавитном порядке, а в том порядке, в котором указанная литература появляется в тексте, например (1) или (1, стр. 119). Если та же самая литература повторяется в другом месте в тексте, то эта же литература должна быть указана под предыдущим номером.
12. Журнал публикует статьи, имеющие отношение к его профилю.
13. В конце научной статьи должна быть обоснована актуальность в соответствии с характером статьи и областью науки, четко указана научная новизна, важность ее применения, экономическая эффективность и т.д.
14. Затем предоставляется список использованной литературы.
15. При обнаружении фактов плагиата публикация статьи прекращается.
16. Права авторов статьи защищены.
17. Журнал не публикует серии статей под заголовком «продолжение в следующем номере».
18. Резюме статей на разных языках должны быть одинаковыми и соответствовать содержанию статьи.
19. В конце статьи должно быть указано имя, отчество и фамилия рецензентов, их ученая степень и ученое звание; следующая строка должна содержать адрес электронной почты автора статьи.
20. В статью добавляется следующая информация об авторе: имя, фамилия, отчество автора (авторов), учреждение, где он работает (докторантом или диссертантом которого является) адрес учреждения, должность, ученая степень и звание автора(ов), домашний и рабочий телефоны, домашний адрес, электронная почта (E-mail).

**REQUIREMENTS FOR SUBMITTED ARTICLES**

1. Submitted articles should not be published or accepted for publication in other editions.
2. Articles should reflect the results of recent research, be rich in new ideas and they must comply with the requirements for writing scientific articles.
3. The text of the article should be about 6-8 pages. Keywords for the article should be presented in three languages: Azerbaijani, Russian and English.
4. The text of the article should be presented on the disk together with the electronic version, with an interval of 1.5; 14 point Times New Roman font - Latin alphabet in Azerbaijani, Cyrillic in Russian, and English alphabet (USA) in English.
5. Articles are published in one of three languages - Azerbaijani, Russian and English. A summary of the article is provided in 3 languages (Azerbaijani, Russian and English). The article should reflect the main scientific provisions presented in the summary, the conclusions drawn from the study, the theoretical and practical significance of the problem should be presented.
6. The article is written in the following order: on the first line the name, surname and patronymic of the author (s); the second line contains the academic degree and academic title (doctoral student or candidate for a degree, etc.); the third line indicates the place of work, position; the fourth line represents the title of the article in capital letters. Then in this order the same information is repeated in Russian and English.
7. It is undesirable to have more than three co-authors.
8. The Editorial Board has the right to make changes and reductions in the article.
9. Two expert reviews should be provided together with the article: heads of department or chair, as well as extract from the protocol of Academic Council of the higher school and the Pedagogical Council of general or secondary special education institutions.
10. The authors of the article are responsible for the accuracy of the facts and information provided in the article. The proposed scientific provisions should belong to the author and the source of used theoretical ideas must be indicated.
11. The articles should refer to works published in the last 5-10 years. The list of references given at the end of the article should not be numbered in alphabetical order, but in the order in which the indicated literature appears in the text, for example (1) or (1, p. 119). If the same literature is repeated elsewhere in the text, then the same literature should be indicated under the previous number.
12. The journal publishes articles related to its profile.
13. At the end of a scientific article, the relevance should be justified according to the nature of the article and the area of science, scientific novelty, importance of its application, economic efficiency, etc. should be clearly indicated.
14. Then a list of references is provided.
15. When the facts of plagiarism are discovered, the publication of the article is stopped.
16. The rights of the authors of the article are protected.
17. The journal does not publish a series of articles under the heading “continued in the next issue”.
18. Summary of articles in different languages should be the same and consistent with the content of the article.
19. At the end of the article the name, patronymic and last name of the reviewers, their academic degree and academic title should be indicated; the next line should contain the email address of the author of the article.
20. The following information about the author is added to the article: name, surname, patronymic of the author (authors), the institution where he works (doctoral student or candidate for a degree), address of the institution, position, academic degree and the title of the author (s), home and work phones, home address, email address.

---

Çapa imzalanıb: 02.03.2023.
Format: 84x108 1/8. Qarnitur: Times.
Həcmi: 12,5 ç.v. Tiraj: 200. Sifariş № 63

TƏRCÜMƏ VƏ NƏŞRİYYAT-POLİQRAFİYA
MƏRKƏZİ

Az 1014, Bakı, Rəsul Rza küç., 125/139b
(012) 596 21 44;
e-mail: mutarjim@mail.ru
www.mutercim.az

